# AZƏRBAYCAN MƏKTƏBİ

*Elmi-nəzəri, pedaqoji jurnal*

**2016**
**№ 4 (674)**
*(iyul-avqust)*

**1924-cü ildən çıxır**

*Azərbaycan Respublikası Təhsil Nazirliyinin 5 may 1996-cı il tarixli Nizamnaməsi ilə təsdiq olunmuşdur. Ədliyyə Nazirliyi üzrə dövlət qeydiyyatı № 11/3165*

*Redaksiyanın ünvanı:*
*Az1025, Bakı şəhəri, A.Cəlilov küçəsi, 22 (Təhsil Problemləri İnstitutunun binası, otaq 410 )*

*Telefon/Faks*
*(012) 496-74-19*
*(012) 496-74-20*

*E-mail:*
*azarbaycan.maktabijurnali.24@mail.ru*

*Rekvizitlər:*
*Kapital Bankın Rabitə Filialı*
*h/h AZ83AIIB45810013441800004118*
*VÖEN: 9900003611*
*Bankın rekvizitləri:*
*Kod: 200189*
*m/hAZ37NABZ01350100000000001944*
*SWIFT: Bik AIIBAZ2X*

*Jurnal redaksiyada yığılıb səhifələnmiş, ARTPİ-nin Təhsil Texnologiyaları Mərkəzində çap olunmuşdur.*

**Təsisçi**
**Azərbaycan Respublikası Təhsil Nazirliyi**

**B U   N Ö M R Ə D Ə**


Gülçöhrə Məmmədova
**40 yaşlı ali təhsil ocağı**
**5**
Azərbaycan Memarlıq və İnşaat Universitetinin 40 ildə keçdiyi yol

***P e d a q o g i k a   v ə   p s i x o l o g i y a***

Ənvər Abbasov
**Təhsilin inkişaf istiqamətləri pedaqoji müstəvidə**
**13**
Yeni dərs ilində qarşıda duran vəzifələr

Vidadi Bəşirov
**Azərbaycan pedaqoji fikrində milli demokratik təhsil ideyaları**
**22**
Azərbaycan pedaqoji fikrinin tarixinə bir nəzər

Səlahət Əsədova
**Tənqidi təfəkkürü inkişaf etdirən metod və üsullardan istifadə**
**29**
Şagirdlərdə tənqidi təfəkkürün inkişaf etdirilməsi

***M o n i t o r i n q   v ə   q i y m ə t l ə n d i r m ə***

Afət Süleymanova
**Keyfiyyətin idarəedilməsinin qiymətləndirilməsi mexanizmləri**
**34**
Bir məktəbin simasında idarəetmənin qiymətləndirilməsi

Əlişah Gərayev
**Şagird biliyinin diaqnostik qiymətləndirilməsi**
**43**
Fizika dərslərində diaqnostik qiymətləndirmə

***T ə h s i l   i s l a h a t ı   h ə y a t a   k e ç i r i l i r***

Ülviyyə Mikayılova,
Elmina Kazımzadə
**Azərbaycanda müəllimlər təhsil islahatları kontekstində öz peşəkarlıqlarını necə dərk edirlər**
**47**
Azərbaycanda təhsil islahatının inkişaf yolu

***İ n n o v a s i y a l a r***

Sevinc Niftiyeva
**İnnovasiyalar və kreativ düşüncənin formalaşdırılması**
**57**
Müasir dərsdə innovasiyalar

Şəfa Kazımova
**Pedaqoji texnologiyaların təhsil sistemində rolu**
**60**
Pedaqoji texnologiyaların təhsil sistemində rolu

Zülfiyyə Vəliyeva
**Təlimin keyfiyyəti və pedaqoji texnologiyalar**
**63**
Təhsil prosesində pedaqoji texnologiyalar yolu ilə keyfiyyətin yüksəldilməsi

Xəyalə Əhədova
**Fənlərin tədrisində müasir yanaşmalar**
**67**
Ayrı-ayrı fənlərin tədrisində müasir yanaşmalardan istifadə

***M u l t i k u l t u r a l i z m***

Elmira Qasımova
**Multikulturalizm - həyat tərzimizdir**
**70**
Multikulturalizm Azərbaycanda həyat tərzinə çevrilir

Kəmalə Həşimova
**Multikulturalizmin metodiki aspektləri**
**75**
Musiqi dərslərində multikultural elementlər

***M a a r i f ç i l i k   t a r i x i m i z d ə n***

Alxan Bayramoğlu,
**Maarifçi pedaqoq**
**78**
Abdullabəy Divanbəyoğlunun həyatı və pedaqoji fəaliyyəti

***T ü r k o l o j i   q u r u l t a y - 9 0***

Səxavət Ociyev
**Türkoloji qurultay: Özbəkistanda yeni əlifba məsələsi**
**85**
Türkoloji qurultayda Özbəkistan nümayəndələrinin iştirakı

Nəcəf Nəcəfov
**Türk dünyasının sönməz günəşi**
**91**
Tatar şairi Musa Cəlilin həyat yolu və onun "Moabid dəftəri"

***T ə r b i y ə   m ə s ə l ə l ə r i***

Yeganə Qasımova
**Milli-mənəvi dəyərlərə yazıçı münasibəti**
**98**
İlyas Əfəndiyevin yaradıcılığında milli-mənəvi dəyərlər

Mehparə Süleymanlı
**Tədrisdə şagird şəxsiyyətinin formalaşması yolları**
**105**
Şagird şəxsiyyətinin inkişaf etdirilməsi

Rəsmiyyə Allahverdiyeva
**Tərbiyədə tükənməz mənbələr**
**110**
Təlimdə tərbiyənin qoyuluşu və həlli məsələləri

**LİSENZİYA № 022589**

**Jurnal Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə tövsiyə edilən nəşrlər siyahısına daxil edilmişdir.**

**Jurnal akademik Mehdi Mehdizadə mükafatı laureatı adına layiq görülmüşdür.**

**Redaksiyanın əlaqə telefonları: 496-74-20; 496-74-19**

**Redaksiyanın ünvanı: Bakı ş., Afiyəddin Cəlilov küçəsi, 22 (Təhsil Problemləri İnstitutunun binası, 409, 410 və 411-ci otaqlar). İndeks AZ 1025**
**Kağız formatı 70x108 1/16 Sifariş: 19**

---

**Jurnal redaksiyanın kompüter mərkəzində yığılıb səhifələnmiş, ARTPİ-nin Təhsil Texnologiyaları Mərkəzində çap olunmuşdur.**

**В этом номере**

**Г.Мамедова**
**40 - летнее высшее учебное заведение............с.5**

**Э.Аббасов**
**Направления развития образования на педагогической плоскости..........................................с.13**

**В.Баширов**
**Идеи национального демократического образования в азербайджанской педагогической науке....................................................................с.22**

**С.Асадова**
**Методоы и техникиобучения критическому мышлению.........................................................с.29**

**А.Сулейманова**
**Механизмы оценивания управления качеством....................................................................с.34**

**А.Гераев**
**Диагностическое оценивание учащихся......с.43**

**У.Микаилова,**
**Э.Казимзаде**
**Как учителя воспринимают свое профессиональное развитие в контексте реформы образования в Азербайджане.....................................с.47**

**С.Нифтиева**
**Инновации и формирование креативного мышления...........................................................с.57**

**Э.Гасымова**
**Мултикультурализм - образ жизни...............с.70**

**А.Байрамоглы**
**Педагог-просветитель......................................с.78**

**С.Оджиев**
**Тюркологический съезд: задача нового алфавита в Узбекистане............................................с.85**

**Н.Наджафов**
**Вечное солнце тюркского мира......................с.91**

**In this number**

**G.Mammadova**
**40 year old university...........................................p.5**

**A.Abbasov**
**Development trends of pedagogical education...........................................................................p.13**

**V.Bashirov**
**National democratic educational ideas in Azerbaijani pedagogical thoughts.....................p.22**

**S.Asadova**
**Methods and techniques for teaching critical thinking.....................................................................p.29**

**A.Suleymanova**
**Assessment mechanisms of quality management....................................................................p.34**

**A.Gerayev**
**Diagnostic assessment of students.....................p.43**

**U.Mikayilova,**
**E.Kazimzade**
**Teachers as reflective learners: teacher perception of professional development in the context of Azerbaijan’s curriculum reform.......................p.47**

**S.Niftiyeva**
**Innovation and formation of creative thinking......................................................................p.57**

**E.Gasimova**
**Multiculturalism is a way of life.......................p.70**

**A.Bayramoglu**
**Enlightenment pedagogue................................p.78**

**S.Ojiyev**
**Turkish Congress: the issue of new alphabet in Uzbekistan..........................................................p.85**

**N.Najafov**
**Inextinguishable sun of the turkish world.......p.91**



# 40 YAŞLI ALİ TƏHSİL OCAĞI

**Gülçöhrə Məmmədova,**
***Azərbaycan Memarlıq və İnşaat Universitetinin rektoru, professor, əməkdar memar***

Azərbaycan sivilizasiyanın ən qədim məskənlərindən biridir. Ölkədə minillər ərzində mədəni irsin əsasını təşkil edən abidələr yaradılmış və onların bir çoxu dünya inciləri sırasında özünəməxsus yer tutmuşdur.

Ölkəmizin ərazisində 6 mindən çox tarixi-memarlıq abidələri yerləşmişdir ki, bunların da böyük əksəriyyəti bugünədək qorunub saxlanmışdır.

Azərbaycanın XII-XVII əsrlər memarlıq abidələri (İçərişəhər, Şirvanşahlar sarayı) dünya memarlıq irsinin qızıl fonduna daxil olmuşdur. Bu sənət inciləri bu gün də yeni abidələrin yaranması üçün zəngin material verir. Bütün bunları qorumaq, yaşatmaq üçün isə yeni memarlar nəslinin yetişdirilməsi günün ən aktual problemi kimi qarşıda durur.

Ona görə də, Azərbaycanda müstəqil memarlıq və inşaat mühəndisliyi universitetinin yaradılmasına da bu aspektdən baxılmalıdır. Respublikada memar və inşaat mühəndisləri hazırlayan yeganə ali təhsil ocağı olan Azərbaycan Memarlıq və İnşaat Universiteti də bu məqsədlə yaradılmışdır. Uzun əsrlər boyu öz zəhməti bahasına ölkəmizin adını əbədiləşdirən memarlarımız Azərbaycan adlı bir dünya yaratmışdır. Orta əsr memarlığının inkişafına “imzaları”nı atmış belə memarların adı bütün Şərqdə xalqımıza başucalığı gətirmişdir.

İnsan cəmiyyətinin inkişaf tarixi dünya sivilizasiyasının bütün mərhələlərində öz parlaq əksini daha çox memarlıq abidələrində tapır. Memarlıq – gözəllik qanunu əsasında gerçəkliyi formalaşdıran yaradıcılıq növüdür, inşaat incəsənətidir. İlk növbədə bu sənətə ənənəvi olaraq bütün dövrlərdə böyük önəm verilmiş, bütün zamanlarda o, ictimai sənət sayılmış, incəsənətin digər növləri kimi cəmiyyət həyatı, onun tarixi, baxışları və ideologiyası ilə sıx bağlı olmuşdur. Azərbaycan memarlığı - Azərbaycan ərazisində müxtəlif mədəniyyətlərə aid olan abidələr kompleksi kimi başa düşülür. Bu ərazidə yaşamış qədim insanlar tarix boyu şərəfli yaradıcılıq yolu keçərək bizə çoxsaylı sənət-yadigarları qoyub getmişlər.

Xalqımızın çox qədim tikinti mədəniyyəti var. Minilliklər boyu ölkəmizin ərazisində memarlıq və inşaat sənəti inkişaf etmiş, böyük şəhərlər, möhtəşəm müdafiə qurğuları, dini və memorial abidələr yaradılmışdır.

XI-XIII əsrlərdə Azərbaycan memarlığının əhəmiyyətli nailiyyətlərindən biri də memarlıq məktəblərinin yaranması olmuşdur. Nəsillərdən-nəsillərə ötürülən, ustad memarların öz şagirdlərinə öyrətdiyi sənət “sirləri” hər birinin özünəməxsus bədii və texniki üslubu olan memarlıq məktəblərinin formalaşmasına gətirib çıxartmışdı. Təbriz–Naxçıvan, Şirvan–Abşeron və Aran memarlıq məktəblərinin formalaşması Azərbaycan memarlığının ümumi inkişafını, bədii və konstruktiv zənginliyini, memarlıq və inşaat

xüsusiyyətlərinin cilalanmasını təmin etmişdir.

Binanın tikintisi layihənin müəllifi, eyni zamanda inşaat işlərinin rəisi olan memara tapşırılırdı. Memarın yanında şagird kimi çalışan gənclər ondan öyrəndiyi nəzəriyyə və təcrübəni sonra özləri tikdiyi binalarda və müxtəlif təyinatlı qurğularda tətbiq edir və növbəti nəslə öyrədirdilər.

Orta əsrlərə doğru inşaat işlərinin yerinə yetirilməsi üçün peşəkar qruplar, yaxud həmkar sexləri yaradılırdı, tikinti üçün zəruri olan sənət nümayəndələrini birləşdirən bu sexlər peşəkarlıq vərdişlərinin öyrənilməsini, şagirdlik qaydası ilə sənətin nəsildən-nəslə keçməsini, ustalığın mükəmməlləşməsini təmin edən təhsil qurumları idi. Zaman keçdikcə inşaat sənəti inkişaf edir, dövrün tələblərinə uyğun memarlıq növləri və nümunələri ilə paralel inşaat texnikası sahəsində daha mütərəqqi üsullar yaranırdı.

XIX əsrin 80-ci illərindən başlayaraq ölkəmizdə sənayenin inkişafı fonunda texniki peşələrə marağın artması zamanın tələbinə çevrildi. Yeni dövrdə tikinti işlərinin miqyasının artması, yeni inşaat texnologiyalarının və materialların, daha mürəkkəb memarlıq kompozisiyalarının tətbiq edilməsi memar və inşaatçıların peşə hazırlığı qarşısında daha ciddi tələblər qoyurdu. Dövrün çağırışlarına cavab verə biləcək təhsil ocaqları olmadığı üçün Azərbaycanda həyata keçirilən böyük tikinti işlərinə əcnəbi mütəxəssislər cəlb edilirdi. XIX–XX əsrin əvvəllərində bu sahədə çalışan azsaylı azərbaycanlı memar və mühəndislər, əsasən, Rusiyanın universitetləri və akademiyalarında təhsil alanlar idi. Qasım bəy Hacıbababəyov, Zivər bəy Əhmədbəyov, Məmmədhəsən Hacınski, Məşədi Mirzə Qafar İsmayılov və başqaları milli memarlıq və inşaat təhsilinin formalaşmasını arzulayır, öz yaradıcılıqları və ictimai fəaliyyəti ilə o günü yaxınlaşdırırdılar. Müvafiq tədris sahəsinin yaranmasına, yeni tipli ziyalı təbəqəsinin - milli mühəndis və texniki kadrların formalaşmasına, nəhayət, yüksək texniki təhsil verən məktəbin açılmasına doğru yeni bir yol başlayırdı.1880-ci ilin fevralın 19-da Bakıda sənət məktəbinin açılması barədə qərar qəbul edilməsi çoxdan gözlənilən ictimai-mədəni hadisə idi.

1920-ci ildə xalqımızın böyük ziyalısı Nəriman Nərimanovun imzaladığı 16 noyabr tarixli sərəncamı ilə Bakıda Politexnik İnstitutunun yaradılması və onun tərkibində inşaat mühəndisliyi ixtisası üzrə kadr hazırlığının başlanması isə Azərbaycanda memarlıq və inşaat təhsilinin əsasını qoydu. Həmin ildə institutun əsas fakültələrindən biri mühəndis-tikinti fakültəsi oldu. Mühəndis-tikinti fakültəsi təşkil olunduğu gündən memarlıq, yol, liman və hidrotexnika ixtisasları üzrə mütəxəssis hazırlığına başladı.

1930-cu ildə Politexnik İnstitutunun adı dəyişdirilərək Azərbaycan Neft İnstitutu adlandırılmışdı. İnstitutun əsas bölmələrindən biri olan İnşaat bölməsində dörd şöbə: Memarlıq, Yol, Liman və Hidrotexnika şöbələri vardı.

1932-ci ildə institutun inşaat fakültəsinin bazasında müstəqil Azərbaycan İnşaat İnstitutu yaradılmışdı, lakin sonralar o yenidən M.Əzizbəyov adına Azərbaycan İndisturial İnstitutuna memarlıq-inşaat fakültəsi statusunda birləşdirilmişdir. 1939-1941-ci illərdə xalqımızın ümummilli lideri Heydər Əliyev məhz bu fakültədə təhsil almışdır. Fakültədə çalışan və memarlıq-inşaat təhsilinin formalaşmasında xidmətləri olan professorlar Y.Sırışev, Y.Dunin, V.Toçilov, A.Qorçakov kimi alim-pedaqoqların adları bu gün də yaşlı nəslin yaddaşlarından silinməyib. 1950-ci ildə SSRİ Ali Təhsil Nazirliyinin əmri ilə institutun inşaat-memarlıq, nəqliyyat fakültələri, mexanika

fakültəsinin bir hissəsi və Azərbaycan Kənd Təsərrüfatı İnstitutunun hidromeliorasiya fakültəsinin bazasında Azərbaycan Politexnik İnstitutu yaradılmışdır.

Ötən əsrin 50-60-cı illərində AzPİ-nin inkişafında inşaatçı-rektor, professor Əbuzər Əliyevin, prorektor, professor Həsənağa Muradxanovun, professorlar Mikayıl Useynovun, Qəzənfər Əlizadənin, Süleyman Əbdurəşidovun və başqalarının əməyini xüsusi qeyd etmək lazımdır.

1962-1968-ci illərdə Politexnik İnstitutuna Akademiyanın müxbir üzvü, memar, professor Ənvər Qasımzadənin rəhbərlik etdiyi dövrdə institut bir sıra əhəmiyyətli nailiyyətlər əldə etmişdir.

1969-cu ildə Heydər Əlirza oğlu Əliyev Azərbaycan rəhbərliyinə seçildikdən sonra respublikamızın sosial-iqtisadi həyatının bütün sahələri, o cümlədən ali təhsil sistemi də dirçəliş yoluna qədəm qoymuşdur. Keçən əsrin 70-80-ci illərində memarlıq və inşaat sahəsi yüksək templə inkişaf etmişdir. Ona görə də ölkədə savadlı və qabiliyyətli memar və inşaat mühəndisləri hazırlığı aparmaq üçün xüsusi ali təhsil ocağının olması zərurəti yaranmışdı.

O ildən başlayaraq memarlıq müxtəlif ali məktəblərin – Bakı Politexnik, Azərbaycan Sənaye İnstitutunun nəzdində fakültə olaraq tanındı, 1950-ci ildən isə Azərbaycan Politexnik İnstitutunda inşaat mühəndisləri hazırlayan fakültə kimi fəaliyyətini davam etdirdi.

1975-ci ildə xalqımızın ümummilli lideri Heydər Əliyevin şəxsi təşəbbüsü ilə Azərbaycan SSR Nazirlər Soveti ölkədə memarlıq, tikinti və iqtisadiyyatın digər sahələri üçün yüksəkixtisaslı kadrlar hazırlamaq məqsədi ilə Azərbaycan İnşaat Mühəndisləri İnstitutunun yaradılması haqqında qərar verdi. Bu qərara əsasən 1975-ci ildə Çingiz İldırım adına Azərbaycan Politexnik İnstitutunun 4 fakültəsi və bir neçə ixtisas kafedrasının bazası əsasında yaradılan Azərbaycan İnşaat Mühəndisləri İnstitutu (AzİMİ) müstəqil fəaliyyətə başladı. Universitetimizin tarixi ulu öndərin adı ilə sıx bağlıdır. Gənc yaşlarından memarlığa böyük həvəs göstərən və ali təhsilini məhz memarlıq ixtisasından başlayan ümummilli lider bütün fəaliyyəti dövründə inşaat və quruculuq işlərinə önəm verib, irimiqyaslı şəhərsalma və tikinti layihələrinin həyata keçirilməsinə nail olub. Heydər Əliyev cənabları hələ keçən əsrin 70-ci illərində gələcəkdə Azərbaycanın iqtisadi müstəqilliyini təmin etmək məqsədi ilə iqtisadiyyatın bütün sahələrində olduğu kimi, memarlıq və inşaat sahəsində də qurucu, yaradıcı kadrların hazırlanması üçün Azərbaycan İnşaat Mühəndisləri İnstitutunun yaradılmasını vacib bilib. Heydər Əliyev sonralar da AzİMİ-yə qaygı göstərib, məhz onun tövsiyələri sayəsində bu tədris ocağı illər ərzində böyük nailiyyətlərə imza atıb, bu günümüzə qədər böyük bir inkişaf yolu keçib. Azərbaycan İnşaat Mühəndisləri İnstitutunun yaradılması ölkəmizdə memarlıq və inşaat sahəsi üçün kadr hazırlığının yeni mərhələsinin əsasını qoydu. Ölkə rəhbərinin memarlığa, inşaata, bütövlükdə quruculuq işlərinə verdiyi böyük önəm bu sahə üçün mütəxəssis hazırlığına diqqətin və qayğının artmasına səbəb oldu. 1978-ci ildə institutda artıq 6 fakültədə 9000-ə yaxın gənc təhsil alırdı. Yeni yaradılmış institutun maddi bazası qurulur, pedaqoji potensialı güclənir, yeni ixtisaslar açılırdı. 1981-ci ilin yanvar ayında institutun rektor vəzifəsinə təyin edilən Bünyad Sərdarov fəaliyyətinin ilk dövründən quruculuq işlərinin davamına və institutun maddi-texniki bazasının daha da yaxşılaşdırılmasına böyük diqqət yetirirdi. Az bir vaxtda yeni yaradılmış institutun maddi-texniki bazası qurulub, pedaqoji potensialı gücləndirilib, yeni ixtisaslar açılıb, memar və inşaat mühəndisi ixtisasının cəmiyyətdə nüfuzu artıb. Bu dövrdə AzİMİ

tək Azərbaycan üçün deyil, bütün sovetlər ölkəsi və xarici ölkələr üçün də kadr hazırlayırdı.

Ölkədə inşaat sahəsinin inkişafı elmi araşdırmalara tələbatı artırmış, təhsil, elm ilə istehsalat arasındakı əlaqələri daha da möhkəmləndirmişdir.

XX əsrin 70-80-ci illərində universitetdə işləyən alimlər arasında professorlar: D.A.Axundov, A.Mustafayev, İ.Bəxtiyarov, Ə.İsayev, K.Əliyev, H.Feyziyev, M.Nəcəfov və b. elmi fəaliyyətlərində daha yüksək nəticələr qazanmış, elmi əsərləri ilə təkcə Azərbaycanda deyil, bütün sovet məkanında, eləcə də xarici ölkələrdə tanınmışlar. Onlar öz elmi məktəblərini yaradaraq, gənc mütəxəssisləri elmi fəaliyyətə həvəsləndirir, yaratdıqları elmi mühitdə onların formalaşmasına rəhbərlik edirdilər. Bu gün universitetimizdə çalışan professor-müəllim heyətinin əksəriyyəti həmin dövrdə formalaşmış alimlərdir.

Ötən əsrin 70-80-ci illərində institutda böyük sayda xarici vətəndaşlar təhsil alırdılar. Onların bir hissəsi birillik hazırlıq kursu keçdikdən sonra Sovetlər ölkəsinin nüfuzlu ali məktəblərinə göndərilirdilər. Universitetimizin tarixində bu dövr böyük tərbiyəvi və praktiki əhəmiyyəti olan tələbə-inşaat dəstələri ilə də yadda qalmışdır. 1976-92-ci illərdə institutun 20 mindən artıq tələbəsi Sovetlər ölkəsinin nəhəng tikintilərində iştirak etmiş və uğurlar əldə etmişlər.

Bütövlükdə, keçən əsrin 80-ci illərində Azərbaycan İnşaat Mühəndisləri İnstitutunun kadr potensialı güclənmiş, maddi-texniki və tədris-metodiki bazası xeyli genişlənmiş, xarici təhsil ocaqları ilə əməkdaşlığın qurulması istiqamətində uğurlu addımlar atılmışdı.

90-cı illərin əvvəlində ölkəmiz öz tarixinin ən faciəli günlərini yaşamışdır. 20 Yanvar, Qarabağ müharibəsi, dərin siyasi-iqtisadi böhran ali təhsil ocağımızın da tarixinə təlatümlü, narahat illər yazmışdır.

Dağlıq Qarabağda Vətənin azadlığı, suverenliyi və ərazi bütövlüyü uğrunda Ermənistan işğalçılarına qarşı gedən döyüşlərdə Azərbaycan İnşaat Mühəndisləri İnstitutunun tələbəsi, məzunu və əməkdaşı olan 43 nəfər soydaşımız qəhrəmancasına həlak olmuşdur. Onlardan 7 nəfərinə ölümündən sonra Azərbaycan Respublikasının Milli Qəhrəmanı adı verilmişdir:

Çingiz Mustafayev (1960-1992), Məzahir Rüstəmov (1960-1992), Ramiz Qənbərov (1962-1992), Bəylər Ağayev (1969-1992), Kamil Nəsibov (1946-1992), Kərəm Mirzəyev (1960-1992), Elman Hüseynovun (1952-1993) adları universitetimizin tarixində və yaddaşımızda əbədi yaşayacaqdır.

1993-cü ildə xalqın təkidli tələbi ilə dünyamiqyaslı siyasətçi Heydər Əlirza oğlu Əliyevin Azərbaycana rəhbərliyə qayıdışından sonra ölkəmizdə sabitliyə, quruculuğa, inkişafa doğru dönüş yarandı. Yalnız bundan sonra respublikamızın bütün sahələrində, o cümlədən təhsil sistemində dirçəliş illəri başlandı.

Bu dövrdə universitetimizdə zamanın tələbinə cavab verən yeni struktur bölmələri yaradıldı. İqtisadiyönümlü yeni kafedralar açıldı, mexanikləşdirmə və avtomatlaşdırma fakültəsi yaradıldı, bir sıra bölmələrin adı dəyişdirildi.

Azərbaycan müstəqilliyini yenidən bərpa etdikdən sonra öz təhsil sisteminin də tam hüquqlu sahibinə çevrildi, 1995-ci ildən başlayaraq Azərbaycan təhsilində aparılan islahatlar AzİMİ-nin də fəaliyyətində böyük dəyişikliklər yaratdı, mütəxəssis hazırlığını yeniliklərlə zənginləşdirdi. 2000-ci il iyunun 13-də Azərbaycan Respublikasının Prezidenti Heydər Əliyevin Fərmanı ilə bu ali məktəb Azərbaycan Memarlıq və İnşaat Universiteti (AzMİU) adlandırıldı.

Ümummilli lider Heydər Əliyevin davamçısı Prezident İlham Əliyevin

AzMİU-nun maddi-texniki bazasının yaxşılaşdırılması, burada müasir təhsil şəraitinin yaradılması barədəki sərəncamları universitetdə elmi-pedaqoji fəaliyyətin müasir tələblər səviyyəsində aparılması üçün işgüzar mühit yaratdı.

Azərbaycan Memarlıq və İnşaat Universiteti zəngin təhsil ənənələrinə, güclü intellektual və kadr potensialına malik təhsil ocağıdır. Son illər universitetin maddi-texniki bazasını gücləndirmək məqsədilə yeni laboratoriyalar açılıb, təhsilin keyfiyyətinin yüksəldilməsi üçün daha müasir forma və metodlar işlənib hazırlanıb, istehsalatla əlaqələr genişləndirilib. Öz işini "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın tələbləri səviyyəsində həyata keçirən AzMİU səmərəli islahatlar vasitəsilə təhsil sistemini beynəlxalq standartlar səviyyəsinə çatdırmağı və vətən üçün müasirsəviyyəli mütəxəssis hazırlanmasını özünün prioritet vəzifəsi hesab edir. AzMİU-da hazırda bakalavr pilləsində 20 ixtisas, magistratura pilləsində 37 ixtisaslaşma üzrə kadr hazırlığı aparılır. 2015/16-cı tədris ilində universitetin 8 fakültəsində bakalavr pilləsində 5967, magistratura pilləsində isə 449 tələbə öz təhsilini davam etdirir. Xarici vətəndaşların təhsili fakültəsində 14 ölkədən 620 gənc təhsil alır, doktoranturada 108 gənc mütəxəssis alimlik dərəcəsinə layiq görülmək üçün çalışır.

Avropa Kredit Transfer Sisteminin tələblərinə uyğun olaraq yeni dövlət standartları əsasında AzMİU-nun bütün ixtisasları üzrə tədris planları optimallaşdırılıb, auditoriya saatları normativə uyğunlaşdırılıb, həftəlik dərs yükü 24 saata qədər azaldılıb, kreditlərin sayı xeyli məhdudlaşdırılıb. 1977-ci ildə yaradılmış, hazırda fondunda 520 minədək ədəbiyyat olan kitabxanamızda ənənəvi və elektron kataloq yaradılıb, hər il abunə olunan 10 minədək elektron jurnal bazası formalaşdırılıb.

Tədris prosesinin effektli təşkili üçün laboratoriya bazasının vəziyyəti və informasiya texnologiyalarının geniş tətbiqi də böyük əhəmiyyət kəsb edir. Ona görə də universitetdə təcrübə və laboratoriya dərslərinin keçirilməsi üçün zəruri avadanlıqlarla təchiz edilmiş laboratoriya bazası yaradılıb. "Materiallar müqaviməti", "Hidrotexniki qurğular və hidravlika", "İnşaat materialları" və başqa kafedralar üçün yeni laboratoriya avadanlıqları alınıb və quraşdırılıb, bir neçə yeni kompüter otaqları yaradılıb.

Müasir şəraitdə təhsilin keyfiyyətinin artırılması üçün təhsil və istehsalat əlaqələrinin möhkəmləndirilməsinə, dövlət-biznes partnyorluğu əsasında istehsalat resurslarının tələbələrin nəzəri-təcrübi hazırlığının artırılmasına çox önəm veririk, dövlət qurumları, səhmdar cəmiyyətlər və tikinti şirkətləri ilə əməkdaşlıq haqqında müqavilələr imzalayırıq. Zamanın tələbinə uyğun olaraq təhsil və istehsalat əlaqələri qarşılıqlı maraqlar əsasında qurulur. Burada universitetin marağı yeni texnologiyalarla bilavasitə iş prosesində tanış olmaqdan, istehsalat resursları ilə əyani təmas sayəsində müəllimlərin təcrübi biliklərinin artırılması və qazanılan müasir təcrübənin dərslərin məzmununda əks olunmasından, eləcə də tələbələrin istehsalat təcrübəsinin daha dolğun və effektli keçirilməsindən ibarətdir.

Son illər istehsalat təcrübələri respublikanın 80-ə yaxın müxtəlif elmi-tədqiqat və tədris müəssisəsində, zavod və istehsalat mərkəzində, səhmdar cəmiyyətdə, şirkət və məhdud məsuliyyətli cəmiyyətlərdə keçirilir. Təhsilin müasir tələblər baxımından təşkili və nəzəri biliklərin təcrübə ilə əlaqəsini möhkəmləndirmək məqsədi ilə ARDNŞ, Azərsu ASC, FHN, Paşa-İnşaat, AECOM, ARDNŞ-in Dərin Özüllər Zavodu, AZVİRT MMC, Holcim, Təmiz Şəhər ASC kimi dövlət qurumları,

səhmdar cəmiyyətlər və s. tipli iri müəssisələrlə müqavilələr bağlamışıq. İnşaat konstruksiyaları kafedrasında Fövqəladə Hallar Nazirliyinin maliyyə dəstəyi ilə 2013-cü ildə yaradılmış İnşaat Konstruksiyalarının Kompüter Modelləşdirilməsi Laboratoriyasında tələbələr "SAP – 2000" hesablama kompleksi üzrə konstruksiyaların, bina və qurğuların parametrik hesablanmaları və layihələndirilməsi işləri ilə məşğul olurlar. 2015-ci ildə Azərsu ASC-nin dəstəyi ilə Ekologiya kafedrasında müasir avadanlıqlarla təchiz olunmuş su təchizatı problemləri üzrə Elmi-Tədqiqat və Tədris Laboratoriyası yaradılıb. Burada quraşdırılmış cihazların köməyi ilə içməli və çirkab suların tərkibindəki 40-dək göstəriciləri təyin etmək mümkündur. Holcim Şirkəti ilə birgə yaradılan Yapışdırıcı Materialların və Betonların Sınağı Laboratoriyası sement və betonun, həmçinin təqdim edilən texnikanın sınaq işlərinin Avropa standartlarına uyğun yerinə yetirilməsinə imkan verir. Ölkəmizdə ilk dəfə müasir standartlara uyğun İnşaat Konstruksiyalarının Müayinəsi və Tətbiqi Laboratoriyası Paşa-İnşaatın böyük maliyyə dəstəyi ilə yaradılıb və ən yeni texniki avadanlıqlarla təchiz edilib. Son dövrlərdə AzMİU ilə "Təmiz Şəhər" ASC arasında qurulan əməkdaşlıq nəticəsində Ekologiya kafedrasının nəzdində Təmiz Şəhər Mərkəzi formalaşdırılıb və bir sıra başqa laboratoriyaların yaradılması üçün işlər görürük. İnformasiya-Kommunikasiya Fondunun dəstəyi ilə başlanğıc mərhələdə kiçik sahibkarlığın yaranması, inkişafı üçün hüquqi məsləhət və digər xidmətlərə dəstək olan İnnovativ Biznes İnkubator Mərkəzinin təsis olunması tələbələrin yaradıcılığının və biznes təşəbbüslərinin dəstəklənməsi üçün yaxşı şərait yaradıb.

Təhsilin intensivləşdirilməsi və idarəetmə strukturlarının yenidən qurulması lüzumsuz idarəetmə xərclərinə xeyli dərəcədə qənaət edilməsinə, universitetin maddi-texniki bazasının gücləndirilməsinə, kollektivin maddi rifahının yüksəldilməsinə imkan verir. Görülmüş işlərin nəticəsi olaraq 2014-2016-cı illərdə maliyyə imkanlarımız bütün əməkdaşların əmək haqlarının 50-55 % artırılmasına imkan verib.

Universitetdə elmi-tədqiqat fəaliyyətinin inkişafına, onun elmi potensialının yüksəldilməsinə, professor-müəllim heyətinin elmi işlərinin müasir tələblərə uyğun səviyyədə yerinə yetirilməsinə, gənc alimlərin və bacarıqlı tələbələrin kafedralarda, elmi-tədqiqat laboratoriyalarında aparılan elmi araşdırmalara fəal şəkildə cəlb olunmasına həmişə xüsusi diqqətlə yanaşılmışdır. Müxtəlif elm sahələri üzrə aktual mövzuların tədqiqi sayəsində AzMİU öz nəzdində elmi-tədqiqat laboratoriyaları, layihə institutu fəaliyyət göstərən geniş profilli elm və təhsil ocağına çevrilib. Hazırda universitetdə dövlət büdcəsindən maliyyələşdirilən 4 elmi-tədqiqat laboratoriyası fəaliyyət göstərir.

Professor-müəllim heyətinin və elmi işçilərin ümumi səyi ilə son illər 121 dərslik, 115 dərs vəsaiti, 305 metodiki göstəriş və fənn proqramı nəşr olunub, respublikada və xaricdə çap olunan impakt faktorlu jurnallarda, 40 dövri mətbuat orqanında 1400 elmi məqalə, 81 monoqrafiya dərc etdirilib, 42 ixtiraya patent alınıb. Universitetdə nəşr olunan "Elmi əsərlər", "Ekologiya və su təsərrüfatı", "Nəzəri və tətbiqi mexanika", "Urbanizm" adlı elmi jurnallar bu istiqamətdə qazanılan uğurların təbliği və tətbiqində xüsusilə əhəmiyyətlidir.

Universitetimizdə öz elmi məktəblərini yaratmış görkəmli alimlər çalışıblar. Professorlar İbrahim Bəxtiyarovun, Davud Axundovun, Abas Mustafayevin elmi araşdırmaları ölkəmizin sərhədlərindən çox uzaqlarda tanınıb və Azərbaycan elminə böyük şöhrət gətirib. Onların elmi rəhbərliyi

ilə müxtəlif elm sahələri üzrə çoxlu sayda alim və pedaqoqlar formalaşıb. Həmin ənənə bu gün də davam etdirilir və təhsil ocağının aparıcı alimləri akademik T.Əliyev, professorlar A.Şərifov, K.Əliyev, İ.Sadıxov, Ə.İsayev, H.Feyziyev, F.Hüseynov, N.Abdullayeva, N.Nağıyev, F.Əliyev, B.Sərdarov, M.Hacıyev, Ə.Əliyev, T.Pənahov və başqaları elmi kadr hazırlığı ilə yanaşı, bir sıra böyük elmi və praktiki əhəmiyyəti olan mövzular üzrə tədqiqatlar yerinə yetirirlər. Azərbaycan memarlıq tarixinə dair uzun illər aparılmış tədqiqatların yekunu olaraq alimlərimiz qədim və orta əsrlər dövründən başlayaraq müasir dövrü də əhatə edən Azərbaycan memarlığının tarixi haqqında beşcildlik kitab nəşr etdiriblər.

Doktorantura yolu ilə kadr hazırlığı tanınmış alimlərimiz tərəfindən həyata keçirilir. Məhz həmin mütəxəssislərin səyi nəticəsində Azərbaycanın alim-mühəndisləri həm respublikada, həm də xaricdə səriştəli kadrlar kimi tanınıblar. AzMİU-nun doktoranturasında formalaşmış kadrlar təkcə respublikamızda deyil, onun hüdudlarından kənarda da müvəffəqiyyətlə çalışırlar. Universitetdə iki Dissertasiya Şurası fəaliyyət göstərir, son beş ildə 19 ixtisas üzrə gənc alim və mütəxəssis hazırlığı işi aparılıb.

Prezident İlham Əliyev tərəfindən imzalanmış Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyasında müasir təhsilin keyfiyyət, məzmun, tədris metodikası və idarəçilik sahələrində ali təhsil müəssisələrinin beynəlxalq təcrübədən yaradıcı şəkildə istifadə etməsi təqdir olunur. Bu gün AzMİU da bir sıra beynəlxalq təşkilatların, o cümlədən Ümumdünya Universitetlər Birliyinin, İslam Ölkələri Universitetlər Birliyinin, Fransa və Şərqi Avropa Memarlıq Məktəbləri Birliyinin və başqalarının üzvüdür. Ali təhsilin modernləşməsini dəstəkləyən və Avropa Universitetləri ilə əməkdaşlıq sahəsinin yaradılmasına kömək göstərən Erasmus proqramları çərçivəsində bir çox beynəlxalq layihələrin həyata keçirilməsində iştirak edirik. Hazırda Avropa Birliyinin 3 TEMPUS layihəsində tərəfdaş kimi iştirakı başa çatdırırıq. Bunlar 2012/2015-ci illəri əhatə edən “ENOTES-Azərbaycanda ECDL Milli Operator və Test Mərkəzləri”, 2013/2015-ci illərə dair “ECONANO - Ekologiya mühəndisliyinin nanotexnologiya əsasında kurikulum islahatı və modernləşdirilməsi” və 2013/2016-cı illəri əhatə edən “RETHINK - Beynəlxalq məlumat mübadiləsi vasitəsilə təhsil islahatı” layihələridir. Bu layihələr çərçivəsində müəllimlərimiz Avropa Birliyi ölkələrinin tərəfdaş universitetlərində qısamüddətli təlim səfərlərində iştirak ediblər.

1975-ci ildən Beynəlxalq Regional İctimai Təşkilatın (MOOCAO) üzvüyük, memarlıq fakültəsinin tələbələrinin buraxılış işləri mütəmadi olaraq bu qurumun keçirdiyi müsabiqələrdə nümayiş etdirilir və layiqli yerlər qazanırlar. Hər il keçirilən ənənəvi baxış-müsabiqə ilk dəfə 1982-ci ildə, sonra isə 2014-cü ilin oktyabr ayında AzMİU və Azərbaycan Memarlar İttifaqının təşəbbüsü ilə Bakıda baş tutub.

Uzun müddətdir Türk Dünyası Memarlar və Mühəndislər Birliyi ilə əməkdaşlıq edirik, qurumun təşkil etdiyi memarlıq-mühəndislik sahəsinə dair türk dünyası şəhərsalma qurultaylarında, müxtəlif konfrans, seminar və birgə elmi tədbirlərdə mütəmadi təmsil olunuruq. Bu əməkdaşlığı daha da inkişaf etdirmək və genişləndirmək məqsədi ilə universitetdə Birliyin Azərbaycan təmsilçiliyi açılıb. Türk Dünyası Mühəndislər Birliyinin növbəti qurultayının cari ildə Bakıda, AzMİU-nun bazasında keçirilməsi qərara alınıb.

Hazırda AzMİU bu və ya digər proqramlar çərçivəsində 80-dək xarici ölkə

universitetləri - Monpelye, Sapienza, İstanbul Texniki, Orta Doğu Texniki, Moskva Dövlət İnşaat, Northampton universitetləri və bu kimi digər nüfuzlu ali təhsil ocaqları ilə əməkdaşlıq edir. Bu əməkdaşlıq ikili diplom proqramı, əməkdaşlıq müqavilələri, birgə mübadilə proqramları və digər beynəlxalq layihələr əsasında həyata keçirilir.

Universitet 2012-ci ildən Erasmus-Mundus layihələrinə, 2013-cü ildən isə Türkiyə Respublikasının Mövlanə Mübadilə Proqramına qoşulub. Bu layihələr çərçivəsində 100-dək tələbə və müəllim mübadilə proqramlarında iştirak edib.

Əsası ulu öndər Heydər Əliyev tərəfindən qoyulmuş dövlət gənclər siyasətinin bu gün Prezident İlham Əliyev tərəfindən uğurla davam etdirilməsi nəticəsində ölkə gəncləri ictimai həyatın bütün sahələrinə inteqrasiya olunublar. Təhsilin prioritet sahələrindən hesab olunan təlim-tərbiyə işləri bizim universitetdə də Azərbaycan dövlətinin gənclər siyasətinə uyğun gerçəkləşir. Gənclərimiz bu gün öz təşəbbüskarlıqları, fəallıqları ilə seçilirlər, siyasi, iqtisadi, humanitar, sosial tədbirlərin keçirilməsində fərqlənirlər.

Vətənpərvərlik tərbiyəsi təlim-tərbiyə işlərinin mühüm istiqamətlərindən biridir. Universitet rəhbərliyi belə hesab edir ki, bu hissi tələbələrə aşılamaq tərbiyə işinin əsasında durmalıdır, çünki onların təkcə ali təhsilli mütəxəssis kimi deyil, həmçinin vətənini sevən, onun dövlətçilik ənənələrinə sadiq olan, dövlətimizin rəmzləri ilə qürur duyan, müəllifi Heydər Əliyev olan azərbaycançılıq ideologiyasını həyatının amalı qəbul edən, bir sözlə, Azərbaycanın təəssübkeşi olan vətəndaşlar kimi formalaşdırılması məhz vətənpərvərlik hissindən güc alır.

Tələbələrin elmi və intellektual səviyyəsini yüksəltmək üçün “Breyn-rinq”, “Kim? Nə? Harada?” kimi intellektual yarışlar mütəmadi keçirilir, tələbələrin elm-istehsalat müəssisələrinə ekskursiyaları, respublikamızın tanınmış ictimai-siyasi xadimləri ilə, eləcə də Ağsaqqallar Şurasının təşəbbüsü ilə əmək və müharibə veteranları ilə görüşləri və s. təşkil olunur.

Tələbələrin asudə vaxtının səmərəli təşkili məqsədi ilə Azad Tələbə Həmkarlar İttifaqının nəzdində “Şən və Hazırcavablar” klubu, bədii özfəaliyyət dərnəyi və “Buta” rəqs ansamblı fəaliyyət göstərir. Bu kollektivlər universitetdə, eləcə də respublikamızda keçirilən tədbirlərdə aktivlik göstərir, bayram tədbirlərində tələbələr qarşısında konsertlər verirlər. 2015-ci ilin yayında Bakıda keçirilən Avropa Oyunlarında 1000 tələbəmiz kütləvi səhnələrin təşkilində və müxtəlif xidmət sahələrində könüllülər qismində yaxından iştirak edib.

40 illik yubileyini qeyd edən Azərbaycan Memarlıq və İnşaat Universiteti təhsilin dünya standartları səviyyəsinə çatdırılmasını, ölkənin müasir tələblərə cavab verən mütəxəssislərlə təmin edilməsini və dövlətin təhsil siyasətinin uğurla icra olunmasını özünün strateji hədəfi kimi müəyyənləşdirib. Bu hədəfə istiqamətlənmiş fəaliyyət memarlıq və inşaat sahəsində ali təhsilin 95 illik ənənələrinə, universitetin professor-müəllim heyətinin yüksək elmi, pedaqoji və peşəkarlıq potensialına söykənir.

AzMİU inkişaf edir, yeniləşir, intellektual potensialını yüksəldir, mütəxəssis hazırlığının keyfiyyətini artırmaq, dövrün çağırışlarına cavab vermək üçün yorulmadan fəaliyyət göstərir. Memarlıq və inşaat sahəsində ölkəmizdə ən iri elmi-tədqiqat mərkəzi olan universitetin alimləri aktual istiqamətlərdə elmi araşdırmalar aparır, təhsilin məzmununu elmi nailiyyətlərlə zənginləşdirir, beynəlxalq elmi əlaqələrini günbəgün genişləndirirlər. Müstəqil ölkəmizin gənc nəsli isə öz ölkəsinin tarixi və mədəni abidələrini öyrənməli, ondan qürur hissi duymalıdırlar.



# TƏHSİLİN İNKİŞAF İSTİQAMƏTLƏRİ PEDAQOJİ MÜSTƏVİDƏ

**Ənvər Abbasov,**
***Təhsil Problemləri İnstitutunun direktor müavini, pedaqogika üzrə fəlsəfə doktoru, dosent, əməkdar müəllim***

***Açar sözlər:*** *təhsilin inkişafı,vətəndaşın yetişdirilməsi, yeni məzmun, məktəbəhazırlıq,valideyn-məktəb əlaqəsi.*

***Ключевые слова:*** *развитие образования, формирование гражданина, новое содержание, подготовка к школе, связь школы с родителем.*

***Key words:*** *educational development, making good citizen, new content, school preparation, parent-school relation.*

Bu gün qlobal aləmdə gedən inkişaf dünya ölkələrində, o cümlədən Azərbaycanda da sürətli və böyük irəliləyişlərlə müşayiət olunur. İqtisadi, siyasi və mədəni sahələrdə daha böyük uğurların əldə olunması fəaliyyətlərin əsasını təşkil edir. Ölkəmizin bütün sahələrindəki perspektiv inkişaf istiqamətlərini müəyyənləşdirən “Azərbaycan–2020: gələcəyə baxış” İnkişaf Konsepsiyasının 2012-ci ildə qəbul olunması bu zərurətin təzahürü kimi diqqəti cəlb edir. Konsepsiyada göstərilir ki, “... artıq indidən ənənəvi iqtisadiyyatdan “bilik iqtisadiyyatına” keçidin əsası qoyulmalı, bunun üçün həlledici olan insan kapitalının adekvat inkişafı ön plana çəkilməlidir”(1). İnsan kapitalının inkişaf etdirilməsində təhsil əvəzsiz rola malik olduğundan konsepsiyada “Yeni təhsil sisteminin formalaşdırılması” əsas fəaliyyət istiqamətlərindən biri kimi müəyyənləşdirilmişdir.

Müstəqil Azərbaycanın qurucusu kimi bütün sahələrdə islahatların əsasını qoymuş, inkişaf istiqmətlərini müəyyənləşdirmiş Ulu öndər Heydər Əliyev Azərbaycan təhsilindən danışarkən onun başlıca məqsədini belə ifadə etmişdir: “İndi bizim təhsilimizin məqsədi gənc nəslə, uşaqlara təhsil verib onları gələcəyə hazırlamaqdır. Amma bununla yanaşı, ən böyük məqsədi Azərbaycan vətəndaşı hazırlamaqdır, müstəqil Azərbaycanın cəmiyyətinin ləyaqətli üzvünü hazırlamaqdır” (2).

Şəxsiyyətin, vətəndaşın yetişdirilməsi Azərbaycan təhsil siyasətinin cövhərini təşkil etdiyindən “Təhsil qanunu”nda da xüsusi müddəa kimi təsbit olunmuşdur: “Azərbaycan Respublikasında təhsilin əsas məqsədi ... Azərbaycan dövləti qarşısında öz məsuliyyətini dərk edən, xalqının milli ənənələrinə və demokratiya prinsiplərinə, insan hüquqları və azadlıqlarına hörmət edən, vətənpərvərlik və azərbaycançılıq ideyalarına sadiq olan, müstəqil və yaradıcı düşünən vətəndaş və şəxsiyyət yetişdirməkdir” (3).

Artıq 2013-cü ildə qəbul olunmuş “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası” və onun icrası ilə bağlı 2015-ci ildə təsdiq edilmiş Fəaliyyət Planı təhsil sahəsindəki fəaliyyətlərin hüquqi əsasına çevrilmişdir. Hazırda yeni məzmun, pedaqoji kadr, idarəetmə, maliyyə mexanizmləri və infrastruktur

məsələləri ilə bağlı beş strateji istiqamətdə islahat tədbirlərinin həyata keçirilməsi addım-addım davam etməkdədir. Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin qeyd etdyi kimi, "Biz inkişaf etmiş ölkələrin təcrübəsini yaxşı bilirik və görürük ki, o ölkələr sözün əsl mənasında inkişaf edir ki, orada təhsilin səviyyəsi yüksəkdir. Biz çalışırıq ki, Azərbaycanda bu sahəyə daim diqqət göstərilsin, praktik tədbirlər görülsün, həm təhsil sisteminin maddi-texniki bazası gücləsin, eyni zamanda və ən önəmlisi təhsilin keyfiyyəti artsın. Həm orta, həm də ali məktəblərdə bu proses ardıcıllıqla, vahid sistem şəklində aparılmalıdır və apırılır" (4).

Təhsil sahəsində uğurlar yetişən, formalaşan insanların şəxsində, nümunəsində görünür. Bu mənada təhsilin nəticələrinin nəzərə çarpması tədricən baş verir və diqqəti cəlb edir. Ona görə də şagirdlərin çoxillik təhsilini qabaqlamaq, proqnozlar vermək o qədər də asan olmur. Lakin müəyyən edilmiş müxtəlif zamanlarda, illərin aşırımında görülmüş işlərin mərhələlərinin təhlilini aparmaqla yekunlaşdırmaq və onu dəyərləndirmək mümkündür.

Azərbaycanın təhsil tarixində islahatyönümlü məqamlar çoxdur və həmin məqamların keçidləri nə qədər müzakirəli olsa da, bu günün təhsil islahatları ilə müqayisədə o qədər də yadda qalan olmayıb. İndiki təhsil islahatlarının bir mühüm cəhəti müstəqil Azərbaycanın atributuna çevrilərək onu təmsil etmək, eyni zamanda yeni təhsil sisteminin formalaşması kimi mühüm bir keyfiyyəti ümumiləşdirməkdən ibarətdir. Adətən yeniliklər asanlıqla qəbul olunmur. Tərəddüdlər müzakirələrə, diskussiyalara çevrilir. Müasirliklə ayaqlaşa bilməyən ənənələr çox hallarda mühafizəkarlıq formasında maneələr yaradır. Hər bir islahatçılıq fəaliyyətində bu reallığın aydın dərk olunması inkişafa stimul yaratmaqla təkan verir. Müşahidələr onu göstərir ki, islahat dövründə Azərbaycan təhsilinə pedaqoji innovasiyaların gəlməsi və onun qəbul olunması böyük bir ictimai–pedaqoji proses kimi yadda qalmışdır. Bu gün ciddi müzakirə və təhlillərə səbəb olan təhsillə bağlı yeni anlayış, struktur və məzmuna aid innovasiyalar özlərinə pedaqoji aləmdə müasir modellər kimi yer tutmaqdadır. Onlar bu günün zəruri pedaqoji mexanizmlərini ifadə etməklə öz əhəmiyyətini saxlamaqdadır. Azərbaycan Respublikası təhsil naziri Mikayıl Cabbarov görülmüş işlərə münasibət bildirərkən bu məsələni belə qeyd edir: "Biz nəyə nail olmuşuq və nəyin üzərində gələcək işlərimizi qurmaq niyyətindəyik? Hesab edirəm ki, ilk növbədə, təhsil sisteminə olan müəyyən mənada skeptisizm və inamsızlıq aradan qaldırılıbdır" (5).

Tərəddüd və inamsızlıq yeniliyin qəbul edilməsi yolunda böyük maneədir. Onların aradan qaldırılması təhsil sahəsində sistemli fəaliyyətlərin təmin olunması deməkdir. Bunun üçün, ilk növbədə, görülmüş işlərə nəzər salmaq, onların təhlilini aparmaq lazımdır. Uğurların səbəbini öyrənməklə addımların qətiyyətini artırmaq mümkündür. Bu mənada ötən ilin nəticələri gələcək fəaliyyətlər üçün daha böyük inam yaradır. Həmin nəticələrin bəzilərini aşağıdakı kimi təsnif etmək mümkündür.

- Ali təhsil müəssisələrinə qəbul zamanı keçid balının 200 bal olaraq qəbul olunması və ötən illərlə müqayisədə daha yüksək nailiyyətlər göstərmiş abituriyentlərin qəbul edilməsi.
- Bakı şəhəri üzrə müəllimlərin əmək haqqının artırılması.
- 3.558 nəfər Azərbaycan vətəndaşının dünyanın nüfuzlu universitetlərində təhsil almaq hüququ qazanması.
- Ali təhsil sahəsində Sabah qruplarında təhsil alan tələbələrin sayının 1636 nəfərə çatması.
- Təmayülləşmə tətbiq edilən siniflərin

sayının artması.

• Respublika fənn olimpiadasında iştirak edən şagirdlərin sayının 5 dəfə artması.

• Azərbaycanlı şagirdlərin beynəlxalq olimpiadalarda uğurlu nəticələr əldə etməsi.

• 2.327 yeni müəllimin müsabiqə yolu ilə işə qəbul edilməsi.

• 333 yeni direktorun müsabiqə əsasında işə qəbul edilməsi.

• İlk peşə ixtisas təhsili sahəsində beynəlxalq təcrübənin tətbiq edilməsi.

• 261 adda 6.623.135 nüsxə dərslik və müəllim üçün metodik vəsaitin çap edilməsi.

• 90 elektron dərsliyin yaradılması və elektron məzmunun zənginləşdirilməsi.

• 3.000-dən artıq uşağın məktəbəhazırlıq siniflərinə cəlb edilməsi.

• 30 təhsil müəssisəsinin əsaslı şəkildə təmir edilməsi və s.

Bu məsələlərin sayını artırmaq və onlara bölgələrdəki irəliləyişləri də əlavə etmək olar.

Yeri gəlmişkən qeyd etmək lazımdır ki, bu gün nəinki təhsil işçilərinin, eləcə də təhsildə maraqlı olan bütün tərəflərin təhsil siyasəti ilə, təhsildə islahatların gedişi ilə bağlı maarifləndirilməsi, təhsil prosesində onların iştirakının təmin olunması sosial faktor olan təhsilin daha çox ictimailəşdirilməsi baxımından əhəmiyyət daşıyır. Eyni zamanda keyfiyyətli təhsilə nail olmaq üçün cəmiyyətin ehtiyac və tələbatlarının nəzərə alınmasına imkan yaradır.

Azərbaycanda məktəbəqədər təhsil təhsilin ilk pilləsi hesab olunur və bu pillədə uşaqların əxlaqi, mənəvi-psixoloji və fiziki inkişafının əsası qoyulur. Lakin təəssüflər olsun ki, onun inkişafı bu günün tələblərindən xeyli geri qalır. "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda qeyd olunduğu kimi, “Məktəbəqədər təhsilə cəlb olunma səviyyəsi də aşağıdır. Belə ki, məktəbəqədər təhsillə əhatə səviyyəsi şəhərlərdə 23,4, kəndlərdə 8,7, ölkə üzrə isə 16,5 faiz təşkil edir. Son illərdə Bakı şəhərində yeni məktəbəqədər təhsil müəssisələrinin inşası və ya əsaslı təmiri istiqamətində atılan addımlar nəticəsində məktəbəqədər təhsillə əhatə səviyyəsi artaraq 27 faizə çatsa da, bu sahədə həllini gözləyən problemlər qalmaqdadır. Ölkənin yaşayış məntəqələrinin 75 faizində məktəbəqədər təhsil müəssisəsi yoxdur” (6). Bundan əlavə, məktəbəqədər yaşlı uşaqların fiziki və əqli inkişafını, sosiallaşmasını təmin edən, yaradıcılıq qabiliyyətlərini üzə çıxaran, onlarda həyati bilik və bacarıqları, davranış qaydalarını aşılayan təhsil standartlarının və yeni kurikulumların, eləcə də uşaqların erkən yaş dövründə inkişafının səmərəli təhsil modelinə əsaslanan standart və kurikulumların hazırlanması öz həllini gözləyir. Təbii ki, bunlar strateji vəzifələr kimi ölkəmizin hər tərəfində hər bir vətəndaşın, o cümlədən bu işlə məşğul olan hər kəsin üzərinə məsul vəzifələr qoyur. Bu gün ən aktual məsələlərdən biri də uşaqların məktəb təliminə hazırlanmasıdır. Reallıq ondan ibarətdir ki, uşaqlar məktəb təliminə başlayarkən problemlərlə üzləşməli olurlar. Bu problemlər onların həmyaşıdları və müəllimi ilə ünsiyyətdə, birgə qrup fəaliyyətində lazımi təlim bacarıqlarının olmamasında özünü göstərir. Onlar məktəbə hazır olmadıqlarından ibtidai təhsil səviyyəsində də çətinliklərlə rastlaşırlar. Digər tərəfdən, valideynlərin uşaqlarının inkişafı ilə maraqlana bilməmələri, yaxud maraqlanmamaları və ya əksinə, məktəb qabağı uşağı həddən artıq müxtəlif hazırlıq qruplarında, dərnəklərdə, studiyalarda onların hərtərəfli inkişafına yönəlməyən məşğələlərlə yükləmələri uşaqların bilavasitə məktəbə hazırlıq

səviyyəsinin aşağı olmasına, fiziki və psixi yükləmələrə məruz qalmalarına səbəb olur. Valideynlərin “məktəbə hazırlıq” anlayışını yalnız yazı, oxu və hesablama vərdişlərinin aşılanması kimi başa düşmələri və bu işə qeyri-peşəkar müdaxilə etmələri sonda məktəbdə öz neqativ nəticələrini göstərir. Heç şübhəsiz, bu problemin həll olunması üçün məktəbəqədər təhsilin ardıcıl və sistemli təşkil olunması vacib hesab edilir və "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda bu məsələnin xüsusi olaraq qeyd edilməsi, “məktəbə hazırlıq təhsilinin (1 il) icbariliyinin təmin olunması” (6) nəzərə alınır. 2014/15 və 2015/16-cı tədris illərində layihə şəklində məktəbəhazırlıq kursları təşkil edilir.

Artıq Azərbaycan Respublikası Nazirlər Kabineti "Uşaqların məktəbəhazırlığının təşkili məsələləri haqqında" 13 iyul 2016-cı il tarixli, 271 nömrəli və “Ümumtəhsil məktəbinin Nümunəvi Nizamnaməsi”ndə dəyişikliklər edilməsi barədə 13 iyul 2016-cı il tarixli, 272 nömrəli qərarlar qəbul etmişdir. Azərbaycan Respublikası Təhsil Nazirliyi bu qərarların icrasını təmin etmək məqsədi ilə müvafiq əmrlər vermişdir. Həmin sənədlərdə dövlət ümumtəhsil məktəblərində məktəbəhazırlıq qruplarının açılması ilə bağlı tələb olunan xərclərin maliyyələşdirilməsinin hər il Azərbaycan dövlət büdcəsinin vəsaiti hesabına həyata keçirilməsi, 5 yaşlı uşaqların məktəbəhazır-lıq təhsilinin təşkilində məktəbəqədər təhsil müəssisələri ilə yanaşı, mövcud təhsil və digər sosial-mədəni obyektlərin infrastrukturundan, dövlət ümumtəhsil məktəblərinin pedaqoji kadr potensialından istifadə edilməsi, eləcə də məktəbəhazırlığın təşkili və aparılmasına dair tədbirlər müəyyənləşdirilmişdir.

“Məktəbə hazırlığın əsas məqsədi beşyaşlı uşaqların tələb və imkanlarını nəzərə almaqla onların məktəbə hazırlıq mərhələsində inkişafı, tərbiyəsi və təhsili prosesini təşkil etməkdir” (7). Bu mərhələdə uşaqlarda oxumaq həvəsinin, məktəbə müsbət emosional münasibətin inkişaf etdirilməsi və möhkəmləndirilməsi, uşaqların məktəbə müvəffəqiyyətlə adaptasiya olunması üçün onlarda şəxsi-sosial xüsusiyyətlərin formalaşdırılması başlıca vəzifələr hesab edilir. Ona görə də məktəbəhazırlq zamanı ibtidai siniflərdə tədris olunan materiallardan istifadə etməklə uşaqları yükləmək yolverilməz hal kimi nəzərə alınmalıdır. Məktəbəhazırlığın məzmun standartlarının tələbinə uyğun təlim məşğələləri qurulmalıdır.

Məlum olduğu kimi, Azərbaycan Respublikası Təhsil Nazirliyinin 22.06.2016-cı il tarixli, 427 nömrəli əmri ilə 2016-2017-ci dərs ilində ümumtəhsil məktəblərinin I-IX sinifləri üçün tədris planları təsdiq olunmuşdur. Həmin tədris planlarında nəzərdə tutulduğu kimi, ilk dəfə olaraq ümumtəhsil məktəblərinin IX siniflərində yeni fənn kurikulumları tətbiq olunacaqdır. Bu o deməkdir ki, yeni təhsil konsepsiyasının tətbiq olunması ümumi orta təhsil səviyyəsində başa çatacaqdır. Bununla hər bir ümumi təhsil verən müəssisə doqquz illik fəaliyyətini yekunlaşdırmaqla cəmiyyət qarşısında hesabatlı olacaqdır. Ona görə də məktəb qarşıdakı tədris ilində təhsil fəaliyyətinə ciddi şəkildə səfərbər olmalı, daha uğurlu nəticələrə çatmaq üçün optimal tədris, təlim mexanizmlərindən istifadə etməlidir. Həm də bununla onlar yeni təhsil konsepsiyasının, eləcə də fənlər üzrə standart və kurikulumların tətbiqi nəticələri ilə bağlı töhfələrini verməlidir.

Azərbaycan Respublikası Təhsil Nazirliyinin 04.07.2016-cı il tarixli, 458 nömrəli əmrilə 2016-2017-ci dərs ilində lisey, məktəb–lisey və gimnaziyaların təmayül sinifləri üçün də nümunəvi tədris

planları təsdiq olunmuşdur ki, onlar da özünün orijinallığına görə məktəbin ümumi mənzərəsini dəyişməklə xarakterik mahiyyət kəsb edir. Həmçinin dərs deyən müəllimlərdən və digər pedaqoji heyətdən xüsusi peşəkarlıq tələb edir.

“Təhsil haqqında” Azərbaycan Respublikasının Qanununda qeyd edilir ki, “Tam orta təhsil səviyyəsində təhsilin təmayülləşməsi (humanitar, texniki, təbiət və digər) təmin olunur” (3). Bu yanaşmada ümumi orta təhsil səviyyəsini uğurla başa vuran, bu və ya digər fənn qrupu üzrə xüsusi istedad və qabiliyyət nümayiş etdirən, tam orta təhsil səviyyəsində keyfiyyətli təhsil almaq bacarığına, seçdikləri təmayül üzrə ali məktəbdə təhsillərini davam etdirmək potensialına malik şagirdlərin müəyyənləşdirilməsi və onların təhsilinin səmərəli təşkili başlıca məqsəd hesab edilir.

Tam orta təhsilin təmayülləşməsi pilot layihəsinə Bakı şəhərindəki 5 məktəbdə hələ 2011-ci ildə başlanılmışdır. Növbəti dərs illərində bu məktəblərin sırasına 3 məktəb də əlavə edilmişdir. Xüsusi tədris proqramı əsasında təşkil olunan tam orta təhsilin təmayülləşməsi layihəsinin nəticələri müsbət qiymətləndirildiyindən onun şəbəkəsinin genişləndirilməsi qərara alınmış və 2015-2016-cı tədris ilində daha 50 məktəbdə bu layihənin tətbiqi həyata keçirilmişdir. Artıq Azərbaycan Respublikası Təhsil Nazirliyi tam orta təhsil səviyyəsində təhsilin təmayüllər üzrə təşkil olunduğu pilot məktəbləri şəbəkəsinin genişləndirilməsi haqqında 24.05.2016-cı il tarixli, 351 nömrəli qərar qəbul etmişdir. Bu qərara əsasən təmayülləşmənin 41 regionda (5 şəhər və 36 rayonda) tətbiqi qərarlaşdırılmışdır. Eyni zamanda bu məktəblər üçün tədris planları yenidən nəzərdən keçirilərək təsdiq olunmuşdur. Heç şübhəsiz, bu qərarlardan irəli gələn mühüm vəzifə kimi xüsusi hazırlıq işlərinə başlanılmışdır. Qərara uyğun olaraq siniflərin komplektləşdirilməsi iyun ayının sonunadək başa çatdırılmışdır. Lakin tam orta təhsil səviyyəsində təhsilin təmayüllər üzrə təşkilinin əsas məqsədi, mahiyyəti və əhəmiyyətinin pilot müəssisələrinin pedaqoji kollektivinə, valideyn və şagirdlərə izah edilməsi, təmayüllər üzrə tədrisi səmərəli təşkil etmək məqsədilə pilot müəssisələrində pedaqoji kadr heyətinin gücləndirilməsi, ən başlıcası optimal məzmunun yaradılması işinin davam etdirilməsi hələ gündəmdə qalmaqdadır.

Təhsil sahəsindəki bütün fəaliyyətlərin qurulmasında pedaqoji təfəkkür əsas rol oynayır. Bu mənada müasir məktəbin inkişaf etdirilməsi üçün yeni pedaqoji təfəkkürü inkişaf etdirmək lazımdır. Görkəmli psixoloq, təhsilşünas alim Ə.Əlizadə yazırdı ki, “XX əsrdə yeni pedaqoji təfəkkür konsepsiyasının önəmli bir postulatı olub. XXI əsr isə artıq bəzən dərk edilsə də, edilməsə də, istedad–kreativlik əsri kimi formalaşır” (8). Heç şübhəsiz, məktəbimizin məzmun və struktur ölçüləri də bu tələblərə uyğunlaşmalıdır. Ona görə də məktəbi məzmun, texnologiya, infrastruktur cəhətdən yeniləşdirmək qarşıya məqsəd kimi qoyulmuşdur. Konseptual olaraq yaddaş məktəbindən düşüncə, təfəkkür məktəbinə doğru fəaliyyət istiqamətləri müəyyənləşdirilmişdir. 12 illik ümumi təhsil sisteminin qurulması üçün Dövlət Strategiyasından irəli gələn addımlar məhz bu məzmunda müəyyən edilmişdir. Bu addımların daha

uğurlu və qətiyyətli olması Azərbaycan təhsilinin beynəlxalq müstəvidə inkişafı, qlobal aləmdə görünməsi deməkdir.

Araşdırmalar onu göstərir ki, yeni məzmunun yaradılması nə dərəcədə zəruridirsə, onun uğurlu tətbiq olunması, reallaşdırılması da bir o qədər vacib hesab edilir. Bütün hallarda uğurlu təlim nəticələrinə gəlmək üçün optimal məzmunun aydın dərk olunması ilə yanaşı, düzgün pedaqoji texnologiyalar seçilməli, onlardan məqsədyönlü qaydada istifadə olunmalıdır. Eyni zamanda belə mövzular pedaqoji tədbirlərin müzakirə obyektinə çevrilməli, onlara aid təcrübə mübadiləsi aparılmalıdır.

Təhsil sahəsində dövlət siyasətinin əsas prinsiplərindən biri demokratiklikdir. Bu prinsip təhsil sahəsində bütün fəaliyyətlərin didaktik əsasını təşkil etməklə əhəmiyyət daşıyır. Xüsusilə də tədris, təlim fəaliyyətlərinin qurulmasında müxtəlif forma və vasitələrin seçilməsində ümumi didaktik tələblərin, eyni zamanda maraqlı olan tərəflərin ehtiyac və tələbatlarının nəzərə alınması faydalı bilinir. Nəticələrə nail olmaqda rolu olan qeyri-standart yanaşmalara (qeyri-standart dərslərə, interaktiv metodlara və s.) üstün yer ayrılması məqbul hesab edilir.

Bu gün təcrübədə tətbiq olunan dərs kurikulumlarının (planlarının) hazırlanmasına müxtəlif yanaşmalar mövcuddur. Bu müxtəliflik istər məzmun standartlarının seçilməsində, istər təlim məqsədlərinin müəyyən olunmasında, istərsə də dərsin strukturunun, mərhələlərinin konkretləşdirilməsində nəzərə çarpır. Ənənəvi olaraq müəllimlər bu yanaşmalardan istifadəyə dair standart göstərişlər gözləyirlər. Əslində isə pedaqoji texnologiyaların tərkibində strateji addımlar kimi istifadə olunan bu mexanizmlər daha məqsədyönlü fərdi yanaşmalar tələb edir. Çünki onların istifadə məqamlarında eyniyyət tapmaq mümkün deyildir. Bütün pedaqoji məqamlar özünəməxsusluğu ilə fərqlənir və fərqli strategiyalardan istifadə olunmasını tələb edir.

Bu fikri planlaşdırmaların hazırlanmasına da şamil etmək olar. Fənlər üzrə təqvim-tematik planlaşdırma konkret bir müəllimə məxsus olmaqla fərdi xarakter daşıyır. Çünki plan hazırlanarkən konkret sinfin şəraiti, vəziyyəti, şagirdlərin inkişaf səviyyələri və s. nəzərə alınır. Lakin təcrübə göstərir ki, fənlər üzrə illik perspektiv planlaşdırmaların hazırlanması zamanı müəllimlər hazır nümunəvi formalardan olduğu kimi istifadə edilməsinə üstünlük verirlər. Belə planlaşdırmalar pedaqoji fəaliyyətin yaradıcı təşkilini məhdudlaşdırır və təlim keyfiyyətinin aşağı düşməsinə səbəb olur.

Müşahidələr onu göstərir ki, respublikamızda, onun müxtəlif bölgələrində xeyli sayda yaradıcı, yenilikçi və tədqiqatçı müəllimlərimiz vardır. Onlar öz fəaliyyətlərini müasir kurikulumların tələbləri səviyyəsində qurmaqla, həm də tədris prosesində yüksək nəticələrə nail ola bilirlər. Belə müəllimlərin məruzə və çıxışlarını dinləmək, onlarla təcrübə mübadiləsi aparmaq, yeni texnologiyaların hazırlanması və tətbiqi üzrə təkliflər vermək innovasiyaların zənginləşməsi və inkişaf etdirilməsi baxımından əhəmiyyətlidir.

İlkin araşdırmalar göstərir ki, yeni texnologiyaların və resursların yaradılması yeni məzmunun hazırlanması sürətindən geri qalır. Hətta ayrı-ayrı fənlərin keyfiyyətli tədris olunması məqsədi ilə lazımi tədris resurslarına ehtiyacın yaranması zərurətinin meydana çıxdığı müşahidə olunur. Təhsildə yeniliklərin sürəti artdıqca və tələblər tez-tez dəyişdikcə resurslara olan ehtiyacların ödənilməsində təbii ləngimələrin olduğu hiss edilir. Həm də bunun bir mərkəzdən vahid qaydada həyata keçirilməsinin çətin-

likləri meydana çıxır. Əslində müasir dövrdə bu məsələnin tam başqa müstəvidə həlli məqsədəuyğun hesab edilə bilər. Məlum olduğu kimi, əvvəlki proqramlardan fərqli olaraq müasir təhsil proqramlarının (kurikulumların) bir mühüm cəhəti orada məzmun standartları ilə yanaşı, təlim texnologiyaları və strategiyalarının öz əksini tapması ilə bağlıdır. Həmin kurikulumlar ümumi pedaqoji tələbləri və nümunələri əhatə edir. Bu materiallar unifikasiya olunmuş tipdə tövsiyə xarakteri daşıyır. Onlar hər hansı bir pedaqoji mühitdə istifadə olunarkən fərdiləşir və konkret təcrübəyə çevrilir. Belə olduğu təqdirdə müəllim hazırladığı texnoloji vasitələrdən istifadə etməklə özünün təcrübəsini yaratmalı olur. Təhsil müəssisəsi belə bir zərurəti nəzərə alaraq innovasiyalarla zəngin pedaqoji prosesin təşkil edilməsində maraqlı olmalıdır. Onun təşkil edilməsi üçün özünün pedaqoji tələblərini müəyyənləşdirməli, metodik təminatı sistemini yaratmalıdır. Eyni zamanda pedaqoji-psixoloji laboratoriya qismində tədris, təlim fəaliyyətlərinə dəstək verməlidir.

Pedaqoji prosesin müvəffəqiyyətli təşkili və aparılmasında müəllim amili aparıcı rol oynayır. Nə qədər müasir texnologiyalardan istifadə olunsa da, müəllim amili pedaqoji prosesdə əvəzolunmaz bir qüvvə kimi qalmaqdadır. İslahatlar dövründə yeni pedaqoji innovasiyaların tətbiq olunması istər-istəməz müəllim amilinə olan tələbi daha da artırmışdır. İlk növbədə, müəllim kadrlarının seçilib yerləşdirilməsi ilə bağlı tədbirlər həyata keçirilmişdir. Azərbaycan Respublikası Prezidentinin 2012-ci il 5 sentyabr tarixli sərəncamı ilə təsdiq olunmuş “Karrupsiyaya qarşı mübarizəyə dair 2012-2015-ci illər üçün Milli Fəaliyyət Planı”na uyğun olaraq müəllimlərin işə qəbulunun mərkəzləşdirilmiş qaydada, elektron proqram təminatı tətbiq olunmaqla şəffaf keçirilməsi üçün müvafiq qaydalar işlənib hazırlanmış və elektron proqram təminatı yaradılmışdır. Artıq beşinci ildir ki, Təhsil Nazirliyi tərəfindən ümumtəhsil müəssisələrinə və peşə liseylərinə müəllimlər mərkəzləşdirilmiş müsabiqə yolu ilə və elektron proqram təminatı tətbiq edilməklə işə qəbul edilirlər. Təkcə 2015-2016-cı tədris ilində 3.462 yerə qarşı 24.437 elektron ərizə verərək imtahanda iştirak edən 18.573 nəfərdən 2.879 nəfər işə qəbul olunmuşdur. Göründüyü kimi, seçim şəffaf və ciddi şəkildə aparılır. Bu, pedaqoji heyətin daha bacarıqlı qüvvələrlə zənginləşməsinə imkan yaradır.

Müəllimlərin diaqnostik qiymətləndirilməsinin də keçirilməsi məktəblərin müəllim kadrlarının inkişafı üçün təşkil olunan tədbirlərdən hesab edilir və bu tədbir təlimin keyfiyyətinin yüksəldilməsində başlıca amillərdən biri kimi dəyərləndirilir. Ötən il Bakı şəhəri üzrə keçirilmiş bu qiymətləndirmədə 28.758 müəllim iştirak etmişdir. Davam etdirilməkdə olan bu tədbir onların fənn bilikləri və peşəkarlıq səviyyələrini, eləcə də yeni texnologiya ilə işləmə bacarıqlarını müəyyənləşdirməyə imkan yaradır. Belə tədbirlər nəticəsində müəllimlərin inkişaf etdirilməsi üçün istiqamətləri müəyyənləşdirmək asan olur.

Müəllim təhsil verməklə yanaşı, ömrü boyu öyrənməli, özünü inkişaf etdirməklə məşğul olmalıdır. Bunu onun işinin xüsusiyyəti tələb edir. Məşhur Amerika təhsilşünası Haydi Heyes Ceykobs XXI əsrin kurikulumlarından danışarkən qeyd edir ki, “Pedaqoq olaraq bizim hədəflərimiz təhsil alanların ehtiyaclarını böyük sürətlə dəyişən dünyaya uyğunlaşdırmaqdır. Bu

hədəfə nail olmaq üçün biz özümüzdə perspektivlərimizi şüurlu şəkildə genişləndirərək və yanaşmalarımızı yeniliyərək strateji təhsil alanlara çevrilməliyik" (9). Çünki yeni texnologiyalar yarandıqca onlardan istifadə problemləri meydana gəlir, yaxud yeni təlim texnologiyalarından peşəkarlıqla istifadə olunması mühüm pedaqoji problemə çevrilir. O zaman müəllim, eləcə də təhsil müəssisəsi konkret tələbat-larını müəyyənləşdirməklə həmin problemin həlli istiqamətində addımlar atmalıdır.

Müasir məktəbin inkişafını stimullaşdıran vasitələrdən biri qiymətləndirmə texnologiyalarından səmərəli istifadə etməkdir. Lakin bu, o zaman özünün səmərəsini verir ki, qiymətləndirmə texnologiyasının ibarət olduğu sistem yaradılmış olsun. Doğrudur, islahat dövründə şagird nailiyyətlərinin qiymətləndirilməsi üzrə müəyyən işlər görülmüş, hüquqi sənədlər hazırlanmışdır. Onların içərisində "Azərbaycan Respublikasının ümumi təhsil sistemində Qiymətləndirmə Konsepsiyası" xüsusi yerə malikdir. Ona əsasən fənlər üzrə qiymətləndirmə mexanizmlərinin hazırlanması, eləcə də qiymətləndirmənin növləri üzrə ayrı-ayrılıqda konsepsiyaların, qaydaların işlənməsi həllini gözləyən məsələlərdir.

Müasir pedaqoji problemlərdən biri də məktəb dərslikləridir. Məlum olduğu kimi, son illərə qədər dərsliklər daha çox müzakirə olunmaqla mübahisə obyektinə çevrilmişdir. Bu gün informasiyaların artdığı və nəticəyönlü bir təhsil siteminin yarandığı zamanda dərsliyin statusu dəyisir. O tədricən məktəbdə istifadə olunan və standartların reallaşmasına xidmət göstərən tədris resurslarından birinə çevrilir. Bunu həm də şagirdlərdə həyati bacarıq kimi formalaşması zəruri olan axtarıcılıq, tədqiqatçılıq qabiliyyətinin inkişafı da tələb edir. Ona görə də dərsliklərin hazırlanmasında variativ texnologiyaların olmasına təbii yanaşılmalıdır. Ondan peşəkarlıqla və daha yaradıcı istifadə olunması, bu sahədə müəllim təcrübəsinin öyrənilib ümumiləşdirilməsi və müzakirə edilməsi istiqamətində işlər aparılmalıdır. Artıq dərsliklərin hazırlanması və təcrübədən keçirilməsi sahəsində yeni istiqamətlər müəyyənləşdirilmişdir. Xüsusilə dərsliyin hazırlanmasında şəffaflığın gözlənilməsi, ictimai müzakirələrin güclənməsi onun keyfiyyət səviyyəsinin artmasına səbəb olmuşdur. Bu proses həm də dərsliklərin təcrübədən irəli gələn faktlar hesabına zənginləşməsinə, şagirdin zehniyyətinə ən yaxın olan ədəbiyyat kimi dəyərləndirilməsinə imkan yaratmışdır.

Müşahidələr onu göstərir ki, müəllimlər dərsliklərə ehkam kimi yanaşmaqla onun bütün müddəalarını birmənalı şəkildə tətbiq etməyə səy göstərirlər. Bu isə həm şagirdlərin maraq dairəsinin, həm də yaradıcılıq imkanlarının məhdudlaşdırılmasına gətirib çıxarır. Əslində müasir yanaşmaların fonunda dərslik daha qabarıq görünsə də, müəllifin variativ yanaşması kimi zəruri pedaqoji mənbə hesab edilir. Məzmun standartlarının reallaşdırılması üçün istifadə edilən bir texnologiya kimi dəyərləndirilir. Pedaqoji prosesdə aparıcı rola malik olan müəllim əsas sima kimi dərslikdən istifadə edərkən, ilk növbədə, onu nəzərdən keçirməli, sinfinin səviyyəsi, özünün imkanları baxımından lazımi qeydlər aparmalı, edəcəyi əlavə və dəyişikliklər barədə müəyyənlik yaratmalı, təqvim-tematik planlarının hazırlanmasında bunları nəzərə almalı və bu barədə fənn metodbirləşməsinə müraciət etməlidir.

Zəruri məsələlərdən biri kimi vali-

deyn-məktəb əlaqələrinin müasir səviyyədə qurulması məsələsi özünün həssaslığı ilə seçilir. Çünki müasir məktəb yeni nəslin formalaşdırılması missiyasının həyata keçirilməsini valideynlə əlaqə şəraitində başa vura bilər. Ona görə də müasir məktəbin fəaliyyətinin bütün sahələrində valideyn yaxından iştirak etməlidir. İstər məktəbin işinin planlaşdırılmasına, istərsə də fəaliyyətlərin təşkilinə öz dəstəyini verməlidir. Məktəb bu işdə özünün təşkilatçılıq missiyasından istifadə etməli, şəffaf və çevik əlaqələrin qurulmasında maraqlı olmalıdır.

Məktəbin müasir zamanda idarə olunması məsələləri də diqqət mərkəzində dayanan problemlərdəndir. Ümumi təhsilin keyfiyyət səviyyəsinin yüksəldilməsində idarəetmə mədəniyyətinin rolu, hesabatlılıq, məsuliyyətin bölüşdürülməsi, inkişafın monitorinqi kimi müasir idarəetmə prinsiplərinin mahiyyət və məzmunu da obyektiv və ciddi araşdırmaların aparılmasını tələb edir.

Əlbəttə, islahatlar dövründə təhsilin problemlərindən daha geniş miqyasda danışmaq olar. Çünki müasir zamanda məktəbin həyatında gedən sürətli dəyişikliklər və ona uyğun yaranan yeniliklər bunu tələb edir. Lakin biz bu məqalədə yalnız ən ümumi məsələlərdən bəhs edə bildik. Heç şübhəsiz, gələcəkdə bu məsələlər daha dərindən və geniş miqyasda araşdırılacaq və pedaqoji problem kimi özünün həllini tapacaqdır.

***Rəyçi: prof. F.Rüstəmov***

## İstifadə edilmiş ədəbiyyat

1.http://www.president.az/files/future_az.pdf [PDF] “Azərbaycan 2020: gələcəyə baxış” inkişaf konsepsiyası.

2. Azərbaycan Prezidenti Heydər Əliyevin respublikanın təhsil işçiləri və ali məktəblərə daxil olmuş tələbələrlə görüşdə nitqi, 31 avqust 1999-cu il / Azərbaycanın təhsil siyasəti (1998-2004). I kitab. Bakı: Çaşıoğlu, 2005.

3. “Təhsil haqqında” Azərbaycan Respublikasının Qanunu. Bakı: Hüquq ədəbiyyatı, 2009.

4. http://xeber.azeri.net/tehsil/ilham-eliyevin-tehsil-sahesinde-dedikleri.

5. http://edu.gov.az/az/page/9/11144.

6. www.president.az/articles/9779 Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası

7. http://edu.gov.az/az/page/92/1016

8. Əlizadə Ə. Fantaziya binomu. Bakı, 2008.

9. Curriculum 21 : essential education for a changing world / edited by Heidi Hayes Jacobs. © 2010 by ASCD.

**Э.Аббасов**

**Направления развития образования на педагогической плоскости**

**Резюме**

В статье говорится о задачах развития азербайджанского образования. Отмечаются завоеванные успехи. Обосновываются стратегические шаги в направлении ведения реформ в области содержания учебы, технологий, оценивания.

**A.Abbasov**

**Development trends of pedagogical education**

**Summary**

In the article it is dealt with the development of education in Azerbaijan. The achievement which has been gained is noted. Strategic activities on the field of reforms, the content of training, and technological assessment are also noted here.



# AZƏRBAYCAN PEDAQOJİ FİKRİNDƏ MİLLİ DEMOKRATİK TƏHSİL İDEYALARI

**Vidadi Bəşirov,**
***Azərbaycan Dillər Universitetinin dosenti, pedaqogika üzrə fəlsəfə doktoru***

***Açar sözlər:*** *Azərbaycan maarifpərvərləri, demokratik təhsil, milli tərəqqi, milli müstəqillik, şəxsiyyət fenomeni, milli və ümumbəşəri dəyərlər, müasir həyat, gənc nəsil, ideya-mənəvi irs.*

***Ключевые слова:*** *просвещение, демократическое образование, национальный прогресс, национальная независмость, феномен личности, национальные и общечеловеческие ценности, современная жизнь, новое поколение, идейно-духовное.*

***Key words:*** *Azerbaijani educators, democratic education, national progress, national independence, phenomenon of personality, national and universal values, modem life, young generation, ideological and moral heritage.*

Məqalədə XIX əsrin sonu, XX əsrin əvvəllərində Azərbaycan pedaqoji fikir tarixində irəli sürülən demokratik ideyaların təhlilinə toxunulmuşdur. Qeyd olunur ki, həmin tarixi dövrdəki Azərbaycan maarifçilərinin ideya mənəvi irsinin müstəsna əhəmiyyəti vardır. Azərbaycan ictimai mühitində baş verən demokratik dəyişikliklər yeni, milli-ideoloji konsepsiyalar, yeni təfəkkür Azərbaycan ziyalılarının yetişməsinə rəvac verən məsul bir qüvvəyə çevrilərək, azad və sərbəst düşüncəyə yol açdı.

Respublikamız müstəqillik yolu ilə inkişaf etdiyi, təhsil sisteminin ümumbəşəri dəyərlər və milli zəmin üzərində qurulduğu, yəni təhsil islahatçılığı ideyalarının cəmiyyət həyatında təsbit olunduğu bir şəraitdə başqa sahələrdə olduğu kimi, milli pedaqogika və onun tarixi istiqamətində aparılan dərin elmi-nəzəri axtarışlara da ciddi ehtiyac vardır.

Gənc nəslin intellektual-mənəvi inkişafının formalaşmasında tarixi şəxsiyyətlərin, o cümlədən Azərbaycan maarifpərvərlərinin ideya-mənəvi irsinin müstəsna əhəmiyyəti vardır. Həmin tarixi qaynaqlardan, milli-mənəvi dəyərlər sistemindən, rasional pedaqoji düşüncələrdən istifadə yolu ilə məşğul olan sosial-pedaqoji fakt və hadisələrlə əlaqədar elmi yeniliklərdən hali olmaq bu gün pedaqoji proses iştirakçıları üçün olduqca önəmli olan bir vasitədir.

Odur ki, hazırkı şəraitdə Azərbaycan maarifpərvərlərinin milli tərəqqi ideyalarının təbliği, təşviqi və yayılması istiqamətində elmi-nəzəri axtarışların aparılması, onun tətbiqi istiqamətlərinin möhkəmləndirilməsi yolunda atılan hər bir uğurlu addım pedaqoji fikir tariximizin zənginləşməsi üçün həm də güclü və qüdrətli didaktik vasitədir.

Hər bir tarixi dövrün dinamik inkişaf xüsusiyyəti, sosial-mədəni tələblər sistemi onun milli mücadilə tarixinə bəxş etdiyi görkəmli şəxsiyyətlər, qabaqcıl ideya carçıları tərəfindən daha geniş məzmun məndəricəyə malik olmuş, ayrı-ayrı xalqlar və millətlər arasında "yaxşı insan" olmaq konsepsiyası

üzrə bəşəri siqlətlərin təkamülü üçün real şərait yaranmışdır.

Məşhur türk ideoloqu və maarifpərvər Ziya Göyalpın yazdığı kimi: “Tarix ümumi bir qayda olaraq göstərir ki, haraya milliyyət ruhu giribsə, orada tərəqqi və təkamül axını - cərəyanı yaranıb… Milli vicdan harada təkamül edibsə, artıq ora müstəmləkə olmaq təhlükəsindən əbədi olaraq qurtulmuşdur”.

XIX əsrin sonu XX əsrin əvvəllərində türk dünyasının milli hərəkat tarixinin oyanışı yeni dövrün ictimai-sosial hadisələri üçün ideya məfkurəsinə çevrildi. Bununla yanaşı, Azərbaycan ictimai mühitində baş verən ciddi demokratik dəyişikliklər yeni, milli-ideoloji konsepsiyaların, yeni təfəkkürlü Azərbaycan ziyalılarının yetişməsinə rəvac verən işıqlı bir qüvvəyə çevrilərək, azad və sərbəst düşüncəyə yol açdı.

Xüsusən XIX əsrdə Azərbaycanda maarif, mədəniyyət, elm, sənaye, ticarət inkişaf etməyə başladı. Bakıda neft sənayesinin yaranması, Bakı-Tiflis dəmir yolunun çəkilməsi Azərbaycanda kapitalist istehsal üsulunun yaranmasına səbəb oldu.

XIX əsrin sonu və XX əsrin əvvəllərində Azərbaycanın şəhər və kəndlərində təbəqələşmə, sinfi ziddiyyətlər başladı. 1903/1904-cü illərdə fəhlə sinfi tətillər, çıxışlar edib bu yolla mövcudluğunu təsdiq edərək demokratik islahatlar uğrunda öz tələblərini irəli sürürdülər. Bu tələblər sisteminə ana dili təlimi uğrunda mübarizə, savad təlimi, humanizm, demokratizm, azad və sərbəst düşüncə, xəlqilik və digər mütərəqqi ideyalarının formalaşması istiqamətində atılan addımlar daxil idi.

Pedaqoji irsin məhz tarixi kontekstdən olan nümunələrinə qayğı ilə yanaşmaq, onu tədqiq edib mütərəqqi-demokratik baxışlarını mənimsəmək mədəni-maarif sahəsindəki uğurlarımızın nəinki keçmiş səhifələrini, həm də bu günün tarixi nailiyyətlərini əxz etmək üçün də böyük əhəmiyyətə malikdir. Bu cəhətdən ictimai pedaqoji qurumların, pedaqoji cəmiyyətlərin xarakteri, yaranma tarixi, ideya istiqaməti, Azərbaycan ictimai-pedaqoji fikrindəki rolu, təhsil işi uğrunda mübarizəsi, sosial həyata təsiri, ictimai məzmunu və s. məsələlər xalqımızın ictimai-pedaqoji fikir tarixini öyrənmək üçün mühüm mənbədir.

Ümumiyyətlə, problemin aktual cəhətlərini sistemləşdirib belə nəticə hasil etmək olar ki, “Azərbaycan pedaqoji fikrində milli-demokratik təhsil ideyaları (XIX əsrin sonu, XX əsrin əvvəlləri)” mövzusu üzrə şərh olunan məsələdə tarixi dövrün demokratik fikirli ziyalılarının məqsəd və mübarizəsinin elmi-pedaqoji, sosial-siyasi mahiyyətini tədqiq edib, onun qarşılıqlı təsirindən irəli gələn və bu gün üçün mühüm əhəmiyyət daşıyan vətən, millət, mədəniyyət anlayışlarının gənc nəsildə oyatdığı təsir yollarını aşkara çıxartmaq bu yönümdən mütərəqqi əhəmiyyətə malik ümumxalq və ümumdövlət səviyyəli bir işdir.

Bu gün gənc nəsildə milli-mənəvi keyfiyyətlərin ayrılmaz hissəsi olan tarixi-pedaqoji irsə məhəbbət hissi, tərbiyə sistemi geniş sosial məzmuna malik məqsədyönlü və ardıcıl fəaliyyət əsasında qurulmağı tələb etdiyindən, biz də problemin qoyuluşuna əsasən bu istiqamətdən münasibət bildirmək istəmişik.

Məlumdur ki, XIX əsrin sonu XX əsrin əvvəllərində Azərbaycanın mədəniyyət və milli hərəkat tarixinin görkəmli simaları bir qayda olaraq xalqın ümumi tarixindən, ictimai-siyasi və sosial-iqtisadi həyatından, bu sahədə öz əhəmiyyətini itirməyən qiymətli ədəbi-tarixi və elmi-nəzəri mülahizələr irəli sürmüşlər. Bu mənada dövrünün görkəmli maarifpərvərləri kimi xalqının geriliyinin səbəbini dini

cəhalət və mövhumatda axtaran N.Nərimanov, C.Məmmədquluzadə, M.Ə.Sabir, Ü.Hacıbəyli, Ö.F.Nemanzadə və digər tərəqqipərvər ziyalılar xalqı hər vəchlə millimənlik şüuru aşılayan fikirlərlə ictimai tərəqqiyə səsləmiş, bu yolla vətənə, xalqa xidmətin başlıca qayəsini ana dilinə məhəbbətdə görmüş, beynəlmiləlçiliyin, bəşəriliyin mayasını millilikdə axtarmışlar. Çünki "millilik olmayan yerdə bəşərilik yoxdur" - deyə, hadisələrə ictimai məzmun verməyə çalışmış N.Nərimanovun "ana dili… nə qədər əzəmətli bir qüvvə" "ideyası bu sahədə olan əməli fəaliyyətini təyin etmək üçün qiymətli nümunədir.

Maarifpərvər ədib xalq arasında millimədəniyyət toxumu səpən ideyalarının qızğın təbliğatı üçün ciddi səy göstərərək, "Azərbaycan müəllimlərinin birinci qurultayında (1906)… gündüz iclasında, tərəqqipərvər maarif xadimlərinin Azərbaycan dilinin icbari fənn kimi məktəblərdə yeni proqram əsasında tədrisinə və müəllimlərin hüquq bərabərliyinə nail olmağa çağırırdı" (1).

N.Nərimanovun ictimai-tərəqqi ideyalarında milli mənlik şüurunun formalaşdırılması probleminə də toxunulmuş, bu əsasda xeyli elmi-nəzəri fikirlər söylənilmişdir. Milli dərkin oyanması ilə əlaqədar N.Nərimanovun ədəbi-pedaqoji irsindəki dərin ümumiləşdirmələr son dərəcə müasir əhəmiyyətli fikirlərdir. Onun bu kontekstdən olan maarifçilik ideyaları, xüsusən Azərbaycan məktəb və pedaqoji fikir tarixində böyük əhəmiyyəti olan didaktik və tərbiyələndirici ideyalarında daha məqsədyönlü məramlar işlənilmişdir.

Xüsusən XX əsrin əvvəllərində dünyəvi məktəblərin artırılması, onun inkişafı qayğısına qalmaq xalqın qarşısına kəskinliyi ilə qoyulmuşdur. N.Nərimanov bu münasibətlə vaxtilə müəllimlər qurultayı ərəfəsində yazmışdı: "…Vətənin xoşbəxtliyi onun cavanlarının yaxşı tərbiyəsi ilə bağlıdır… yaxşı tərbiyə isə insanın əqlini öz əxlaqını gözəl, pak şeylər əxz etməyi öyrətməkdən ibarətdir… Əqlin gücü ilə insan pis əməli yaxşıdan seçər…" (3).

Milli oyanış, milli fütuhatı aydın dərk etmək, böyüməkdə olan nəsli yeni ruh və məfkurədə, kamil şəxsiyyət kimi formalaşmasında N.Nərimanov tərəfindən qələmə alınmış "Müəllimlər ictimainə dair", "Müsəlman müəllimləri yığıncağı münasibəti ilə bir neçə söz", "Mühüm bir məsələ", "Bu gün" və s. məqalələrində qoyulmuş ideya-mənəvi siqlət, ictimai tərəqqiyə inam məsələləri gənc nəslin intellektual-əxlaqi baxışlarının hazırkı mərhələdə möhkəmlənməsinə tutarlı vasitədir.

N.Nərimanovun pedaqoji irsində milli mənlik şüurunun qoyuluşu tərəqqipərvər ideyalardan nəşət almışdır.

İctimai tərəqqiyə inam məsələlərinin aşılanmasına, ümumbəşəri duyğu və arzuların mənimsənilməsinə, xalqların siyasi və milli şüurunun inkişafına bədxahlıq mövqeyindən yanaşan şovinist və millətçi qüvvələrin ziddinə olaraq onun xalqın milli şüurunda vətənpərvərlik, xalqlar dostluğu kimi istifadə olunan ədəbi-bədii, tarixi-pedaqoji fikir və mülahizələrindən faydalanıb bugünkü ziddiyyətli dövrümüz üçün aydın nəticələr çıxarmaq lazımdır.

XIX əsrin sonu XX əsrin əvvəllərində Azərbaycanın azadlıq, tərəqqi uğrunda mübarizənin yorulmaz fəadilərindən biri olan görkəmli naşir və pedaqoq Ö.F.Nemanzadə xalqın tərəqqisini onun milli dərkində görürdü. Bu yolda onun irəli sürdüyü fikirlər bu gün daha aktualdır. Odur ki, son illərdə bu sahədə aparılan tətbiqi xarakterli hər bir yeniliyin nəzərdən keçirilib öyrənilməsi diqqətəlayiq təşəbbüs sayılmalıdır.

Ö.F.Nemanzadə xalqın azadlığı uğrunda mübarizənin tərkib hissəsi olan milli mətbuatın ana dilində çıxarılması və onun vahid ədəbi dil normalarına tabe

edilməsini vacib şərtlərdən biri hesab edirdi. Xalqın maariflənməsində, savad təliminin tez yayılmasında, sadə və açıq anlayışların mənimsənilməsində ana dilində hazırlanmış oxu kitablarına böyük əhəmiyyət verirdi. Bu cəhətdən o, siyasi və milli məsələlər arasında dil mübahisəsinə ciddi problem kimi baxırdı. O, bu xüsusda yazırdı: “… təkrar edirəm: xalqın anlaya biləcəyi bir dilimiz olmalıdır. Bu ümumi nüfuzlu dil dəxi mərifətli millətlərlə olduğu kimi şəxssiz, xalqa yaxından mətbuat dilidir. Dili, mətbuat dili olmayan bir millətin siyasi vücudiyyəti də olmaz…” (4).

Onun yenilməz ideyalarının daimi məqsədi dövrlə uzlaşmayan təlimin sxolastik üsullarına, təhsilin həyatdan uzaq düşməsinə qarşı mübarizə aparmaq və dünyəvi milli məktəblərin mütərəqqi ideyalar əsasında yenidən qurulmasına nail olmaq idi. O yazırdı ki, “Məni” ən ziyada rahatsız edən dərdlərimizdən biri də dil və imla məsələsi idi. Dilimizin qarşılığını, əlifbamızın yaranmasını mənə ilk dəfə öyrədən 1894-cü ildə Şəki milli məktəbinin 7-8 yaşındakı balaları oldu. Şəki məktəbinə aid yazılarımda söylədiyim kimi, köhnə tədris üsulunun çətinliyi üstə artan əlifba yaramazlığı yalnız yeddi yaşlı balacaları deyil, 70 yaşındakı bəzi böyüklərimizi də çox çaşdırdı. Hələ imlamızın ərəb qiraət üsuluna tabe edilməsi məndə dində olduğu kimi, ədəbiyyat aləmində də öz cəhalətimiz yerinə ərəbcəyə qarşı düşmənçilik hissi oyadırdı… Bəlkə, mən bu məsələyə həddindən artıq əhəmiyyət verib və şişirdirəm. Çünki mənə elə gəlirdi ki, müstəqil dil və ədəbiyyatı olmayan bir millətin siyasi istiqlaliyyəti də ola bilməz” (7).

Həmin tarixi dövrdə Azərbaycanda milli tərəqqi ideyalarının təşəkkül prosesi regionun ayrı-ayrı qəzalarında, bu amala xidmət edən milli, yeni ruhlu dərsliklərin yaranmasına olan tələbat da böyük idi.

Xüsusən milli mənlik, milli yaddaş şüurunu ehtiva edən ideyalarla xalqın içərisində olub, təhsilləndirici iş aparmaq səyi böyük idi.

Bu işdə R.Əfəndiyev, M.Mahmudbəyov, A.O.Çernyayevski, S.Vəlibəyov, F.Ağazadə, Ü.Hacıbəyli ilə birlikdə qızğın vətənpərvər, milli təəssübkeşlik ideyaları ilə mütərəqqi cəbhəyə bağlanan və fəaliyyətini xalqın milli intibahına, inkişafına yönəltmiş, on ildən artıq Şəki, Şamaxı, Gəncədə müəllimlik etmiş Ö.F.Nemanzadə, geniş xalq kütləsi ilə təmasa girmiş, uşaqlara yeni ruhda tərbiyə verməklə bərabər, böyüklər arasında ideya-mənəvi yönümlü təbliğat işi aparmış, mədəni tədbirlər həyata keçirmişdir. Onun səmərəli pedaqoji fəaliyyətində milli dərketmənin ən vacib ünsürlərindən biri olan Vətən övladlarının təhsillənmə inkişafının təkmilləşməsi, mütərəqqi məzmun alması məsələləri mühüm yer tuturdu. O, 1894-1896-cı illərdə Şəkidə maarif cəmiyyətinin təşkil etdiyi üsuli-cədid üzrə Qafqazda ilk nizamlı türk (müsəlman) məktəbinin fəaliyyətləri haqqında öz mülahizələrini bildirmişdir. Görkəmli maarifpərvər yazırdı ki, “Biz müəllimlər öz aramızda dörd illik ibtidai bir məktəb proqramı yazdıq və dərs cədvəli də düzəltdik. O vaxtlar ən çətin məsələ məktəblər üçün kitab tapmaq idi. Qafqazda çap edilmiş türkcə məktəb kitabı yox idi. İstər Türküstan, Krım, istərsə də Qafqaz üçün məktəb kitabı Bağçasarayda “Tərcüman” sahibi İsmayıl bəy Qasprinski (Qaspralı) tərəfindən çap edilən türkcə qiraət, ilk hesab, coğrafiya kitabları idi” (4).

Ömər Faiqin arxiv xatirələrindən götürülmüş bu sətirlərdən yəqin olur ki, 1883-cü ildə Krımla tatar dilində nəşr edilən “Tərcüman” qəzetində, onun naşiri və redaktoru, Krım tatarlarının milli deoloqu, İsmayıl bəy Qasprinski (Qaspralı) (1851-

1914) öz məsləkdaşlarını gələcək nəslin xüsusi müsəlman övrətlərini milli idraka səsləmək üçün, ana dilinə sahib olmağa və bu sahədə dərs vəsaitlərinin vacibliyini öz qəzeti vasitəsilə geniş kütləyə bəyan edirdi. Məsələn, bu haqda o yazırdı: "Bütün Rusiyada tatar adlandırılanların hamısı – bir ailənin – uyğur türklərinin övladlarıdır. Onların bir ümumi ana dili – türk dili vardır. Ayrı-ayrı ailələrdə bu dildə baş verən dəyişikliklər, türk dilinin dialektlərə parçalanması tarixi, siyasi və s. şəraitlərin təsiri altında baş vermişdir. İndi türklər Rusiyanın bir binası altında yaşadığı halda, onlar öz talelərini vahid, ümumi Vətən taleyi ilə bağlamışlar və onların həyatında heç bir başqa siyasi dəyişikliklər gələcəkdə də görünmür. Ona görə də onlar vaxtilə hamısı üçün ana dili olan həmin dildə yenə də birləşsinlər. Türk tayfası rus müsəlmanları öz qüdrətli ədəbiyyatlarını, poeziyasını və s. yenidən yaratmaq üçün öz dillərini birləşdirməlidirlər" (2).

Təbliğ etdiyi ideyasını əsaslandırmaq üçün İsmayıl bəy öz qəzetini elə bir dildə nəşr edirdi ki, onun fikrincə bu dil ümumi türk dilinin nümunəsi olmalı idi. Bu əsasda İsmayıl bəyin həm müsəlmanlar, həm də rus şərqşünasları arasında ideya rəqibləri var idi. Bu opponentlərin bəziləri onun mövcud burjua çərçivəsində olan ideyalarını tamam təkzib edib öz müddəalarını irəli sürərək deyirdilər ki, "rus türklərinin hər bir ayrı düşmüş ailəsi əvvəlcə öz ana dilini, yaxud ləhcəsini yaxşıca öyrənsin, sonra isə ümumi dili öyrənməyə keçsin" (8).

O illərdə dövri mətbuat səhifələrində, xüsusən "Tərcüman" qəzetində İsmayıl bəy maarifçilik baxışlarındakı demokratizm, təlim-tərbiyə səciyyəli məsələləri müdafiə edərkən göstərdi ki, "uyğur-türk-tatar xalqlarının maariflənməsi işində onun (İsmayıl bəyin – V.B.) əməli xidmətləri olmuşdur" (5).

Ümumiyyətlə, bu tarixi dövrdə təhsil uğrundakı mübarizə əsasən aşağıdakı yollarla irəliləyirdi:

1. Dünyəvi elmlərin keçirilməsi uğrunda göstərilən səylər vasitəsilə;
2. Yeni məktəblər yaradılması təşəbbüsü ilə;
3. Müvafiq proqram hazırlıq işinin səviyyəsini artırmaq imkanı ilə.

Nəticə olaraq dünyəvi elmlərin mənimsənilməsi, yeni məktəblərin yaradılması, onun tədris proqramlarının təkmilləşdirilməsi məsələləri XIX əsrin sonu XX əsrin əvvəllərində Azərbaycan maarifpərvərlərinin pedaqoji iş sahəsində fəaliyyətinin dönüş nöqtəsi oldu.

XIX əsrin sonu, XX əsrin əvvəllərində azərbaycanlı müəllimlər mütərəqqi cəbhəni təmsil edən rus maarifpərvər pedaqoqlarının elmi-metodiki irsini mənimsəmək əsasında yeni tədris vəsaiti yaratmaq üçün böyük şövqlə mübarizə aparırdılar. Təlimin ana dilində olması, xalqın qabaqcıl maarif xadimlərini ciddi düşündürən problematik məsələ idi. Ruhani məktəblərinin köhnə təlim üsulu, fars və ərəb dillərində keçirilən dərslərdəki cansıxıcı vəziyyət, mexaniki əzbərləmə, onsuz da çətin olan təhsil prosesini bir az da ağırlaşdırırdı. Maarif və mədəniyyətimizin, ümumilikdə ictimai-pedaqoji fikrimizin qarşısında həlli həyati zərurət olan bu mühüm cəhətə azərbaycanlı maarifpərvərlər dərin sosial-siyasi məna verirdi. Bunun da ilkin nəticəsi Azərbaycanda xalq maarifi və pedaqoji fikrinin inkişafı tarixində mühüm yer tutan məhz, pedaqoji-metodik məzmuna malik ana dilli dərsliklərin tərtib olunması oldu.

Məlum olduğu kimi, böyük rus maarifpərvəri K.D.Uşinskinin pedaqoji sisteminin əsasında xəlqilik və bundan nəşət edən ibtidai məktəbdə təlimin ana dilində

tədrisi dururdu. Dövrünün məşhur maarifpərvəri R.Əfəndiyev də K.D.Uşinskinin ardınca gedərək, ibtidai məktəbdə təlimin ana dilində aparılması ideyasını irəli sürmüş və bunu həm nəzəri, həm də əməli cəhətdən əsaslandırmışdır. R.Əfəndiyev K.D.Uşinskinin pedaqoji fikirlərindən istifadə edərkən, hətta ana dilinin tədrisi üsulunu da müəyyən etmişdir. O, bu məsələyə münasibət bildirərək yazırdı: "Pedaqojini öyrəndikdən sonra, mən anladım ki, köhnə məktəb dağıdılmışdır. Bu isə yalnız K.D.Uşinskinin yeni üsulla olan dərs kitabı kimi, öz məktəbimiz üçün ana dilində dərs kitabı tərtib etməklə mümkündür. Məhz bu məqsədlə də "Uşaq bağçası" kitabını qiymətli bir zərrə bənzətmək üçün pedaqoq Uşinskinin məşhur və məhbub "Əlifba" kitabçasını özümə rəhbər qəbul etdim" (6).

Beləliklə, XIX əsrin sonu, XX əsrin əvvəllərində Azərbaycan pedaqoji fikrini məşğul edən demokratik təhsil ideyaları cəmiyyət həyatında mühüm rol oynayan əsas milli və ümumbəşəri prinsipləri, o cümlədən xalq arasında savad təlimi uğrunda mübarizə məsələlərini, xəlqiliyi, humanizmi, ümumbəşəriliyi, demokratizmi, azadfikirliyi yüksəldən amilə çevrilib, sosial-ictimai tərəqqi üçün də yeni-yeni yollar açırdı.

Məqalənin elmi yeniliyini şərtləndirən müasir yanaşma prinsiplərindən biri kimi, insan şəxsiyyətinin formalaşması istiqamətində bu ideyaların təşəkkül tarixini bilməklə, yeni qazanılmış nəzəri-metodoloji prosesləri daha zəngin yönəlişliklərlə təmin etmək olar.

Problemin həm nəzəri, həm də praktik baxımdan dəyərliliyini bu gün daha çox əsaslandırmağa ehtiyac duyulur. "Yaxşı insan" formalaşdırmağın ilkin mənbələrini, onun məzmununu və metodologiyasını (texnologiyasını) yeni pedaqoji təfəkkür imkanları ilə öyrənib, ondan müasir pedaqoji proses təcrübəsində gənc nəslin milli və ümumbəşəri keyfiyyətlərə sahib çıxmasının elmi-metodik sistemini də hazırlamaq mümkündür.

Bu gün Azərbaycan Respublikasının işğal olunmuş ərazilərindən yağı düşmənin qovulması istiqamətində aparılan ümumxalq və ümumdövlət səviyyəli kompleks tədbirlər işığında milli ruhlu, demokratik düşüncəli fikir bahadırlarımızın zəngin təhsilləndirici, tərbiyələndirici və inkişafedici didaktik prinsiplərindən də faydalanmaq imkanları böyük, dərin məndəricə ilə milli şüura, yaddaşa çıraq tutmalıdır. Bunu isə bizdən həyatın özü tələb edir.

Məqaləni Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin sözləri ilə bitirmək istəyirəm. O demişdir: "...Biz öz milli, mədəni irsimizi qorumalıyıq. Bunun üçün təbliğat işləri daha da güclü olmalıdır. Bizim imkanlarımız daha da geniş olmalıdır. Baxın, indi demək olar ki, bütün dünyada Azərbaycan diaspor təşkilatları fəaliyyət göstərir, 50-dən yuxarı ölkədə Azərbaycan səfirlikləri fəaliyyətə başlamışdır və uğurla fəaliyyət göstərirlər. Yəni, indi bizim, təbliğat imkanlarımız genişdir. Biz heç vaxt, tarix boyu başqa xalqın milli dəyərinə, yaxud da ki, milli irsinə göz dikməmişik. Ancaq əfsuslar olsun ki, bizə qarşı həmişə belə cəhdlər olub… Yenə də deyirəm, bunun əsas səbəbi Azərbaycan xalqının istedadı və mədəniyyətimizin zəngin olmasıdır. Ancaq biz əlbəttə ki, mədəni irsimizi qoruyacağıq, bütövlükdə müstəqilliyimizi qoruyacağıq, müstəqil seçimimizi qoruyacağıq".

***Rəyçi: prof. Ə.Ağayev***

## İstifadə edilmiş ədəbiyyat

1. Azərbaycan tarixi. III cilddə, 2-ci cild. Bakı: Akademnəşr, 1964.
2. Dağıstani Cey. İsmayıl bəy Qasprinski. Bakı, "Kaspi" qəzeti, 1914, № 204.
3. Nərimanov N. Seçilmiş əsərləri. Bakı: Elm, 1973.
4. Nemanzadə Ö.F. Xatirələrim. Azərbaycan Respublikası Mərkəzi Dövlət Tarix Arxivi, fond 16.
5. Nemanzadə Ö.F. Xatirələrim. Bakı: Gənclik, 1985.
6. Rəşid bəy Əfəndiyevin arxivi. AMEA-nın Əlyazmalar İnstitutu. Fond 2, iş №8.
7. "Şərqi-Rus" qəzeti, 1904, 29 iyun.
8. Ömər Faiq Nemanzadənin tərcümeyi-halından. Bakı: AMEA-nın Əlyazmalar İnstitutu. DM-600, 601; inv.8071, səh.32.

**В.Баширов**

**Идеи национального демократического образования в азербайджанской педагогической науке**

**Резюме**

Статья посвящена выявлению возможностей распространения идей демократического образования, занимающей педагогическую мысль Азербайджана в конце XIX века, в начале XX века. Отмечается что, в указанный исторический период, первые педагогические общества и просветительские организации, стараниями передовых педагогов и просвещенной интеллигенции, а также других деятелей искусства. Были созданы первые национальные учебники, претворена в жизнь деятельность по усовершенствованию содержания образования. Также в статье обстоятельным образом излагается что, просветители Азербайджана посредством просветительской педагогической идеи, указали пути национальной независимости.

**V.Bashirov**

**National democratic educational ideas in Azerbaijani pedagogical thoughts**

**Summary**

The article was dedicated to detection of opportunities of spreading of democratic educational ideas that had a main part in Azerbaijani pedagogical thought at the end of XIX century and at the beginning of XX century. The article shows that leading teachers, educators and other intellectual persons of the first pedagogical societies and educational organizations which existed in that period wrote first national manuals, gave contribution to development of education. The article explains that Azerbaijani educators struggled to get national independence tendency through educational pedagogical ideas.



# TƏNQİDİ TƏFƏKKÜRÜ İNKİŞAF ETDİRƏN METOD VƏ ÜSULLARDAN İSTİFADƏ

**Səlahət Əsədova,**
***Bakı şəhəri, Nərimanov rayonu MLK-nın müəllimi,***
***“Ən yaxşı müəllim” müsabiqəsinin qalibi***

***Açar sözlər:*** *tənqidi təfəkkür, metod və üsullar, müşahidə və nəticə, müqayisə və qarşılaşdırma, müzakirə və analiz, əməkdaşlıq, arqumentlərin analizi, sonluğu olmayan mətnlər, Sokrat metodu, təsnifat və qruplaşdırma, əlaqələndirmə, Blum taksonomiyası.*

***Ключевые слова:*** *критическое мышление, методы и способы, наблюдение и результат, сравнение и сопоставление, обсуждение и анализ, сотрудничество, анализ аргументов, незаконченные тексты, метод Сократа, классификация и группирование, связывание, таксономия Блума.*

***Key words:*** *critical thinking, method and techniques, observation and conclusion, making comparison and contrasting, discussion and analyzes, cooperation, argument analyses, no ending texts, Socratic method, classification and grouping, making connections, Blum’s Taxonomy.*

Müasir dövrdə təhsilimizin qarşımıza qoyduğu məqsəd XXI əsrin tələblərinə cavab verən, İKT bacarıqlarına yiyələnən, mənəvi dəyərləri özündə birləşdirən, aldığı informasiyalara tənqidi yanaşmağı və həyatda tətbiq etməyi bacaran şəxsiyyətlər yetişdirməkdir.

Bu gün ümumtəhsil məktəblərində təhsilə yanaşma sürətlə dəyişir. Dəyişən dünyamızdan uğurla baş çıxarmaq üçün saysız-hesabsız informasiyanı analiz etmək və nəyin daha vacib olduğunu müəyyən etmək bacarığı tələb olunur. Şagirdlər müxtəlif informasiyaların bir-birinə necə uyğun gəldiyini, yaxud uyğun gələ biləcəyini ayırd etməyi bacarmalıdırlar. Onlar yeni ideya və bilikləri mənalandırmağa ehtiyac hiss edərək, müxtəlif təsadüfləri dərk etməli, lazımsız və uyğun gəlməyən informasiyalardan imtina etməyi bacarmalıdırlar. Onlar informasiya bolluğundan tənqidi, yaradıcı və məhsuldar şəkildə istifadə etməyi bacarmalıdırlar. Bunun üçün də informasiyanı idarə edərək, onu dolğun ideyalar şəklində çeşidləməyə imkan verən praktiki fikri vərdişlərə yiyələnməlidirlər. Bir sözlə, onlar tənqidi surətdə düşünməli, tənqidi surətdə öyrənməlidirlər.

Tənqidi təhlil prosesi sistematik olmalıdır: elə bir proses ki, onları təkcə məktəb dövründə deyil, sonralar da onların müstəqil tənqidi fikir və münasibətlərini istiqamətləndirməlidir. Bunun baş verməsi üçün təfəkkürü inkişaf etdirən tədris anlaşıqlı və sistematik şəkildə həyata keçirilməlidir ki, şagirdlər prosesi ardıcıl başa düşsünlər və tətbiq edə bilsinlər.

Amerika Kollec və Universitetlər Assosiasiyasının pedaqoqları Arend, Halx və Roybold və digərləri belə hesab edirlər ki şagirdlərin beyinlərini tənqidi təfəkkürlə qurmaq lazımdır. Bunun üçün də tənqidi təfəkkürü inkişaf etdirən müəllimlərin rolu onların müəllim kimi rollarından fərqli olmalıdır. Müəllimlər şagirdlərə yardımçı olmalıdırlar ki, onlara müzakirə, sərbəst düşünmək üçün şərait yaratsınlar. Baxmayaraq ki, müzakirə və sonluq həmişə düzgün cavabla nəticələnmir, əvəzində mövzu ilə bağlı daha çox suallar və qiymətləndirmələr ortaya çıxır.

Odur ki, dərslərimizdə daha çox

təfəkkürü inkişaf etdirən metod və üsullardan istifadə etməliyik. Düşünürəm ki,araşdırmaların nəticəsi olaraq tənqidi təfəkkürü inkişaf etdirən ən effektiv metod və üsullar həmkarlarım üçün də faydalı olar:

**Müşahidə və nəticələr**



Şagirdlər hər hansı bir obyekti və ya informasiyanı detallarına qədər müşahidə edərlərsə, onlar mühakimə yürütmək üçün nəticəyə gələ bilərlər. Əgər şagird nə üçün sualını verirsə, onda ona "Sən nə üçün belə düşünürsən" sualını verməklə onu mühakimə yürütməyə sövq etmək olar. Bu isə onlara lazım olan müşahidə bacarıqlarının başlanğıcıdır.

**Müqayisə və qarşılaşdırma**

Bu metod şagirdlərə fərqli və oxşar cəhətləri müqayisə eyməyə, analiz etməyə və informasiyanı kateqoriyalara bölməyə və sistemləşdirməyə imkan verir.




**Müzakirə və analiz**

Müəllim səsləndirdiyi və ya özü oxuduğu hekayəni şagirdlərə öz sözləri ilə danışdırır. Bu zaman onlar hekayənin mühüm hadisələrini yadda saxlamağa çalışırlar. Şagirdlərə hekayədə birbaşa cavabı olmayan suallar vermək lazımdır. Bu onların hekayə barədə öz nəticələrini təqdim etməyə xidmət edir. Belə bir sual da faydalı ola bilər. "Bunu yazmaqla müəllif, səncə, nə düşünürdü? Şagirdlərdən həm də hekayənin xarakterlərini analiz etməyi tələb etmək lazımdır. Bu onları yaxşı və pisi müqayisə etməyə, qarşılaşdırmağa sövq edər. Həm də hekayəni öz həyatları ilə də müqayisə etmək, oxşar və fərqli cəhətləri araşdırmaq, nəticəyə gəlmək onlar üçün bu cəhətdən faydalı olar.



**Əməkdaşlıq ( Cütlərlə iş )**

Birgə əməkdaşlıq şagirdlərin təfəkkür fəaliyyətinin inkişafında mühüm rol oynayır. Belə ki, onlar hər hansı məsələ ilə bağlı bir-birləri ilə fikir bölüşür, bir-birlərindən öyrənirlər. Şagirdlər birgə bir hekayəni oxuyur və qiymətləndirməni paylaşırlar. Bu onları digər şagirdlərlə debat aparmaq bacarıqlarına yiyələndirir və onlara öz mövqelərini müdafiə etmək üçün imkan yaradır.

**Sonluğu olmayan mətnlər**

Sonluğu olmayan mətnləri tamamlamaqla şagirdlər mətndəki informasiyanı yaradıcı şəkildə tamamlayırlar. Bu onların, təkcə tənqidi təfəkkürünü deyil, həm də yaradıcı təfəkkürünü də inkişaf etdirir. Bunun üçün də belə bir sualla müraciət etmək olar. "Səncə, sonra nə baş verdi?".

**Arqumentlərin analizi**

Burada müzakirə üçün problem təqdim edilir. Şagirdlərdən tələb olunur ki, problemi həll etmək üçün fərqli yollar təqdim etsinlər, araşdırsınlar, kont-arqumentlər təqdim etsinlər, informasiyanın nə dərəcədə inandırıcı olub olmadığını mühakimə etmək üçün müzakirə aparsınlar.

**Sokrat metodu**

Bu metod tənqidi təfəkkürü inkişaf

etdirən suallara əsaslanır. Bu suallar təfəkkürü çalışdırmaq üçün aşağıdakı nümunələrə əsaslanan sistemli suallardır:

1. Səbəb/nəticə əlaqəsini formalaşdıran suallar

- Nə baş vermişdi?
- Buna səbəb nə idi?
- Bu nəticənin alınmasında ən əhəmiyyətli faktor nə idi?
- Bu faktlarla nəticənin bir biriləri ilə əlaqəsi necədir?

-Bu səbəblərdən həmişəmi belə nəticələr alınır? yox, nə üçün ?

-Əgər səbəblər fərqli olsa idi nəticə necə dəyişərdi?

-Müəllifin təsvir etdiyi səbəb-nəticə əlaqəsi necədir?

2. Müqayisə və qarşılaşdırmanı formalaşdıran suallar

-Burada hansı elementlər/fikirlər müqayisə edilir, qarşılaşdırılır?

-Burada oxşarlıq və eyniliklər hansılardır?

-Fərqliliklər nədən ibarətdir?

-Onları fərqli edən keyfiyyətlər hansılardır?

-Nə üçün müəllif bunları müqayisə edir, qarşılaşdırır?

-Bu müqayisə və qarşılaşdırma nədən ortaya çıxır?

3. İdeya aydınlaşdırma üçün suallar

-Əsas ideya nədən ibarətdir?

-Bu hansı kateqoriyaya aiddir?

-Onun rəsmi xarakteristikası nədən ibarətdir?

-O necə işləyir?

-Onun funksiyaları hansılardır?

-Daha nələri nümunə göstərmək olar?

-Buna oxşar daha hansı keyfiyyətləri, xüsusiyyətləri göstərmək olar?

4. Açıqlama üçün suallar

-Bununla nə demək istəyirsən?

-Əsas məqsədin nədir?

-Onun bununla nə əlaqəsi var?

-Bunu başqa cür eləmək olardımı?

-Onun dediklərini öz sözlərinlə izah edə bilərsənmi?

-Misal göstərə bilərsənmi?

-Sonrası səncə necə olar?

5. İlkin sual və ya məsələ ilə bağlı suallar

-Bunu necə müəyyən elədin?

-Bu sualı başqa cür qoymaq olarmı?

-Bu sualdan başqa sual yarana bilərmi?

6. Fərziyyə yaradan suallar

-Nəyə güman edirsən?

-Mən sənin fərziyyəni düzmü başa düşürəm?

-Bu deyilənlərə haqq qazandıra bilərsənmi?

-Həmişəmi belə olur?

-Səncə başqa nə cür ola bilərdi?

7. Sübut və səbəblər üçün suallar

-Səbəbləri izah edə bilərsənmi?

-Buna adekvat səbəb göstərə bilərsənmi?

-Başqa bir dəliliniz varmı?

-Bunun doğru olduğunu necə müəyyən edə bilərsiniz?

8. Nəticələri sübut edən suallar

-Bununla nəyə eyham olunur?

-Bunun necə təsiri olardı?

-Bunun başqa bir alternativi varmı?

-Belə halda nə doğru olardı?

9. Yeni ideya və perspektivlər haqda suallar

-Buna başqaları necə cavab verərdi, niyə?

-Sənin buna etirazın necə olardı?

-Kimsə bunu başqa cür edə bilərdimi, necə?

-Bununla razılaşmayan nə deyərdi?

10. Məqsəd/fəaliyyət/yekuna istiqamətləndirən suallar

-Buraya hansı insanlar cəlb edilmişdir?

-Onlar nəyə nail olmaq istəyirlər, məqsədləri nədir?

-Məqsədlərinə çatmağa onlara nə kömək edir?

-Onların fəaliyyətlərinin nəticəsi nə oldu?

-Onların gəldikləri nəticə gözlənilməz olmadı ki?

-Başqa nə etsəydilər daha effektli olardı?

-Onlar daha nə edə bilərdilər?

11. Problemi həll üçün suallar

-Burada problem nədən ibarətdir ?

-Kimin problemi var idi ?

-Problemə nə səbəb olmuşdur?

-Problemin nəticəsi nədir?

-Problemin həlli yolları hansılardır ?

-Problem necə həll olundu ?

-Bu nəticədən başqa bir problem yarana bilərmi?

12. Məlumat/təklifə dair suallar

-Təsvir olunan mövzu nədən ibarətdir?

-Hansı faktlar mövcuddur?

-Hansı statistika bu məlumatı təsdiq edir?

-Bu məlumatı/faktı təsdiq edən hansı misal çəkmək olar?

-Bu məlumatın məntiqi əsası varmı?

13. Ardıcıllıq/uzlaşma üçün suallar

-Təsvir edilən hadisədə ardıcıllıq/uzlaşma varmı?

-Xronoloji ardıcıllıq necə yaranar?

-Bu ardıcıllıqda əsas hadisələr hansılardır?

-Ardıcıllıq/ uzlaşma nə üçün lazımdır?

**Beyin həmləsi**

Beyin həmləsi tənqidi təfəkkürü inkişaf etdirməyin ən asan və effektiv üsullarından biridir. Hər hansı mövzunun əvvəlində çoxlu suallar vermək lazımdır. Məsələn, ”Sizcə bu kitab/mətn və ya mövzumuz nə haqda olacaq?”

**Təsnifat və qruplaşdırma**

Təsnifat və qruplaşdırma tənqidi təfəkkürün inkişafında əhəmiyyətli rol oynayır. Çünki bu şagirdlərdən bir sıra qaydaları bilmək və tətbiq etməyi tələb edir. Şagirdlərə fərqli əşyalar təqdim edin və onları müəyyənləşdirib kateqoriyalara bölsünlər.

**Əlaqələndirmə**

Şagirdlərin keçdikləri hər hansı bir situasiyanı öz həyatları ilə əlaqələndirməsi onların təfəkkürlərinin inkişafına xüsusi təsir edir.




**Blum taksonomiyası**

Hər kəsin yaxşı tanıdığı Blum taksonomiyası tənqidi təfəkkürün inkişafında istifadə olunan klassik və effektiv üsullardan biridir. Blum şagirdlərdə təfəkkürü inkişaf etdirmək məqsədilə dərketmənin altı səviyyəsini təyin etmişdir. Altı əsas səviyyəyə əsaslanan bacarıqlar üçbucaq təşkil edir. Bu bacarıqlar daxildə bir-birləri ilə inteqrasiya edilmiş olduğuna görə biz ona dairə şəklində baxa bilərik. Bəs bu bacarıqlar nəyi ifadə edir?

- Yadda saxlama-şagirdlər oxuduqları və ya eşitdikləri informasiyanı yadda saxlaya bilərlərmi?
- Anlama-Şagirdlər eşitdikləri və ya oxuduqları məlumat və anlayışları izah edə bilirlərmi?
- Tətbiq etmə-Şagirdlər bu informasiyanı fərqli bir kontekstdə və ya başqa bir vəziyyətdə tətbiq edə bilərlərmi?
- Analiz-Şagirdlər bu informasiyanı analiz edə bilərlərmi?
- Qiymətləndirmə-Şagirdlər alınmış nəticəni qiymətləndirə bilərlərmi?

• Şagirdlər alınmış nəticədən yeni bir şey yaratmaq üçün istifadə edə bilərlərmi?

“İnkişaf etmiş və inkişaf etməkdə olan ölkələrdə piylənmə problemi” mövzusunda Blum taksonomiyasına əsaslanan bir çalışma ilə şagirdlərimizə müraciət edək:

– Mətndə adları çəkilən ölkələri inkişaf etmiş və inkişaf etməkdə olan ölkələr qrupuna ayırd edin,

– Müxtəlif ölkələrdə şişman insanların faizini göstərən cədvəli doldurun,

- Müxtəlif ölkələrdə şişman insanların faizini göstərən bir qrafik qurun,

- Şişmanlığın qarşısını almağın həlli yollarını müəyyən edin,

– İnkişaf etmiş ölkələrdə piylənməni azaltmaq üçün tədbirlər tövsiyə edin,

– Məktəblilər üçün daha sağlam qidalanmaq üçün məlumat vərəqləri

– Düzgün qidalanmaq haqda şeir bəstələyin.

Göründüyü kimi, bu çalışma şagirdlərin təfəkkürünü inkişaf etdirməyə yönəlmişdir ki, bu da onlarda təfəkkür bacarıqları yaradır. Təfəkkür bacarıqları isə, informasiyanı müşahidə edib analiz etməyə, nəticə çıxartmağa və problemi həll etməyə imkan verir, şagirdlərin düşünmə qabiliyyətlərini və intellektual səviyyələrini yüksəltməyə, bilik, bacarıq və vərdişlərinin daha məzmunlu və ətraflı formalaşmasına, bir sözlə, şagirdlərin şəxsiyyət kimi formalaşmasına xidmət edir. Elə şəxsiyyət ki, məntiqi düşünməyi, fikir irəli sürməyi, başqalarının fikrinə münasibət bildirməyi, gördüyü işlərin nəticəsini qiymətləndirməyi, qarşılaşdığı problemlərin optimal həllini tapmağı bacarır, problemlərin həllində birgə fəaliyyət göstərməyi, kollektiv iş prosesində özünün və başqalarının fəaliyyətini qiymətləndirməyi bacarır ki, bu da bugünkü təhsilimizin qarşıya qoyduğu ən mühüm məqsəddir.

***Rəyçi: prof. R.Əliyev***

## İstifadə edilmiş ədəbiyyat

1. “Critical Thinking & Problem Solving”. http://falcon.jmu.edu/~ramseyil/critical.htm
2. The National Center for Teaching Thinking – “All Students Can Be Good Thinkers”. http://www.nctt.net/
3. “Strategic Reading in the Content Areas.Practical Applications for Creating Thinking Environment”. Rachel Billmeyer. Omaha: Nebraska, 2004.
4. “The Thinking Classroom” – A Journal of Reading, Writing and Critical Reflection. http://ct-net.net/ct_tcp.
5. “Teaching Critical Thinking” – The Dartmouth Writing Program http://www.dartmouth.edu/~writing/materials/faculty/pedagogies/thinking.shtml
6. “An Introduction to Critical Thinking” Steven D. Schafersman http://www.freeinquiry.com/critical-thinking.html.

**С.Асадова**

**Методоы и техники обучения критическому мышлению**

**Резюме**

В статье рассматриваются важность обучения критическому мышлению и эффективные в этом вопросе методы. А также, приведены реальные примеры их осуществления.

**S.Asadova**

**Methods and techniques for teaching critical thinking**

**Summary**

In the article it is spoken about the importance of teaching critical thinking, helpful methods and techniques for teaching critical thinking. At the same time some examples are given related to the topic.



# KEYFİYYƏTİN İDARƏEDİLMƏSİNİN QİYMƏTLƏNDİRİLMƏSİ MEXANİZMLƏRİ

**Afət Süleymanova,**
***AR Təhsil Nazirliyinin aparıcı məsləhətçisi, pedaqogika üzrə fəlsəfə doktoru***

*Məqalədə təhsilin keyfiyyətinin idarəedilməsinin təşkili baxımından müxtəlif tədqiqatçıların təqdim etdiyi prinsip və sistemlərin şərhi də öz əksini tapmışdır. Azərbaycan təhsil sisteminin reallıqlarına uyğun sistemlər müəyyənləşdirilmişdir. Bundan sonra, həmin əsasda ümumtəhsilin keyfiyyətinin idarə edilməsinin sistemi işlənib hazırlanmışdır. Bu sistem üzrə də Təhsil Nazirliyi tabeliyində olan 6 nömrəli məktəb-liseydə ümumtəhsilin keyfiyyətinin idaəredilməsinin təşkili məqsədi ilə bir ay ərzində tədqiqat aparılmışdır. Mövcud vəziyyət öyrənilmiş, uğurlar və problemlər aşkar edilmişdir. Bütün səviyyələrdə məktəbin illik planlarında problemlərin həllinə istiqamətlənən dəyişikliklər tövsiyə edilmişdir. Müəyyən məqamlarda məktəb rəhbərliyi ilə əməkdaşlıq şəraitində yenidən planlaşmalar aparılmışdır.*

***Açar sözlər:*** *təhsil, keyfiyyət, idarəetmə, mövcud vəziyyət, planlaşdırma, nəticə, qiymətləndirmə.*

***Ключевые слова:*** *образование, качество, управление, текущая ситуация, планирование, оценка результатов.*

***Key words:*** *education, quality, management, current situation, planning, results evaluation.*

XXI əsrdə təhsilin keyfiyyətinin yüksəldilməsi ictimai-iqtisadi inkişafın əsas şərtidir. Təhsilin keyfiyyəti onun yetişdirdiyi şəxsiyyətin keyfiyyətləri ilə ölçülür. Pedaqoqlar göstərir ki, təhsilin keyfiyyətini məqsəd və nəticəni müqayisə etməklə müəyyən etmək olar (4). Həmçinin tədqiqatlar göstərir ki, təhsil keyfiyyəti anlayışı təhsil prosesi və onun nəticəsi kimi qəbul edilib cəmiyyətdə intellektual, ictimai, iqtisadi, mədəni aspektləri ehtiva edir.

"Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı"nında ümumtəhsil müəssisələrinin idarəedilməsinə yeni yanaşmanın qurulması önə çəkilir. Heç şübhəsiz, ümumtəhsil məktəblərində keyfiyyətin idarəedilməsi sahəsində boşluqlar olarsa, bu ümumilikdə təhsilin keyfiyyətinin yüksəldilməsinə öz təsirini göstərir.

Ümumtəhsil məktəblərində mövcud idarəçilik mexanizmlərinin üstünlük və boşluqlarını müəyyən etmək, işin keyfiyyətinin yüksəldilməsinə xidmət edən təkliflər hazırlamaq məqsədi ilə məktəbdə mövcud vəziyyət təhlil edilmiş, üstünlüklər və boşluqlar müəyyən edilmişdir;

Mövcud vəziyyət araşdırılarkən məktəbin şəraiti (yeri, heyəti, sosial vəziyyəti) bir daha nəzərdən keçirilmiş, mühit (mənəvi-psixoloji) araşdırılmış, maddi-tex-

niki bazası öyrənilmiş, təhsilin vəziyyəti tədqiq edilmiş, inkişafın dinamikası müəyyənləşdirilmişdir.

Qəbul edilən qərarları həyata keçirmək üçün işçi heyətinin fəaliyyət planları təkmilləşdirilərkən məktəbin Nizmnaməsi, Fəaliyyət planları təhlil edilmiş, üstünlük və boşluqlar aşkar edilmiş, Təhsilin inkişafı üzrə Dövlət Strategiyası sənədində müəyyən edilmiş istiqamətlər üzrə milli səviyyədə nəzərdə tutulan ümumi məsələlərin məktəb səviyyəsində həyata keçirilməsi üçün məktəb-liseyin fəaliyyət istiqamətləri ilə bağlı tövsiyələr hazırlanmışdır. Həmçinin nəzərdə tutulan vəzifələrin icrasına uğurla nail ola bilmək üçün maraqlı tərəflərin (şagirdlər, müəllimlər, valideynlər, ictimai təşkilatların) dəstəyinin təşkil edilməsi üçün xüsusi tədbirlər planının işlənməsi təklif edilmiş, müvafiq tövsiyələr verilmişdir.

Nəticələrin təhlili göstərir ki, ümumtəhsil müəssisələrinin rəhbərləri əhəmiyyətli məsələlərlə bağlı qərarlar qəbul edərkən bir çox hallarda çətinliklərlə qarşılaşırlar. Bəzən də yanlış qərarlar qəbul edilir ki, bu da məktəbdə istər təhsilin keyfiyyəti, istərsə də müəllim-şagird-valideyn münasibətlərində böhran vəziyyətinin yaranması ilə nəticələnir. Belə vəziyyətin yaranmasının səbəbi isə, bir çox hallarda, məktəb rəhbərlərinin öz fəaliyyətlərində elmi-nəzəri əsaslara söykənən, sistemli idarəetmə mexanizmlərindən çıxış etməməsidir. Məktəbdə mövcud vəziyyəti öyrənmədən, təhlil etmədən qərarlar qəbul etmək olmaz. Beynəlxalq təcrübə də onu göstərir ki, məktəb rəhbəri hər hansı qərar qəbul edərkən məktəbdə mövcud vəziyyəti dərindən öyrənməli, fakt və məlumatları təhlil etməli və elmi-praktik baxımdan əsalandırılmış qərarlar qəbul etməlidir.

Təhsil Nazirliyi tabeliyində olan 6 nömrəli məktəb-lisey Bakı şəhərinin mərkəzində yerləşir, bu da həm müəllim, həm də şagird heyətinin intellektual və sosial səviyyəsinə öz təsirini göstərir. Şagirdlər lisey siniflərə seçim əsasında qəbul edildiyindən təhsilin keyfiyyətinin yüksək olmasını təmin etməyə geniş imkan yaranır. Şagird, müəllim və xidmət heyətinin sayı, tərkibi və müəllim-şagird nisbəti araşdırılır. Məlum olmuşdur ki, bu məktəbdə müəllim-şagird nisbəti 15/1-dir. Bu göstərici məktəbdə müəyyən qədər şagird sıxlığının olduğundan xəbər verir. Məktəb birnövbəlidir. Kitabxana, psixoloji və tibbi xidmət baxımından isə müvafiq heyətlə - şagird nisbətinin 1060/1-dir ki, bu da həmin xidmətlərdə boşluqların qaçılmaz olduğundan xəbər verir.

Bir fakt da sevindiricidir ki, valideynlərin böyük əksəriyyəti ali təhsillidir. Deməк, şagirdlər ev tapşırıqlarını yerinə yetirərkən çətinliklərlə qarşılaşdıqda valideyn dəstəyi ala bilirlər. Şagirdlər əsasən orta və yüksək təminatlı ailələrdən gəlirlər ki, bu da onların qidalanma, geyim, evdə dərs şəraiti, dərs ləvazimatları və mövsüm geyimləri ilə təmin olunma, boş vaxtının səmərəli keçirilməsi baxımından şagirdin xüsusi çətinliklərinin olmamasından xəbər verir.

Məktəbdə mühit, mənəvi-psixoloji vəziyyət öyrənilərkən: a) aparılan islahatlarla bağlı məktəb rəhbərliyinin məlumatlılıq səviyyəsi və münasibəti; b)məktəb rəhbərliyinin məktəbin idarə edilməsində əldə rəhbər tutduğu prinsiplər; c) pedaqoji heyətin təhsil fəlsəfəsi; d) təhsillə bağlı müxtəlif məsələlərə yanaşmaların təhsilin qanunverici sənədlərində əldə rəhbər tutulan yanaşmalarla uyğunluğu; e) məktəbdə kollektiv üzvlərinin qarşılıqlı münasibətlərinin və əməkdaşlığının səviyyəsi də nəzərdən qaçırılmamalıdır.

Aparılan islahatlarla bağlı məktəb rəhbərliyinin məlumatlılıq səviyyəsi və münasibəti araşdırılarkən aşkar edilmişdir

ki, məktəb rəhbərliyi yenilik və inkişaf axtarışındadır:

Məktəb direktoru Təhsil Nazirliyinin ümumtəhsil müəssisələrinin direktorları üçün təşkil etdiyi kurslarda iştirak etmişdir. Müəssisədə peşəkarlığı yüksək olan kadrların inkişaf perspektivləri üzərində düşünülür. Direktorun bir müavini direktor kurslarında iştirak etmiş, başqa bir məktəbə direktor təyin olunmuşdur. Direktorun digər üç müavini də araşdırma aparıldığı zaman direktorların ixtisasartırması kurslarında iştirak edirdilər. Məktəbdə İB (Beynəlxalq Bakalavr) layihəsi həyata keçirilir, məktəbdə xarici ölkələrdən dəvət olunmuş müəllimlər fəaliyyət göstərir; Beynəlxalq Təhsil layihəsi çərçivəsində məktəbin 72 müəllimi müvafiq kurslardan keçərək sertifikat almışdır.

Məktəb rəhbərliyinin məktəbin idarə edilməsində əldə rəhbər tutduğu prinsiplər aşağıda qeyd edilən məsələlər baxımından araşdırılmışdır:

- dərs yükünün bölünməsi;
- dərs cədvəlinin tərtib edilməsi;
- valideynlərlə işin təşkili;
- məktəbin kollektiv idarə edilməsi;
- ədalətin və şəffaflığın təmin olunması.

Dərs yükünün bölünməsi zamanı rəhbərlik əsasən varislik prinsipindən çıxış edir, eyni zamanda, müəllimin peşəkarlıq səviyyəsi əldə rəhbər tutulur. Belə ki, hər hansı bir sinifdə konkret fənn üzrə şagirdlərin nəticələri yüksələn xətt üzrə inkişaf edirsə, həmin sinifdə varislik gözlənilir. Müəllim aşağı sinifdən qəbul etdiyi sinifdə fənnin tədrisini son siniflərə qədər davam etdirir. Bunu nəticə üçün cavabdehliyin təmin olunması baxımından əhəmiyyətli hesab edirlər. Lakin hər hansı bir sinifdə, konkret fənn üzrə şagirdlərin nəticələri enən xətt üzrə hərəkət edirsə, həmin sinif peşəkarlıq baxımından daha hazırlıqlı müəllimə verilir, zəif nəticə verən müəllimin dərs saatı peşəkarlığını artırmaq üçün sərbəst vaxtla təmin etmək məqsədi ilə azaldılır. Deməli, belə müəllimlərin dərs saatlarının azaldılması iş vaxtının azaldılması kimi dəyərləndirilmir. Altı saat ərzində məktəbdə olan müəllim təcrübəli müəllimlərin dərslərində iştirak edir, məktəbdə vaxtaşırı təşkil edilən ixtisasartırma məşğələlərinə cəlb olunur. Həmçinin dərs saatının nisbətən azaldılması onların gündəlik dərslərə daha yaxşı hazırlaşmasına şərait yaradır.

Dərs cədvəlinin tərtib edilməsi zamanı əsas məqsəd cədvəlin şagirdyönümlü olmasını təmin etmək olsa da, müəllimlərin də ehtiyac və arzularının nəzərə alınması öyrənildi. Gündəlik cədvəldə daha çox idraki fəaliyyət tələb edən fənlərin (riyaziyyat, ana dili, fizika, kimya, həyat bilgisi və s.) daha çox emosional fəaliyyət tələb edən ( təsviri incəsənət, musiqi, ədəbiyyat) yaxud fiziki fəaliyyət tələb edən fənlərlə (fiziki tərbiyə, texnologiya, gənclərin çağırışaqədərki hazırlığı) növbələşməsinə kifayət qədər diqqət yetirilməmişdir.

Psixoloq və gigiyenistlərin də göstərdiyi kimi şagirdlərin ən səmərəli öyrənmə günləri həftənin II, III, IV günləridir. Bu günlərdə sinfin ən aşağı nəticələr verdiyi fənləri müəyyən etməyə diqqət yetirilməlidir. İstirahətdən yeni gəlmiş (I gün) və ya istirahət həvəsində olan (V gün) sinfin ən çox maraq göstərdiyi dərsləri müəyyən etmək (imkan daxilində) şagirdlərin fiziki-psixi vəziyyəti baxımından əhəmiyyətlidir. Gələcəkdə dərs cədvəllərinin elmi-nəzəri və metodik baxımdan düşünülmüş tərtibi ilə bağlı diqqəti artırmaq da tövsiyə edilmişdir.

Valideynlərlə işin təşkili üçün fəaliyyət planının işlənib hazırlandığı müşahidə edilmişdir. Fəaliyyət planı üzrə nəzərdə tutulan tədbirlər tərəfimizdən öyrənilmişdir. Həmçinin Valideyn komitəsinin sədri ilə

məktəbdə aparılan işlər barədə və valideyn–məktəb münasibətlərinə dair söhbət aparılmışdır.

Məktəb direktoru və müavinlərin fəaliyyətindən başlanğıcını götürən ailə-məktəb münasibətlərinin sinif rəhbərlərinin fəaliyyətində müəllim-valideyn münasibətləri kimi sistemli şəkildə davam etdirilməsi məktəbdə keyfiyyətin idarə edilməsinin tərkib hissələrindəndir. Bu baxımdan valideynlərlə işin təşkilinin ümumidən xüsusiyə doğru irəliləməsinə nəzarəti gücləndirmək tövsiyə edilmişdir.

Məktəbin kollektiv idarə edilməsinə nail olmaq üçün görülən tədbirlər tədqiq edilmişdir. Səlahiyyətlərin paylaşdırılması və hesabatlılığın təmin olunmasının məktəb idarəçiliyinin əsas iş prinsipi olduğu aşkar edilmişdir. Müasir idarəetmədə üstünlük verilən bu prinsipin işləkliyini təmin etmək milli səviyyədə reallaşdırılması nəzərdə tutulan ümumi vəzifələrin məktəb səviyyəsində (direktorun fəaliyyət planında öz əksini tapır) xüsusiləşdirilməsi, məktəb səviyyəsində nəzərdə tutulan vəzifələrin isə direktor müavinləri, metodbirləşmə sədrləri, sinif rəhbərləri səviyyəsində xüsusiləşdirilməsi mexanizmləri ilə bağlı tövsiyələr verilmişdir.

Bununla belə, müəllimlərin bir-biri ilə, həmçinin məktəbin həkimi, psixoloqu, kitabxanaçısı ilə birgəfəaliyyətinin təhsilin keyfiyyətinin yüksəldilməsi baxımından əhəmiyyəti barədə söhbət aparılmış və müvafiq təkliflər verilmişdir.

Ədalətin və şəffaflığın təmin olunması vəziyyəti öyrənilərkən müəyyən olundu ki, məktəbdə bütün həyatyüklü məsələlərlə bağlı qərarlar kollegial şəkildə qəbul edilir, həmçinin büdcə məsrəfləri müzakirələr əsasında planlaşdırılır və sənədləşdirilir.

Pedaqoji heyətin təhsil fəlsəfəsini öyrənmək məqsədi ilə müəllimlər arasında "Öz təhsil fəlsəfəni müəyyən et" test nümunəsi üzrə yoxlama aparılmışdır. Müəllimlərin "pedaqoji kimliyi" öyrənilərkən aşkar edilmişdir ki, yoxlamaya cəlb edilən 64 müəllimin 46 %-i müasir təhsil yanaşmalarının tərəfdarıdırlar. Qalanlar isə ya müasir və ənənəvi baxışların ayrıcındadır, ya da tam şəkildə ənənəvi baxışa malikdirlər.

Nəzərə alınsa ki, insan fəaliyyətinin əsasında onun əqidəsi və inancları durur, yoxlamaya cəlb edilən müəllimlərin yalnız 46 faizinin proqressivist yanaşmalara mənsub olması faktı bu istiqamətdə ciddi və düşünülmüş fəaliyyətlərin planlaşdırılmasını və həyata keçirilməsini aktuallaşdırır. Bununla əlaqədar da müvafiq tövsiyələr verilmişdir.

Təhsillə bağlı müxtəlif məsələlərə yanaşmalarının təhsilin qanunverici sənədlərində əldə rəhbər tutulan yanaşmalarla uyğunluğu öyrənilərkən məktəbin Nizamnaməsi, direktor və direktor müavinlərinin fəaliyyət planları və digər məktəbdaxili sənədlər "Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu", "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası", "Azərbaycan Respublikasında ümumtəhsilin Dövlət Standartları" kimi qanunverici sənədlərinin fəlsəfəsi və prinsipləri ilə qarşılıqlı təhlil edilmişdir. Bütün məsələlərlə bağlı həm layihələşdirmə, həm də reallaşdırma zamanı inkişafyönümlülüyün, şəxsiyyətyönümlülüyün, nəticəyönümlülüyün gözlənilməsi tövsiyə edilmiş, konkret sənədlərdə praktik nümunələr və təkliflər verilmişdir.

Kollektiv üzvlərinin qarşılıqlı münasibətləri, əməkdaşlıq səviyyəsi öyrənilmişdir. Məlum olmuşdur ki, ibtidai təhsil pilləsində müəllimlər daha çox təcrübə mübadiləsinə açıqdırlar. Ümumi orta və tam orta təhsil pillələrində isə müəllimlərin qar-

şılıqlı fəaliyyəti əlaqəli, sistemli xarakter daşımalıdır.

Aydındır ki, fənn metodbirləşmələrinin əlaqəli fəaliyyəti olmadan təlimin inteqrativliyinə, bilik və bacarıqların tamlığına nail olmaq mümkün deyil. Təlimin illik planlaşması aparılarkən fizika, kimya, biologiya, coğrafiya fənn metodbirləşmələrinin bir qrupda, ana dili, ədəbiyyat, tarix, xarici dil fənn metodbirləşmələri digər qrupda, musiqi, texnologiya,təsviri incəsənət fənn metodbirləşmələrinin üçüncü qrupda əlaqəli iş apararsa və həmin məsələlərin eyni zaman kəsiyinə müəyyən edilərsə, bu, təlimin təşkilində tamlığın təmin edilməsinə və səmərəliliyin yüksəldilməsinə ciddi təsir göstərər.

Məktəbin maddi-texniki bazası da möhkəmləndirilmişdir. Belə ki, məktəbin binasının vəziyyəti, dəhlizlərin təmir və tərtibatı, sinif otaqlarının təmir və tərtibatı, akt zalının təmir və tərtibatı, idman zalının təmir və tərtibatı, məktəb kitabxanasının vəziyyəti (təmiri və tərtibatı, təchizatı, oxucunun cəlbi vəziyyəti), məktəbin texniki təchizatının vəziyyəti (kompüter laboratoriyasının sayı, texniki avadanlığın sayı, işləkliyi, keyfiyyəti, saxlanma şəraiti, vaxtlı-vaxtında müvafiq xidmətlərin göstərilməsi, otaqdan səmərəli istifadənin vəziyyəti).

Dəhlizlər tərtib edilərkən şagirdlərin yaş qrupuna uyğun olaraq maraq və ehtiyacları nəzərə alınmışdır. Bununla belə şagirdlərin əl işləri sərgilənərkən divarların təmirinə yüngül xəsarətlər yetirilmişdir. Tərtibat işləri aparılarkən məktəbin infrastrukturuna zərər vurmamaq və daha təmkinli olmaq tövsiyə edilmişdir. Buna nail olmağın yolları müzakirə edilmişdir.

Sinif otaqları və akt zalında tərtibat işləri uğurla aparılmışdır. Bununla belə, idman zalına aid avadanlıqlardan (müxtəlif trinajorlardan) daha səmərəli istifadə yolları müzakirə edilmişdir. Məktəbdə ibtidai siniflərdə fiziki tərbiyə fənninin keçirilməsi üçün dəhlizlərdə mövcud boş məkanların müvafiq şəkildə tərtib edilməsi ilə bağlı müzakirələr aparılmışdır.

Məktəbin yüksək səviyyədə təmir, tərtib və təchiz edilmiş zəngin kitabxanası vardır. Burada kitabların sayı 50 000–dən çoxdur. Bununla belə həmin kitabxanaya oxucu cəlbi vəziyyəti qənaətbəxş deyildir.

Məktəb kitabxanasından səmərəli istifadənin yolları müzakirə edilmiş, mövcud qabaqcıl təcrübələrlə bağlı fikir mübadiləsi aparılmış, aşağıda qeyd edilən tövsiyələr verilmişdir:

1. Məktəb kitabxanası ilə işə dair fəaliyyətlərinin düzgün planlaşdırılması, nəzərdə tutulan fəaliyyətlərin vaxtında və layiqincə icrasını nəzarətə götürmək;
2. “Məktəb kitabxanası və təhsil keyfiyyəti” probleminin müzakirəsinə yönəlmiş pedaqoji şura keçirmək. Sinif rəhbərləri, fənn müəllimlərinin problemin həlli ilə bağlı vəzifələrinin müəyyən etmək;
3. Ayrı-ayrı fənlər üzrə kitabxanada açıq dərs aylığı keçirmək

Verilən təkliflərə rəhbərliyin operativ reaksiyası araşdırmalar getdiyi müddətdə həmin məsələlərin həlli istiqamətində görülmüş real işlərlə nəticələnirdi.

Məktəbin kompüter laboratoriyalarında mövcud vəziyyət öyrənilərkən bütün kompüterlərin texniki baxımdan işlək vəziyyətdə olduğu müşahidə edilmişdir. Bununla yanaşı kompüter laboratoriyalarında yalnız informatika dərslərinin deyil, həm də ayrı-ayrı fənn müəllimlərinin dərslərinin keçirilməsinə şəraitin yaradılması barədə müzakirələr aparılmış, tövsiyələr verilmişdir. Kompüter laboratoriyalarında informatika dərsləri olmadığı saatlarda, mövcud təchizatın səmərəli istifadəsi məqsədilə həmin məkanda fənn müəllimlərinin tədris işi aparmasına şərait yaradılması, bunun üçün aylıq cədvəllərin tərtib edilməsinə dair təkliflər verilmişdir. Bu ona görə

əhəmiyyətlidir ki, kompüter laboratoriyalarında fənn müəllimləri dərs apararkən kompüterlərdən yalnız özləri istifadə etmir, həm də ayrı-ayrı məsələlərlə əlaqədar müxtəlif məlumat bazalarında araşdırmaların aparılması, gəlinən nəticələr üzrə müxtəlif formalarda hesabatların hazırlanması baxımından şagirdlərin kompüterlərin fəal istifadəçisinə çevrilməsinə şərait yaradır. Bununla əlaqədar aşağıda qeyd edilən tədbirlərin həyata keçirilməsi ilə bağlı müzakirələr aparılmışdır:

• Məktəbdə fənn müəllimlərinin kompüter laboratoriyalarından səmərəli istifadəsi vəziyyəti müzakirə edilsin;

• İlkin olaraq İKT-dən istifadə ilə dərs aylıqları keçirilsin;

• Ayrı-ayrı fənlərin tədrisi zamanı kompüter laboratoriyasından boş saatlarda istifadəyə şərait yaratmaq məqsədilə cədvəl tərtib edilsin;

• İKT-dən fəal istifadəçi şagirdlər olmaqla ayrı-ayrı fənlər üzrə açıq dərs aylığı və ya həftəliyi keçirilsin;

• Müxtəlif fənlər üzrə "Ən yaxşı elektron resurs" müsabiqəsi keçirilsin;

• Qalib elektron resurslar məktəbin rəsmi saytında yerləşdirilsin.

Məktəbdə təhsilin vəziyyəti araşdırılarkən məlum olmuşdur ki, a) buraxılış imtahanlarında əldə edilən nəticələrin səviyyəsi müəyyən edilmişdir (IX, XI siniflərdə ana dili və riyyaziyyat fənləri üzrə buraxılış imtahanları nümunəsində): b) həmin nəticələrin oxşar şəraitli digər məktəblərin nəticələri ilə müqayisə edilmiş və müvafiq qərarları qəbul edilmişdir.

Müşahidələr göstərir ki, əksər hallarda məktəb direktorları təhsilin keyfiyyətinə dair səthi yanaşır, ilk baxışdan rəqəm təsəvvürü yaradan bu faktların altında gizlənmiş məlumatları tam şəkildə oxumaqda çətinlik çəkirlər.

Buraxılış imtahanlarına görə şagirdlərin əldə edilən nəticələrinin səviyyəsi müəyyən edilmiş, həmin nəticələr oxşar şəraitli digər məktəblərin nəticələri ilə müqayisə edilmişdir. Bunun üçün aşağıdakı istiqamətdə araşdırmalar aparılmışdır:

Məktəbin altı IX sinif şagirdlərinin ana dili və riyaziyyat fənləri üzrə buraxılış imtahanlarının nəticələri qarşılıqlı müqayisə edilmişdir. Siniflərdə şagirdlərin sayının müxtəlif olduğuna görə hər sinifdə şagirdlərin "əla", "yaxşı", "orta, "zəif" nəticələrinin faizi hesablanmış və bu baxımdan qarşılıqlı müqayisələr aparılmışdır. Aşkar edilmişdir ki, riyaziyyat fənni üzrə "əla" parametri üzrə ən yüksək dərəcələri IX C (70%) (fənn müəllimi Bilalov Yaşar) və IX D (70,35%) (fənn müəllimi Namazova Nailə) siniflərinin şagirdləri nümayiş etdirmişlər. Bununla belə həmin müəllimlərin riyaziyyat dərsləri apardıqları digər paralel siniflərdə (IX A (61,90%) – Namazova Nailə, IX B (65,21) –Bilalov Yaşar şagirdlər bir qədər aşağı nəticələr nümayiş etdirmişlər.

Eyni müəllimin iki sinifdə fərqli nəticələr nümayiş etdirməsinin səbəbləri müxtəlif ola bilər. Şagirdlərin fərqli zəka tipləri, sinifdəki fərqli mənəvi-psixoloji mühit, ailələrin təhsilə münasibəti (sosial vəziyyəti) və s. İlk baxışdan bir müəllimin iki sinifdə nail olduğu nəticə arasındakı fərq böyük görünməsə də, bu faktlar gələcəkdə həmin fərqlərin artması riskindən xəbər verir. Bu məsələyə göz yummamaq və onu araşdırmaqla bağlı tövsiyələr verilmişdir.

Doqquzuncu siniflər arasında ən aşağı nəticəni isə IX F sinfi ( əla-54,16%; kafi-12,5%) nümayiş etdirmişdir. Belə ki, bu sinfin şagirdləri digər siniflərlə müqayisədə faizlə ən aşağı "əla", ən yuxarı "orta" nəticə nümayiş etdirmişdir. Bu göstəricilər müəllimin fəaliyyətinin tədqiq edilməsini önə çəkir.

IX siniflər üzrə ana dili, XI sinif ana dili və riyaziyyat fənləri üzrə buraxılış imta-

hanlarının nəticələri əsasında da oxşar təhlillər aparılmışdır.

Məktəb direktoruna və direktor müavinlərinin nəzərinə çatdırılmışdır ki, məhz belə təhlillər zamanı aşkar edilən problemlərin həlli ilə əlaqədar tədbirlər məktəbin kollektiv idarəetməsində iştirak edən hər kəsin fəaliyyət planında öz əksini tapmalı və onların həlli istiqamətində işlər aparılmalıdır (direktor, direktor müavinləri, psixoloq, metodbirləşmə sədrləri və sinif rəhbərləri). Qeyd edilmişdir ki, birinci yarımilin nəticələri əsasında məktəbdəki bütün siniflər və bütün fənlər üzrə bu cür araşdırmalar aparılıb, nailiyyətlər və problemlərin aşkar edilməsi və növbəti yarımil üçün fəaliyyət istiqamətlərinin müəyyənləşdirilməsi təhsilin keyfiyyətinin yüksədilməsinə öz təsirini göstərəcək. Bu istiqamətdə də tövsiyələr verilmişdir.

Buraxılış imtahanlarının nəticələrinin oxşar şəraitli ümumtəhsil məktəbinin nəticələri ilə müqayisəli təhlili məktəb rəhbərliyinə öz fəaliyyətini daha obyektiv qiymətləndirməyə imkan yaradır. Belə təhlillər mövcud imkanlardan nə qədər səmərəli yararlandığını götür-qoy etməklə özünüqiymətləndirmə aparan məktəb rəhbərliyini digər məktəblərinin rəhbərləri ilə təcrübə mübadiləsi aparmağa və məktəblərarası əməkdaşlığı inkişaf etdirilməyə yönəldir. Bu baxımdan IX və XI sinif şagirdlərinin buraxılış imtahanlarında nümayiş etdirdikləri nəticələr oxşar şəraitli dörd məktəbin ( 6 nömrəli məktəb-lisey, 132-134 nömrəli Təhsil Kompleksi, 23 nömrəli məktəb, Elitar gimnaziya) təhsil nəticələri ilə müqayisəli təhlil edilmişdir. Aşkar edilmişdir ki, 6 nömrəli məktəb oxşar şəraitli 4 məktəb arasında IX siniflər üzrə riyaziyyat imtahanının nəticələrinə görə birinci, qalan nəticələrə (ana dili IX və ana dili, riyaziyyat XI) görə Elitar gimnaziyadan sonra ikinci yeri tutur.

Məktəblərlə əməkdaşlıq yollarının müəyyənləşdirilməsi, təcrübə mübadiləsinin aparılması ilə bağlı da müvafiq tövsiyələr verilmişdir. Buraya birgə nəticələrin müzakirəsi, qabaqcıl müəllimlərin qarşılıqlı dərs müşahidələrinin təşkili, ən yüksək nəticələr nümayiş etdirən müəllimlərin qarşı məktəblərin şagirdləri ilə nümunə dərsinin təşkili, məktəb rəhbərlərinin ayrı-ayrı məsələlər baxımından qarşılıqlı müqayisələr aparmaları və qabaqcıl təcrübənin mübadiləsi və s. daxildir.

Məktəbdə inkişafın dinamikası da maraqlıdır. Belə ki, üç il ərzində məktəbin ana dili və riyaziyyat fənləri üzrə IX sinif şagirdlərinin buraxılış imtahanlarının nəticələrinin inkişaf dinamikası öyrənildikdə aşkar olmuşdur ki, riyaziyyat fənni üzrə "əla" qiymət alanların faizi 2012-ci ildə 43,07%-dən 2013-cü ildə 55,55%-ə, 2014-cü ildə isə 68,49%-ə yüksəlmişdir.

Nəticələrin yüksələn xətt üzrə dinamikası məktəbin nailiyyəti kimi dəyərləndirilmiş, daha da inkişaf etmək və bu istiqamətdə başqa məktəblərlə təcrübə mübadiləsi etmək üçün tədbirlərin planlaşdırılması ilə bağlı tövsiyələr verilmişdir.

XI siniflərdə ana dili və riyaziyyat fənləri üzrə buraxılış imtahanlarının nəticələrində baş vermiş dəyişikliklər müqayisəli təhlil edilmişdir. Təhlillər göstərmişdir ki, ana dili fənni üzrə 2012-ci ildə məzunların 38,46 faizi "əla" qiymət almışdırsa, 2013-cü ildə bu faiz 48,88%-ə qalxmış, 2014-cü ildə isə bir qədər enərək 43,20%-ə düşmüşdür. Nəticələrin ildən-ilə bu cür hərəkəti məktəbdə ana dili fənninin tədrisi keyfiyyətinin yüksəldilməsi istiqamətində uğurlu strateji planın işlənib hazırlanmasına ehtiyac olduğunu göstərir. Məktəb rəhbərliyinə tövsiyə edilmişdir ki, nəticələrin belə təhlili hansı fənnin tədrisinə qayğının daha da artırılması, hansı fənn müəllimlərinin ixtisasartırmaya daha çox

ehtiyacı olduğunu aşkar edir və məktəbin fəaliyyət planında bunların nəzərə alınması böyük əhəmiyyət daşıyır.

Ana dili və riyaziyyat fənləri üzrə buraxılış imtahanlarının nəticələri baxımından məktəbin üç il ərzində inkişafının dinamikası araşdırıldıqdan sonra 6 nömrəli məktəbin inkişaf dinamikası oxşar şəraitli digər üç məktəbin inkişaf dinamikası baxımından dəyərləndirilmişdir. 2012-2014-cü tədris illərində 6 nömrəli məktəb-liseyin XI sinif şagirdlərinin buraxılış imtahanlarında ana dili fənni üzrə “əla” qiymət üzrə göstəricilərin faizi qeyri-sabit xətt üzrə irəliləmişdir. Ümumiyyətlə, sabit inkişaf dinamikası müqayisə edilən məktəblərin heç birində müşahidə edilməmişdir. Bununla belə, inkişaf dinamikası baxımından Elitar gimnaziyadan sonra 6 nömrəli məktəbin ikinci yerdə durduğu aşkar edildi.

İnkişaf dinamikasında oxşar hallar 6 nömrəli liseydə də müşahidə edildiyindən bu məsələləri araşdırmaq və özləri üçün qənaətlərə gəlmək məqsədi ilə Elitar gimnaziya ilə əməkdaşlıq şəraitində araşdırmaları davam etdirməyin səmərəli iş birliyi olacağı diqqətə çatdırılmışdır. Araşdırmalar zamanı 2012-2014-cü tədris illərində riyaziyyat fənni üzrə 6 nömrəli məktəbin məzunlarının nəticələrinin 25,42%, Elitar gimnaziyanın məzunlarının isə 36% yüksələn xətt üzrə artmasının səbəblərini öyrənmək və uğurlu məqamların məktəb təcrübəsində yayılmasını təmin etmək tövsiyə edilmişdir.

Məktəbdə mövcud vəziyyəti bütün incəlikləri ilə tədqiq etmədən, onu yuxarıda qeyd edilən parametrlər baxımından təhlil etmədən, orada təhsilin keyfiyyətinin idarə edilməsi ilə bağlı düzgün qərarlar qəbul etmək mümkün deyil. Bugünkü idarəçilik tədqiqata, təhlilə əsaslanır. Yuxarıda deyilənləri belə ümumiləşdirmək olar:

1. Ümumtəhsil müəssisəsinin fəaliyyəti planlaşdırılmazdan əvvəl məktəbdə mövcud vəziyyət yuxarıda qeyd edilən bütün parametrlər üzrə təhlil olunaraq, mövcud problemlər aşkar edilərsə, onların həlli ilə bağlı real qərarlar qəbul edilərsə, tərtib edilən fəaliyyət planlarının işləkliyi təmin olunar və keyfiyyətin inkişafına xidmət edilər;
2. Milli səviyyədə həyata keçirilməsi nəzərdə tutulan vəzifələr məktəb direktorundan başlayaraq sinif rəhbərinə qədər bütün səviyyələrdə səlahiyyət və məsuliyyətlər baxımından xüsusiləşdirilərsə, habelə məktəbin spesifikliyi nəzərə alınarsa, məktəbin kollektiv idarə edilməsi baxımından məsuliyyətin paylanması və vəzifələrin bölüşdürülməsinə nail olmaq olar ki, bu da keyfiyyət üçün hər kəsin məsuliyyət daşıması baxımından əhəmiyyətlidir;
3. Məktəb rəhbərliyi özünühesabat və özünüqiymətləndirmə üçün periodik olaraq mövcud vəziyyəti dəyərləndirərsə, problemləri vaxtında aşkar edə və onlarla çevik reaksiya verər ki, bu da keyfiyyətin təmin edilməsində xüsusi əhəmiyyət daşıyır.

***Rəyçi: dos. Ə.Abbasov***

## İstifadə edilmiş ədəbiyyat

1. Azərbaycan Respublikası Prezidentinin 2015-ci il 19 yanvar tarixli Sərəncamı ilə təsdiq edilmiş “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nın həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı.//Azərbaycan məktəbi, 2015, №1.
2. Transforming our world:the 2030 Agenda for Sustainable Development, adopted at the United Nations Sustainable Development Summit on 25 September 2015. https://sustainabledevelopment.un.org/post2015/transformingourworld

3. UNESCO Roadmap for Implementing the Global Action Programme on Education for Sustainable Development, 2014, Paris, http://unesdoc.unesco.org/images/0023/002305/230514e.pdf
4. Süleymanova A. Təhsilin əsasları. Bakı:Təhsil, 2014.
5. Vadi D.Hadad, Təhsilin planlaşdırılmasının əsasları. Təhsil siyasəti - Planlaşdırma prosesi – Tətbiqi çərçivə. Paris, 1995.
6. Adam Felix Nwankwo, School-Based Accountability Indicators as Predictors of Academic Performance, a dissertation submitted to The Faculty of The Graduate School of Education and Human Development of The George Washington University in partial fulfillment of the requirements for the degree of Doctor of Education May 17, 2009.
7. Jacqueline S. Goldberg, Bryan R. Cole, Quality Management in Education: Building Excellence and Equity in Student Performance.
8. İnterdissiplinary manegment reaserchV, Suzana Vlaşik, Smiljana Vale, Danijela Krizman Puhar, Quality management in education.
http://econpapers.repec.org/article/osijournl/default4.html

**А.Сулейманова**

**Механизмы оценивания управления качеством**

**Резюме**

В работе были изучены принципы и системы, представленные исследователями в области управления с точки зрения качества образования. Были определены системы ,отвечающие реалиям азербайджанской системы образования. На этой основе была разработана система управления качеством общего образования. В соответствии с этой системой было проведено исследование в школе-лицее 6, находящейся в подчинении Министерства Образования. Было изучено существующее положение, выявлены проблемы и достигнутые успехи. Были даны соответствующие рекомендации по годовому планированию, направленные на устранение существующих проблем. В результате сотрудничества с администрацией школы некоторые моменты, касающиеся управлением в области качества, были заново распланированы.

**A.Suleymanova**

**Assessment mechanisms of quality management**

**Summary**

The research studies principles and mechanisms through learning the Quality Management System in Education by different researchers. The paper identifies different Quality Management Systems in Education according to the realities of Azerbaijan educational system. Further, on this basis the new mechanisms of Quality Management System in Azerbaijan Education have developed. This kind of system has been investigated for a month the school-lyceum № 6 at the Ministry of Education. The current situation is learned, the successes and problems identified, some changes addressing solving these problems have been recommended. This research article points the further steps in working collaboratively on with school administration.



# ŞAGİRD BİLİYİNİN DİAQNOSTİK QİYMƏTLƏNDİRİLMƏSİ

**Əlişah Gərayev,**
***pedaqogika üzrə fəlsəfə doktoru, dosent***

*Məqalədə ümumi təhsil məktəblərində məzmun standartlarından və şagird biliyinin diaqnostik qiymətləndirilməsindən, şagird nailiyyətlərinin qiymətləndirilməsi zamanı istifadə olunan üsul və bacarıqlardan bəhs edilir.*

***Açar sözlər:*** *fənn standartları, diaqnostik qiymətləndirmə, üsul və vasitələr.*
***Ключевые слова:*** *предметное стандарты, диагностическое оценивание, методы и средства.*
***Key words:*** *subject standards, diagnostic assessment, methods and techniques.*

Dünyada gedən qloballaşma prosesinə uyğun olaraq təhsilin məzmununda baş verən keyfiyyət dəyişikliyi qiymətləndirmə sisteminin də yeniləşməsini aktuallaşdırır.

Ümumtəhsil məktəblərində məzmun standartları şagird şəxsiyyətinin sosial, psixoloji, bioloji və təcrübi istiqamətlər üzrə inkişafını izləməyə və qiymətləndirməyə imkan verir. Fənlər üzrə məktəbdaxili qiymətləndirmənin mahiyyəti, məzmunu, qiymətləndirmə vasitələrinə verilən tələblər Respublika Nazirlər Kabinetinin “Azərbaycan Respublikasının ümumi təhsil sistemində Qiymətləndirmə Konsepsiyası” adlı 13 yanvar 2009-cu il tarixli qərarında öz ifadəsini tapmışdır. Burada aydın qeyd edilmişdir ki, şəxsiyyətin sosial inkişafı onun mənəvi (dünyagörüşü, əqidəsi, marağı, meyli, kommunikativliyi, xeyirxahlığı, əməkdaşlığı, bir-birinə hörmət etmək, dinləmək, başqasının müəyyən məsələ ilə bağlı fikrini qəbul etmək və s.) və estetik (təbiət və incəsənət nümunələrinə qayğı) xüsusiyyətləri üzrə təyin olunur. Bu xüsusiyyətlərin yaradılması və formalaşdırılması dərsin tərbiyəedici vəzifəsinin funksiyasına aiddir. Ayrı-ayrı psixi proseslər (diqqət, qavrama, təfəkkür, yaddaş, hiss, psixomotor fəaliyyətlər) üzrə xüsusiyyətlər suallar, tapşırıqlar, çalışmalar vasitəsilə, ali sinir fəaliyyətinin bioloji xüsusiyyətləri (temperament, xarakter) və şəxsiyyətin fiziki inkişafı tapşırıqlar vasitəsilə təyin edilir, fəaliyyət prosesində təkmilləşir və formalaşır. Təcrübə isə məzmunun strukturu, elmiliyi və mənimsənilmiş biliklərin həcmi, bacarıq və vərdişlərin universallığı, mənimsəmənin keyfiyyəti ilə təyin edilir.

Pedaqoji prosesin icbari vacib hissələrindən biri məktəbdaxili qiymətləndirmədir. Qiymətləndirmənin mahiyyəti onun çoxfunksiyalılığı ilə xarakterizə olunur. Fiziki hadisənin mahiyyəti ondan ayrı olmadığı kimi qiymətləndirmənin də mahiyyətini tədris prosesindən kənarda axtarmaq lazım deyildir. Məktəbdaxili qiymətləndirmənin mahiyyəti şagirdlərin təlim nailiyyətlərinin, məzmun xətləri üzrə ümumi təlim nəticələri əsasında müəyyənləşdirilmiş təhsil standartlarının, qiymətləndirmə vasitələrinin köməyi ilə qazanılmış təlim nailiyyətlərinin dəyərləndirilməsidir. Qiymətləndirmə vasitələrinin köməyi ilə müəyyənləşdirilmiş təlim nailiyyətləri təlim prosesini diqqətdə

saxlamaqda, şagirdlərin inkişaf dinamikasını izləməkdə böyük əhəmiyyətə malikdir. Şagird nailiyyətlərinin qiymətləndirilməsində fizika fənn kurikulumunun tələbləri və fənnin məqsədi gözlənilməlidir. Fənn üzrə məktəbdaxili qiymətləndirmənin məqsədi fənnin məqsədindən doğmalıdır. Məktəbdaxili qiymətləndirmənin üç növü - diaqnostik, formativ, summativ mövcuddur. Şagird nailiyyətlərinin qiymətləndirilməsi zamanı istifadə olunan üsul və vasitələr fizika fənn kurikulumunun tələblərinə cavab verməlidir. Qiymətləndirmə vasitələrinin məzmunu şagirdin yaş səviyyəsinə, təlim fəaliyyəti isə sinif səviyyəsinə uyğun olmalıdır. Müəllim nəyi, necə, nə üçün qiymətləndirməsi üzərində ciddi düşünməlidir. Ona görə də şagird nailiyyətlərinin qiymətləndirilməsi zamanı üsul və vasitələrin müəyyənləşdirilməsində aşağıdakı didaktik tələblərin gözlənilməsi məsləhətlidir:

* qiymətləndirmə vasitələri reallaşması nəzərdə tutulan məzmunu standartların ölçülməsinə imkan verməli;

* məzmunun şərhinin aydınlığı və yaşa uyğunluğu, riyazi aparaturanın çətinlik səviyyəsi, vahidlər sisteminin düzgünlüyü nəzərə alınmalı;

* qiymətləndirmə vasitələrinin hazırlanmasında sistemlilik, ardıcıllıq gözlənilməli;

* tapşırıqların tərtibində cəlbedicilik, rəsm və şəkillərin aydınlığı gözlənilməli;

* anlayışların, terminlərin elmi cəhətdən düzgün ifadə olunması nəzarətdə saxlanılmalı;

* sual, çalışma və tapşırıqların məzmunu fizika elminin cəmiyyətin həyatındakı rolu ilə əlaqələndirilməli;

* qiymətləndirmə vasitələrinin tərtibində fizikanın praktik tətbiqlərinə aid nümunələrin verilməsi və s.

Bizim məqsədimiz sadəcə məktəbdaxili qiymətləndirmənin növlərini sadalamaq deyil, standartların tələbinə uyğun qiymətləndirmə vasitələrinin məzmununun tərtibində elmi-metodiki səviyyənin gözlənilməsidir. Diaqnostik qiymətləndirmədə məqsəd məzmun standartlarının reallaşdırılmasına kömək göstərəcək mövcud bilik, bacarıqları müəyyənləşdirməkdir. Diaqnostik qiymətləndirmə dərs ilinin, tədris vahidinin və dərsin əvvəlində şagirdlərin fənnə uyğun bilik və bacarıqlarının səviyyəsini müəyyənləşdirmək məqsədilə aparılır. VI sinfin əvvəlində diaqnostik qiymətləndirmədə fənlərarası şaquli inteqrasiya, yuxarı siniflərdə isə fənlərarası və fəndaxili inteqrasiya nəzərə alınmalıdır.

Fizika fənni üzrə məktəbdaxili qiymətləndirmənin aparılmasında ən yeni metod və üsullardan istifadə olunur. Fizika kifayət qədər mürəkkəb və maraqlı fəndir. Müəllimdən şagirdləri ümumi təlim nəticələri əsasında bilik və bacarıqların qazanılmasına istiqamətləndirməkdə kifayət dərəcədə böyük pedaqoji ustalıq tələb olunur. Hər bir fənn müəllimi qiymətləndirmənin təlimin hansı mərhələsində, hansı zaman kəsiyində aparılması üzərində düşünməklə, eyni zamanda yoxlanılması nəzərdə tutulan şəxsiyyətyönümlü, sosial, idraki, kommunikativ bacarıqları təsnif edərək hansı qiymətləndirmə növləri vasitəsilə yoxlamaq haqqında düzgün bir nəticəyə gəlməlidir.

Fizika fənn kurikulumuna görə VI sinifdə "Fiziki hadisələr, qanunauyğunluqlar, qanunlar" məzmun xətti üzrə fiziki hadisələrə dair bilik, bacarıqları nümayiş etdirir. Bir qədər açıqlama verək:

- Mexaniki, istilik, elektromaqnit hadisələrini fərqləndirir.
- Müxtəlif xarakterli fiziki hadisələrə dair sadə məsələlər həll edir.
- Hərəkəti növlərinə görə qruplaşdırır.
- Müxtəlif xarakterli təbiət hadisələrinə dair müşahidələrini təqdim edir.

"Maddə və sahə, qarşılıqlı təsir, əlaqəli sistemlər" məzmun xətti üzrə:

- Materiyanın formalarına dair bilik və bacarıqlar nümayiş etdirir.
- Maddələri quruluşuna (aqreqat hallarına) görə fərqləndirir.
- Materiyanın formalarını fərqləndirir.
- Materiyanın formalarına dair müşahidələrini sadə şəkildə təqdim edir.
- Maddələrin quruluşuna (aqreqat hallarına) dair sadə məsələlər həll edir.
- Təbiətdəki əlaqəli sistemlərdə qarşılıqlı təsiri mənimsədiyini nümayiş etdirir.
- Təbiətdəki əlaqəli sistemləri və qarşılıqlı təsirləri fərqləndirir.
- Təbiətdəki qarşılıqlı təsirə dair müşahidələrini təqdim edir.

“Eksperimental fizika və müasir həyat” məzmun xətti üzrə isə:

- Təcrübələr aparır, nəticələri təqdim edir.
- Sadə ölçü cihazlarından istifadə edir.
- Sadə təcrübələr aparır, nəticələrini təqdim edir.
- Müasir həyatın inkişafında fizika elminin rolunu mənimsədiyini nümayiş etdirir.
- İş prinsipi fiziki hadisələrə əsaslanan məişət qurğularından istifadə edir.
- Fizika elminin inkişafında dünya alimlərinin roluna dair sadə məlumatı təqdim edir kimi standartlar müəyyənləşdirilmişdir.

Bu standartların reallaşdırılmasında diaqnostik qiymətləndirmə vasitələrinin hazırlanması məqsədilə sinif səviyyəsində və siniflərarası inteqrasiyanı nəzərə almaqla nümunə üçün göstərə bilərik ki, V sinif həyat bilgisi fənn kurikulumunun “Təbiət və biz” məzmun xəttinin - Cisim, maddə və təbiət hadisələrinin sadə təsnifatını verir; V sinif riyaziyyat fənni kurikulumunun “Ölçmə” məzmun xəttinin - Uzunluğun, sahənin, həcmin və bucağın ölçü vahidlərini bilir və ölçmə alətlərindən istifadə edir, yaxud xətkeşin və transportirin köməyi ilə ölçmələr aparır; VI sinif coğrafiya fənn kurikulumunun “Təbiət” məzmun xətti üzrə - Hava üzərində müşahidələr aparır, nəticələrini təqdim edir; VI sinif texnologiya fənn kurikulumunun “Texnika elementləri” məzmun xətti üzrə - Mexanikləşdirilmiş əl alətlərinin iş prinsiplərini şərh edir; Mexanikləşdirilmiş əl alətlərindən istifadə edir; VI sinif informatika fənn kurikulumunun “Formallaşdırma, modelləşdirilmə, alqoritmləşdirmə və proqramlaşdırma” məzmun xətti üzrə - Obyektin informasiya modelinin təsvir formalarını sadalayır standartları ilə əlaqəni nəzərə almaq lazım gəlir. Yuxarıda göstərilən fənlər üzrə şagirdlərin qazandıqları bilik və bacarıqların (riyaziyyatda ölçmə bacarığının, coğrafiyada müşahidə etmək, informatikada İKT-dən istifadə, texnologiyada praktik bacarığın) səviyyəsinin müəyyənləşdirilməsi fizika fənninin tədrisi üçün çox önəmlidir. Nümunə üçün VI sinifdə digər fənlər üzrə yuxarıda sadaladığımız standartlara əsasən belə bir məzmunda diaqnostik qiymətləndirmə üçün sorğu vərəqi hazırlamaq olar:

- Hansı müşahidə cihazlarını tanıyırsınız?
- Müşahidə etdiyiniz təbiət hadisələrini sayın və təqdimat hazırlayın.
- Məişətdə istifadə olunan ölçü, cihaz və avadanlıqlarını sadalayın və uyğun ölçü vahidlərini göstərin.
- Mexanikləşdirilmiş məişət qurğularını sadalayın və iş prinsiplərini izah edin.

Diaqnostik qiymətləndirmə aparıldıqda məqsəddən asılı olaraq fənlərarası (siniflər arasında, sinif səviyyəsində) və fəndaxili (həm şaquli, həm də üfüqi) inteqrasiya nəzərə alınmalıdır. Diaqnostik qiymətləndirmənin üsul və vasitələrinin seçimi fərdin, cəmiyyətin və dövlətin tələblərinə uyğun fənnin xüsusiyyətindən, fizika kabinetinin təchizindən asılı olaraq müəllim tərəfindən müəyyənləşdirilir. Diaqnostik qiymətləndirmədə şagirdlərin yaradıcılıq qabiliyyətləri, fənn üzrə keçirilən tədbirlərdə iştirak, kiçik və böyük summativ qiymətləndirmələrin nəticələri, əlaqəli fənləri tədris edən digər

fənn müəllimlərinin onlar və sinif haqqında rəylərinin öyrənilməsi məqbul hesab edilə bilər.

* Diaqnostik qiymətləndirmə vasitələrinin hazırlanmasında şagirdlərin məqsədyönlü praktik bacarıqlarının müəyyənləşdirilməsinə diqqət yetirilməlidir.

* Diaqnostik qiymətləndirmə vasitələrinin köməyi ilə təhsilalanların fərd və sinif səviyyəsində qazanılmış bilik, bacarıqlarının mümkün sərhədi görünməlidir.

* Diaqnostik qiymətləndirmə prosesində fəndaxili və fənlərarası inteqrasiya hesabına məzmun standartlarının reallaşmasında istifadəsi zəruri olan digər fənlərdən və mövzudan kənar bilik və bacarıqların səviyyəsi müəyyənləşdirilməlidir.

* Diaqnostik qiymətləndirmə vasitələrinin hazırlanmasında ümumi təlim nəticələrinin reallaşmasının minimum səviyyəsi gözlənilməlidir.

İlkin araşdırmalar onu göstərir ki, fizika müəllimləri hər hansı bir tədris mərhələsində fəaliyyətə başlayarkən müvafiq istiqamətdə inkişafın təmin olunmasına dəstək olmaq məqsədi ilə diaqnostik qiymətləndirmə aparmalı olurlar. Müşahidələrimizdən gəldiyimiz qənaət ondan ibarətdir ki, bu sahədə uğurları ilə fərqlənən müəllimlərimiz olsa da, qiymətləndirmə fəaliyyətinin təşkilində bir sıra çətinliklər də vardır. Heç şübhəsiz, bu çətinliklərin aradan qaldırılmasında fizikadan qiymətləndirmə texnologiyalarının yaradılması ilə bağlı araşdırmaların, eləcə də əldə olunmuş nailiyyətlərlə bağlı təcrübə mübadilələrinin aparılmasına ehtiyac vardır.

***Rəyçi: p.ü.e.d. İ.İsmayılov***

## İstifadə edilmiş ədəbiyyat

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. //Azərbaycan məktəbi, 2013, №5.
2. Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli Kurikulum). Bakı, 2006.
3. Yeni təhsil proqramlarının (kurikulumların) tətbiqi məsələləri. Bakı, 2014.
4. Ümumi təhsilin fənn standartları (I-XI siniflər). Bakı, 2014.
5. Ümumi təhsil pilləsinin dövlət standartları və proqramları (kurikulumları). //Azərbaycan məktəbi, 2011, № 6.
6. Azərbaycan Respublikasının ümumi təhsil sistemində qiymətləndirmə konsepsiyası.// Kurikulum, 2009, № 2.

**А.Гераев**

**Диагностическое оценивание учащихся**

**Резюме**

В статье говорится о содержительных стандартах, о диагностическом оценивании знания учащихся  о методах и средствах, использованных при  оценивании их знаний.

**A.Gerayev**

**Diagnostic assessment of students**

**Summary**

The article is dedicated to the content standards and diagnostic assessment of students' knowledge, method and techniques used for assessment students' achievement at secondary schools.

# AZƏRBAYCANDA MÜƏLLİMLƏR TƏHSİL İSLAHATLARI KONTEKSTİNDƏ ÖZ PEŞƏKARLIQLARINI NECƏ DƏRK EDİRLƏR

**Ülviyyə Mikayılova,**
***Azərbaycan Universitetinin müəllimi, biologiya üzrə fəlsəfə doktoru***

**Elmina Kazımzadə,**
***Bakı Dövlət Universitetinin tətbiqi psixologiya kafedrasının dosenti, psixologiya üzrə fəlsəfə doktoru***

*Məqalədə Azərbaycanda 2008-2013-cü illərdə həyata keçirilən təhsil sektorunun inkişafı Layihəsi kontekstində peşəkar dəstək sisteminin effektivliyi haqqında müəllimlərin mülahizələri təhlil edilir. İslahatların həyata keçirilməsinin müxtəlif mərhələlərində üç dəfə keçirilən iki sorğunun - müəllimlərin özünüqiymətləndirməsinin (1) və ibtidai məktəbin kurikulumu islahatı gedişinin qiymətləndirilməsinin (2) nəticələrindən istifadə olunur. Ənənəvi ixtisasartırma sistemində müəllimlərə peşəkar inkişaf proqramlarından benefisiarlar rolu ayrılmışdır. Ancaq son onillikdə təhsil siyasətinin işlənilməsi üçün məsuliyyət daşıyan şəxslər müəllimləri onların fərdi tələbatları nəzərə alınmaqla peşəkar inkişaf barəsində müstəqil qərarlar qəbul etməyə həvəsləndirirlər. Peşəkar inkişaf proqramlarının layihələşdirilməsində müəllimlərin iştirakı bu proqramlar çərçivəsində tədrisin keyfiyyətinə təlimin təsir effektini yüksəldə bilər. Təhsil üzrə tədqiqatçılara müəllimlər və təhsil sistemi rəhbərliyi arasında dialoqda vasitəçi kimi mühüm rol ayrılır, onlar təhsil qrupları çərçivələrində effektiv tərəf müqabilliyinin formalaşmasına kömək edə bilərlər.*

***Açar sözlər:*** *müəllimlərin peşəkar inkişafı, kurikulum islahatı, müəllimlərin qavrayışı, birgə təlim mədəniyyəti, peşəkar qarşılıqlı əlaqə şəbəkələri.*

***Ключевые слова:*** *профессиональное развитие учителей, реформа учебной программы, восприятие учителей, культура совместного обучения, сети профессионального взаимодействия.*

***Key words:*** *teacher professional development, curriculum reform, teacher perception, collaborative learning culture, professional networking.*

Azərbaycan “sosializm ictimai-siyasi sistemin böhranı və Sovet İttifaqının süqutu” aradan qaldırıldıqdan, eləcə də 1990-cı illərin ortalarından başlayaraq müstəqillik qazandıqdan sonra “siyasi xaos, iqtisadi böhran və sosial iflas” mərhələsini dəf edərək, inkişaf sahəsində özünün prioritetlərini bərqərar etməklə, tədricən dirçəlməyə başladı [Presidential Office of the Republic of Azerbaijan, 2012, P.2]. Təhsil sahəsində belə prioritetlər qismində “təhsil sistemində köklü dəyişikliklərə aparan insan kapitalının inkişafı” [Ibid. P. 7] və “Azərbaycan təhsil sisteminin beynəlxalq təhsil sistemi standartlarına adaptasiyası” [State Commission on Education Reforms of the Azerbaijan Republic, 1999, P. 2] təqdim edildi. 1999-cu ildə hökumət Dünya bankının maliyyə və texniki dəstəyi şəraitində ölkənin Təhsil Nazirliyinin rəhbərliyi



**Məqalə kiçik ixtisarlarla dərc edilmişdir.**

altında həyata keçirilən Təhsil Sektorunun inkişaf Layihəsini irəli sürdü.

Təhsil sektorunun inkişaf layihəsinin məqsədi məktəbəqədər, ibtidai və orta təhsil üçün yeni kurikulumların tətbiq edilməsi yolu ilə ölkədə məktəb təlimi dövlət sisteminin islahatından ibarətdir. İbtidai məktəblər üçün 2006-cı ildə tətbiq edilməsi tövsiyə edilmiş və 2008-ci ildə ilk dəfə olaraq tətbiq edilməyə başlanılmış yeni milli kurikulumun məğzi akademik biliklərin mənimsənilməsinə diqqət edildiyi və başlıca olaraq elmi qabiliyyətlərə malik şagirdlərə yönəldildiyi ənənəvi yanaşmanın şagirdlərin şəxsiyyətini təlim prosesinin mərkəzində saxlayan pedaqoji yanaşma ilə əvəz edilməsindən ibarətdir.

Kurikulum islahatının qiymətləndirilməsi və sənədləşdirilməsi üçün Dünya Bankı üç mərhələdən ibarət monitorinq tədqiqatlarını işə saldı: 2010-cu ildə başlanğıc, 2012-ci ildə aralıq və 2013-cü ildə yekun tədqiqatlar. Bu tədqiqatların məqsədi islahatların həyata keçirilməsi prosesində müəllimlərin həmin islahatlara münasibətini qiymətləndirməkdən və bu barədə təhsil siyasətini həyata keçirən orqanları məlumatlandırmaqdan, eləcə də təhsilin əks-mərkəzləşməsinə ifrat dərəcə mərkəzləşdirilmiş, avtoritar quruluşdan fakt və sübutlara əsaslanan, ümumi səylərlə zəruri dəyişikliklərin əldə olunduğu şagird, müəllim və rəhbərlərin peşəkar icması kimi fəaliyyət göstərən təhsil sisteminə keçməyə başlamaqdan ibarət idi.

Kurikulum islahatları çərçivəsində müəllimlər şagirdin təlim prosesinin fəal iştirakçısı olaraq şəxsi maraqları və başqalarından fərqli tələbləri olan, fərdi təlim üslubu ilə səciyyələnən, özünün güclü və zəif cəhətlərinə malik yeni görümünə uyğunlaşmalıdırlar. Onların qarşısında tədrisin interaktiv metodlarından istifadə etmək, bu zaman təlim prosesində mərkəzi yeri şagirdlərə ayırmaq və şagirdlərdə yüksək səviyyədə dərketmə vərdişlərinin, kreativliyin, tənqidi düşüncənin və bütün həyatları boyu təlimlənməyə əsaslanan inkişafına kömək etmək vəzifəsi qoyulmuşdur. Azərbaycan cəmiyyətinin müasirləşdirilməsi üçün məhz bu xüsusiyyətlər zəruri olaraq müəyyən edildi. Və nəhayət, müəllimlərə yeni dərsliklərdən və müəllimlər üçün metodik vasitələrdən istifadə etmək, eləcə də şagirdlərin nailiyyətlərinin izlənilməsi üçün yeni metodlar tətbiq etmək təklif olundu.

Kurikulum islahatı, müəllimlərin peşəkar inkişafının təşkilində, həmçinin innovasiyaları nəzərdə saxlayırdı. Təhsil sektorunun inkişaf Layihəsi bu bazara müəllimlərin peşəkar hazırlanması xidməti üzrə lisenziyalı və lisenziyasız, kommersiya və qeyri-hökumət xarakterli müxtəlif əlavə təhsil mərkəzləri üçün yol açdı. Yeni proqram üzrə çalışan bütün məktəb müəllimləri hər tədris ilinin əvvəlində bu proqramın tətbiqi üzrə kifayət qədər intensiv hazırlıq keçirdilər.

Yeni kurikulumun tətbiq olunması prosesinin monitorinqi göstərdi ki, onun reallaşması prosesində müəllimlər çoxsaylı çətinliklərlə qarşılaşmışlar. Problemlər proqramın tətbiq olunduğu bütün mərhələlərdə tədrisetmənin interaktiv metodları, yeni qiymətləndirmə metodları, yeni dərslik və metodiki vasitələrdən istifadə zamanı üzə çıxırdı. 2010-cu ildə müəllimlərin sorğu prosesinin gedişində bu çətinliklər aşkar edildikdən sonra Təhsil sahəsinin inkişaf Layihəsinin idarəedici orqanları yeni dərs proqramı üzrə müəllimlərin peşəkar hazırlıq müddətini 36 saatdan 60 saata qədər uzatdılar, təlimçilərin yoxlanılması prosedurunu tətbiq etdilər və kurikulum islahatının əvvəlində Təhsil Nazirliyi tərəfindən yaradılmış vahid paket əvəzinə müəllimlərin təkmilləşdirilməsi sahəsi üzrə xidmət təda-

rükçülərinin işləyib hazırladıqları müxtəlif təlim materiallarından istifadə etməyə icazə verdilər.

Son iki onillik ərzində bir neçə keçmiş sovet ölkələrində təhsil islahatları üzrə layihələrə təşəbbüs edildi və bütün hallarda müəllimlərin peşəkar inkişafı tətbiq edilmiş innovasiyaların uğurlu olduğunu təyin edən vacib amillər nəzərdən keçirildi [Silova, Kazimzade, 2010; Silova et al., 2010]. Müəllimlərin peşəkar inkişaf səviyyəsi bir qayda olaraq, donor təşkilatların və dövlət idarələrinin nöqteyi-nəzərini təqdim edən monitorinq hesabatların əsasında qiymətləndirilirdi, müəllimlərin öz fikri isə bu zaman nəzərə alınmırdı. Təqdim olunan tədqiqat işində biz müəllimlərdən əks əlaqə almaq, birgə qərarlar qəbul etmək və müəllimlərin peşəkar inkişafı sahəsində innovasiyaların tətbiqi zamanı effektli planlaşdırma imkanını təmin etmək üçün onların fikirlərini də öyrənməliyik [Hustler et al., 2003; Hipsher, 2014; Johnson, 2011]. Azərbaycanda təhsil islahatlarının həyata keçirilməsi üçün yeni kurikulumlar haqqında müəllimlərin fikirləri xüsusi əhəmiyyətə malikdir, çünki məhz onlar islahatların keçirilməsi səyləri ilə bu islahatın müəllimlərin peşəkar inkişafına təsiri arasındakı qarşılıqlı əlaqə haqqında məlumatı təhsil siyasətini formalaşdıran orqanlara və təhsil sahəsində çalışan məmurlara təqdim edə bilirlər.

Müəllimlər tərəfindən onların peşəkar inkişaflarının bu və ya digər cəhətlərinin dərk edilməsi son zamanlar keçmiş sovet məkanında tədqiqatçıların həqiqi marağına səbəb olmuşdur. Tacikistanda, Qırğızıstanda, Latviyada və Azərbaycanda təhsil islahatları gedişində həyata keçirilmiş təşəbbüslərin bütünlükdə bölgə üçün ümumi olan mühüm xüsusiyyətləri üzə çıxarılmışdır [Niyozov, 2004; Joldoshalieva, 2006; Silova et al., 2010; Gorgodze, 2013; Karimova, Kazimzade, Silova, 2014]. Bu xüsusiyyətlərin sırasına, məsələn, müəllimlərin peşəkar inkişafı üzrə xidmətlərin təqdim edilməsinin diversifikasiyası və müştərək təlim üçün müəllimlərin peşəkar inkişaf icmaların formalaşması aiddir.

**Müəllim təkmilləşdirilməsinin diversifikasiyası.** Avrasiyanın bir çox ölkələri pedaqoji kadrların hazırlanmasının son dərəcə mərkəzləşdirilmiş modelindən əksmərkəzləşdirmə və diversifikasiya olunmuş modelinə keçmişlər. İslahatların gedişində peşəkar inkişafın müxtəlif növ və formaları əhəmiyyətli dərəcədə artmışdır. Məsələn, məktəb hüdudları xaricində ixtisaslaşdırılmış müəssisələrdə ənənəvi ixtisas artırılmasına alternativ olaraq məktəb divarları daxilində peşəkar inkişafın dəstəklənməsi meydana çıxdı. Məktəb bu variantlardan hansına üstünlük verəcək? Müəllimlərə nəsihət edilməsi, həmkarlara məsləhət verilməsi və müəllimlərin digər dəstəklənmə formalarına hansı qiyməti verəcəklər? Müəllimlərin peşəkar inkişafının belə formalarının təmin edilməsində məktəbin imkanları necədir?

**Birgə təlim üçün müəllimlərin peşəkar inkişaf icmaları.** İnnovasiyalı təlim metodlarını mənimsəmək və islahatların tədris fəaliyyətinə qarşı irəli sürdüyü tələblərə müvafiq olmaq üçün müəllimlərin öz həmkarları ilə ünsiyyət etmək, qarşılıqlı əlaqədə olmaq, onlarla ideya və təcrübə mübadiləsi aparmaq imkanına malik olmaları vacibdir.

Məqalədə 2009-2013-cü illər ərzində ibtidai məktəblərdə həyata keçirilən kurikulum dərs proqramı islahatlarının təsirinin qiymətləndirildiyi monitorinq tədqiqatın nəticələri təqdim edilmişdir. Bunların əsasında ibtidai məktəb müəllimləri tərəfindən islahatların müxtəlif aspektlərinin, o cümlədən tədrisin interaktiv metodlarından istifadə, sinifdə və məktəb səviyyəsində

kurikulumun tətbiqi üsulları, şagirdlərin nailiyyətlərinin qiymətləndirilməsinin müxtəlif strategiyalarının tətbiqi, müəllimlərin təkmilləşdirilməsi proqramlarının effektivliyi, eləcə də onlar üçün zəruri olan peşəkar dəstəklənmənin qavranılması təhlil edilmişdir.

Monitorinq tədqiqatlara müəllimlərin iki sorğusu - özünüqiymətləndirmə və təhsil islahatının qiymətləndirilməsinə həsr edilmiş sorğular daxil idi.

Özünüqiymətləndirmə sorğusu bir neçə cavab variantları olan sualları, həmçinin də açıq sualları özündə saxlayan müstəqil doldurulmuş anonim anketlərin köməyi ilə keçirilmişdir. Anketdə beş kateqoriyadan olan suallar var idi, burada müəllimlər: 1) özləri haqqında ümumi məlumat vermişlər (yaş, cins, pedaqoji təhsilin səviyyəsi, iş təcrübəsi, iş stajı); 2) hazırkı islahatları və yeni kurikulumların tətbiq edilməsi gedişatını qiymətləndirmişlər; 3) tədrisdə və təhsil almada, təlim təcrübəsində və dərsliklər və metodiki vasitələrin istifadə olunmasındakı dəyişikliklər haqqında fikir söyləmişlər; 5) treninqlər və metodiki dəstəkləmə də daxil olmaqla, yeni kurikulumun tətbiqi prosesində təmin olunan peşəkar inkişafın effektivliyi haqqında öz mülahizələrini tərtib etmişlər.

Təhsil islahatının qiymətləndirilməsinə həsr edilmiş sorğu dörd anketin köməyi ilə dörd qrup respondentlər üçün keçirilmişdir: müəllimlər, məktəb direktorları, valideynlər və şagirdlər. Yaşlılar üçün anketlərdə bir neçə cavab variantı olan suallar və aşağıdakı mövzular üzrə açıq suallar var idi: 1) təhsil sahəsində cari islahatlara dair məlumatlılıq və onların dəstəklənməsi, o cümlədən kurikulum islahatına münasibət; 2) məktəbəqədər təhsilə münasibət; 3) məktəb kitabxanasından istifadə olunması; 4) uşaqların məktəbə hazırlanması üçün məktəbəqədər təhsilin vacibliyi haqqında məlumatlılıq və onun təlimin müvəffəqiyyətinə təsiri.

Biz kurikulum islahatları prosesində müəllimlərin öz peşəkarlıq ehtiyacları haqqında təsəvvürlərinin dərindən təhlil edilməsi üçün müəllimlərdən alınmış nəticələrdən istifadə etmişik.

Monitorinq tədqiqatların bütün mərhələləri boyu 7700 nəfərdən çox müəllimin arasında sorğu aparılmış, o cümlədən təxminən 2700 müəllim 2010-2013-cü illərdə özünüqiymətləndirmə sorğusunda iştirak etmiş və 5080 müəllim ümumi sorğu çərçivələrində anketləri doldurmuşlar.

Müəllimlərin öz işlərini qiymətləndirdikləri anketlərdə onların tədris prosesində qarşılaşdıqları aşağıdakı çətinliklər daha çox qeyd olunurdu:

- pedaqoji yanaşmaların fərdiləşdirilməsi və inkişafın tələblərinə cavab verən praktiki metodların planlaşdırılması;
- fəal təlim dərslərinin planlaşdırılması və interaktiv tədris metodlarından istifadə olunması;
- şagirdlərin motivasiyası;
- yeni qiymətləndirmə strategiyalarından istifadə olunması.

Pedaqoji yanaşmaların fərdiləşməsi və inkişafın tələblərinə cavab verən praktiki metodların planlaşdırılmasındakı çətinlikləri müəllimlər, hər şeydən öncə zəif və yetirməyən şagirdlərlə iş zamanı hiss edirdilər. Fərqli vərdiş və imkanlara malik şagirdlər üçün müxtəlif tapşırıqların işlənilməsi, sonra isə dərsin gedişində şagirdlərin fərdi xüsusiyyətlərinin, bilik və bacarıqlardakı fərqlərin nəzərə alınması heç də asan olmadı. Şagirdləri maraqlandıra bilən tapşırıqların işlənilməsi ayrıca problemdir.

Fəal təlim dərslərinin planlaşdırılması zamanı yaranan çətinliklər dərs materiallarının seçimi, fəal təlimin bütün mərhələləri üçün tapşırıqların hazırlanması ilə bağlıdır. Sorğu edilmiş müəllimlər üçün

çətinlik şagirdlərə malik olduqları bilikləri tətbiq etmək imkanını verə bilən tapşırıqların seçilməsi və ya hazırlanmasından və həmçinin şagirdlərlə müxtəlif tapşırıqları yerinə yetirərək, dərsin məqsədlərinə nail olunmasını təmin etməkdən ibarətdir.

Yeni kurikulum çərçivəsində tədris üçün vacib olan interaktiv metodların tətbiq edilməsi çətin məsələ oldu. Bir çox müəllimlər tədrisin interaktiv və ənənəvi metodlarını əlaqəli şəkildə istifadə etdiklərini və yaxud da təlimin yalnız ənənəvi üsulları üzrə işləməkdə davam etdiklərini bildirirdilər. Monitorinq tədqiqatların bütün mərhələləri boyu müəllimlər tədrisin interaktiv metodlarını tətbiq edən zaman dərsin qarşıya qoyulan məqsədlərinə uyğunluğun təmin edilməsinin onlar üçün çətin olduğunu həmişə qeyd edirdilər. Bundan başqa, müəllimlər fəal təlim metodlarından istifadə zamanı sinifdə işin təşkili tipləri (sinifdə ümumi iş, qruplarda tapşırıqların yerinə yetirilməsi, cütlüklərlə iş və ya fərdi çalışmalar) arasında seçim etməkdə və fəal təlimin prinsipləri əsasında dərsin bütün hissələrinin qurulmasında çətinlik çəkirdilər. Şagirdlərin təlimə meyilləndirilməsi hər dərsdə müəllim qarşısında duran vəzifədir. Monitorinq tədqiqatlar, müəllimlərin bütün dərs müddətində şagirdlərin diqqətini necə cəlb etmək və onu saxlamaq, şagirdləri qrupda iş üçün əsaslandırmaq və onları birgə təlimə təhrik etmək kimi problemlərlə qarşılaşdıqlarını göstərdi.

Şagirdlərin nailiyyətlərinin qiymətləndirilməsi strategiyasına gəlincə, 2010-cu ildə müəllimlərin yarısı materialın başa düşülməsi və yadda saxlanılmasının yeni kurikulum tədris standartları çərçivəsində lazımlı keyfiyyət və vərdişlər olduğuna əmin idilər. 2013-cü ildə tədqiqatçılarda müəllimlərin keçmişdəki kimi aşağıdakı səhv təsəvvürə tərəfdar olduqlarına əminlik üçün imkan yarandı: belə məlum oldu ki, müəllimlərin əksəriyyəti şagirdlərin akademik nailiyyətlərini onlar tərəfindən əldə edilmiş biliklərin reproduksiyası əsasında qiymətləndirirlər.

Yeni kurikulum tələblərini təcrübədə yerinə yetirməyə cəhd edən müəllimlərin qarşılaşdıqları çətinliklər, eləcə də sorğunun nəticələrinə görə onların peşəkarlıq ehtiyaclarının qeyri-qənaətbəxş qalması kurikulum islahatı prosesində pedaqoqların peşəkar inkişaf imkanlarının təhlil edilməsinin zəruri olduğunu şərtləndirdi. Daha sonra biz müəllimlərin sözügedən islahat çərçivəsində təmin olunduqları peşəkar inkişaf imkanları haqqında təsəvvürlərini nəzərdən keçirəcəyik.

Müəllimlər öz peşəkarlıq ehtiyaclarının, xüsusilə yeni kurikulumun tətbiqi prosesində meydana çıxan ehtiyaclarının qənaətbəxş olmadığını həmişə qeyd edirdilər. İslahat müəllimlər qarşısında aşağıdakı tələbləri irəli sürür: onlar şagirdlərlə sinifdə işin idarə olunmasına, xüsusi təhsilə ehtiyaclı uşaqların təlimləndirilməsinə və tədrisetmədə diferensial yanaşmaya xidmət edən xüsusi vərdişləri mənimsəməlidirlər. 2013-cü ildə sorğuda iştirak edən müəllimlərin yarıdan çoxu öz bilik səviyyələrini qeyri-qənaətbəxş qiymətləndirərək, bunu yeni kurikulum, təlim metodları, qiymətləndirmə strategiyası, eləcə də İnformasiya-Kommunikasiya Texnologiyalarına (İKT) yiyələnmə səviyyəsi ilə əlaqələndirdilər.

Tədqiqatın bütün mərhələlərində özünə yer alan İKT-yə yiyələnmə vərdişlərinin təkmilləşdirilməsi - peşəkar inkişaf sahəsində müəllimlərin başlıca tələbatlarındandır. Müəllimlərin əksəriyyəti, onlara hər şeydən öncə İKT-nin tətbiqi və informasiyalar axtarışında köməyin zəruri olduğunu dəfələrlə göstərmişlər.

Yeni kurikulumun tətbiqi prosesində müəllimlərin peşəkar dəstəklənməsinə gəlincə, tədqiqatın nəticələri müəllimlərin

belə dəstəklənmənin təqdim olunmasını, onun diversifikasiya olunma dərəcəsini və peşəkar inkişaf prosesində iştirakını necə qiymətləndirdikləri haqqında mühakimə yeritməyə imkan verir.

Yeni kurikulumun tətbiq edilməsini təmin etməyə qadir müəllimlərin peşəkar dəstəklənməsinin üç səviyyədə təqdim olunacağı nəzərdə tutulmuşdu: 1) işdən ayrılmadan müəllimlərin ixtisasartırması sahəsində xidmət tədarükçüləri tərəfindən Təhsil Nazirliyi ilə müqavilə əsasında keçirilən peşəkar hazırlıq; 2) təhsilin idarə olunması üzrə yerli orqanlar tərəfindən kurikulumun hazırlanması üzrə mərkəzlərdən metodistlərin, dayaq məntəqələri işçilərinin, rayonun ən yaxşı məktəb pedaqoqlarının işə cəlb olunduqları dəstəklənmə; 3) müdiriyyət, metodik şuralar, kurikulum mərkəzləri və metodistlər tərəfindən məktəb səviyyəsində dəstəklənmə. Qeyd olunan bütün qurumlar keyfiyyətə və müəllimlərin peşəkar dəstəklənməsinə görə birbaşa məsuliyyət daşıyırlar.

Yeni kurikulumun tətbiq olunmasında iştirak etməli olan müəllimlər yay tətilləri vaxtı, dərs ilinin başlanmasından öncə müəyyən sinif üçün nəzərdə tutulmuş proqram üzrə 10 günlük kurs keçirdilər. Təşəbbüs edilmiş və Təhsil Nazirliyi tərəfindən maliyyələşdirilmiş bu hazırlıq kursunu müəllimlərin ixtisasartırması sahəsində xidmət tədarükçüləri həyata keçirirdilər. Hazırlıq proqramı yeni kurikulumun müxtəlif aspektlərini, o cümlədən tədrisetmədə interaktiv metodlardan istifadə, şagirdlərin nailiyyətlərinin yeni qiymətləndirilmə metodu, planlaşdırma və tədris metodlarının fərdiləşdirilməsi, təlim üçün əlverişli şəraitin yaradılması, yeni dərsliklər və metodik vəsaitlərin istifadəsi, əməkdaşlığın möhkəmləndirilməsi, təhsil prosesində iştiraka valideynlərin və yerli icma üzvlərinin cəlb olunması və s. əhatə edirdi.

2013-cü ildə demək olar ki, bütün müəllimlər yeni kurikulum üzrə hazırlıq keçmiş və onların böyük əksəriyyəti bu proqramı "əla" və "yaxşı" qiymətləndirmişlər. Müəllimlərin, demək olar ki, yarısı bu təlim nəticəsində öz peşəkarlıqlarının ya "əhəmiyyətli", ya da "müəyyən dərəcədə" artdığını qeyd etmişlər.

Azərbaycan müəllimlərinin işdən ayrılmadan əldə etdikləri peşəkar hazırlığın keyfiyyətindən qayğılanmaları Qırğızıstan məktəblərindəki müəllimlərin əhvalına sirayət etmişdir: "Müəllimlər məzmun və pedaqoji yanaşma, quruluş və aktuallıq nöqteyi-nəzərindən öz peşəkar inkişaflarının keyfiyyətindən son dərəcə narahatdırlar təlim kursu müəllimlərin ehtiyaclarına məhəl qoymur, təlimatçılar isə məhdud peşəkarlıq təcrübəsinə malikdirlər" [Joldoshalieva, 2006, P. 796]. Ancaq Qırğızıstan müəllimləri mərkəzləşdirilmiş qaydada eyni bir model üzrə müəllimlərin ixtisasının artırılması dövlət institutunun həyata keçirdiyi işdən ayrılmadan peşəkar hazırlıq kursları haqqında belə fikirdə idilər. Bu, Azərbaycan müəllimlərinin iş yerində ixtisasartırmanın ənənəvi modelinin konkret tələbləri üzərində qurulan peşəkar hazırlıq proqramlarına üstünlük verməsi mənasını kəsb edə bilər. Tədqiqatlar göstərir ki, peşəkar inkişafın treninqlər və seminarlar kimi formaları öz qarşılarında konkret və kifayət dərəcədə dar məqsədlər qoyur, onların tanınması pedaqoqların vahid ixtisasartırma modelini tədricən dağıdır və bu modeli peşəkar inkişaf üzrə qeyri-formal aktivlik də daxil olmaqla, diversifikasiya olunmuş xidmət göstərilməsi əvəz edir [Avalos, 2011].

Azərbaycan müəllimləri kurikulumun islahatı prosesində qısamüddətli təlim kursları formatında onlara təklif olunan peşəkar inkişaf imkanlarından əhəmiyyətli dərəcədə asılı idilər. Ancaq sorğu edilmiş

müəllimlər peşəkar inkişaf üçün istər daxildə, istərsə də məktəb hüdudları xaricində çoxçeşidli imkanların olmasını vacib hesab edirlər. Müəllimlər yeni kurikulumun keyfiyyətli tətbiqini təmin etmək məqsədilə islahatların gedişində təhsili idarə edən yerli orqanlardan dəstək almalı idilər. Tədqiqatlar yerli təşkilatların meydana çıxan problemlərin həll edilməsində müəllimlərə kifayət dərəcədə effektiv kömək etmədiklərini və gündəlik işdə onlara daimi dəstək olmadıqlarını göstərdi.

Respondentlərin yalnız yarısı belə peşəkar dəstək aldıqlarını qeyd etdilər. Bu, iki əsas formatda həyata keçirilmişdir: təhsilin idarə olunması üzrə yerli orqanlarda metodistlərin dəstəyi və ən yaxşı məktəblər bazasında dayaq mərkəzləri (bu mərkəzlər müəllimlərin fasiləsiz peşəkar məsləhət mərkəzləri qismində çıxış edirlər) tərəfindən təqdim olunan kömək.

Müəllimlər kurikulum mərkəzlərinin dəstəyini metodistlər tərəfindən göstərilən köməyə nisbətən daha az əhəmiyyətli qiymətləndirdilər. 2013-cü ildə sorğu edilmiş müəllimlərin əksəriyyəti metodistlərlə yeni kurikulumun tətbiqinə həsr olunmuş görüşləri “çox faydalı”, yaxud “müəyyən dərəcədə faydalı” hesab etdilər. Bununla belə, müəllimlər peşəkar dəstəyin birdəfəlik deyil, daimi olmasına üstünlük verərdilər. 2013-cü ildə sorğu edilmiş müəllimlərin, demək olar ki, dörddə bir hissəsi metodistlərdən daimi kömək alınmasında çətinliklərin olduğunu qeyd etdilər. Müəllimlərin 10%-nə yaxın hissəsi yeni kurikulumun tətbiqində heç bir metodiki dəstək almadıqlarını bildirdilər.

Müəllimlərə peşəkar inkişaf sahəsində yerli səviyyədə digər tədbirlərin təsirini təhlil etmək təklif olunduqda, onlar təhsil üzrə konfranslar və seminarların, digər məktəblərə gedişlərin və elmi tədqiqatlarda iştirakın daha az faydalı olduğunu qeyd etdilər.

2013-cü ildə sorğulanmış müəllimlərin əksəriyyəti məktəb daxilində dəstəklənməni isə “faydalı” kimi qiymətləndirdilər. Ancaq bu zaman müəllimlərin 20 faizi məktəb metodiki şuralarının fəaliyyətinə, müəllimlərin dəstəklənməsi üzrə məktəb rəhbərliyinin səylərinə, eləcə də təcrübəli və cavan müəllimlər arasında təcrübə mübadiləsinə “kafi” və ya hətta “pis” qiymət verdilər. Yeni kurikulumun tətbiqi zamanı çətinliklərlə qarşılaşan sorğu iştirakçıların yarıdan çoxu ya kömək üçün öz müəllim-həmkarlarına müraciət etmişlər (qeyri-rəsmi kömək), ya da öz suallarına cavabı ədəbiyyatda və internetdə axtarmışlar (müstəqil təşkil olunmuş kömək), ancaq müəllimlərə kömək edilməsinə görə rəsmi məsuliyyət daşıyan məktəb müdiriyyətinə və ya metodistlərə müraciət etməmişlər.

2013-cü ilin sorğularına görə müəllimlər peşəkar inkişaf formalarının müxtəlifliyinə getdikcə daha çox əhəmiyyət verirlər. Məsələn, sorğulanmışların yarıdan çoxu onlara, bir pedaqoq olaraq peşəkar icmalarda iştirakın güclü təsir etdiyini bildirdi. Əgər 2010-cu ildə (monitorinqin başlanğıc mərhələsi) sorğulanmış müəllimlər peşəkar inkişaf üzrə bütün tədbirləri müsbət qiymətləndirməyə meyilli idilərsə, 2013-cü ildə isə onların nöqteyi-nəzərləri son dərəcə tənqidi oldu. Müəllimlər peşəkar inkişaf üçün müxtəlif imkanlar axtarırlar, öz fərdi ehtiyaclarına uyğun olanlara üstünlük verirlər və iştirakçılar arasında əməkdaşlıq üçün uzunmüddətli imkanlar təqdim edirlər.

Kurikulum islahatı müəllimlərə daha bir çağırış təqdim etdi, bu, məktəb səviyyəsində, eləcə də bütövlükdə peşəkar icma səviyyəsində müəllimlər arasında müştərək iş və etibar mədəniyyətinin formalaşdırılması zərurətindən ibarətdir. “Sosial sistemdə radikal dəyişikliklərə uğrayan və inamsızlıq mühitindən (sovet sistemi) daha açıq mühitə

keçid alan etibarın əhəmiyyətini azaltmaq olmaz” [БПoya e1: a1., 2010, P. 365]. Azərbaycanda təhsil sistemində mühüm qərarların qəbul edilməsində və fəal qarşılıqlı münasibətdə peşəkarlar daha geniş cəlb olunmalıdır.

Müəllimlərin fikirləri və qiymətləndirmələrinin tez və təhrif olunmadan təhsil sahəsində tətbiqinə kömək edən effektiv mexanizm yaratmaq lazımdır. Hələ ki, əsasən, müəllimlərə öz şəxsi tələbatlarına uyğun şəkildə qərarlar qəbul edə bilən təlim iştirakçıları kimi deyil, peşəkar inkişaf proqramlarından fayda alanlar kimi baxıldığı müəllimlərin ənənəvi hazırlanması sistemi üstünlük təşkil edir.

Biz Azərbaycan müəllimlərinin, onlara yeni kurikulumun tətbiqi çərçivəsində təqdim olunmuş peşəkar inkişaf imkanları haqqında təsəvvürlərini təhlil etdik. Monitorinq tədqiqatların gedişində alınmış kəmiyyət nəticələri müəllimlərin peşəkar dəstəyə ehtiyacı olduqlarını və bunu əldə etmək istədiklərini göstərdi.

Müəllimlər dəyişikliklər edilməsinin zəruriliyini etiraf edirlər və öz tədris metodlarını təkmilləşdirməyə can atırlar. Bu zaman Azərbaycan məktəbləri müəllimlərinin peşəkar həyatına pozitiv təsiri baxımından 2008-ci ilin kurikulum islahatlarının effektinin tamamilə məhdud olması ilə razılaşmaq məcburiyyətindəyik. Bölgənin digər ölkələrində olduğu kimi, “bu, qeyri-müəyyənliyə və saysız-hesabsız vəzifələrin yaranmasına gətirib çıxardı” [Joldoshaliyeva, 2006, P. 801], peşəkar inkişaf sahəsində müəllimlərin fasiləsiz dəstəklənməsinin təmin edilməsi üçün böyük səylər tələb etdi. Tədqiqatın nəticələri müəllimlərin dəstəklənməsi üçün nəzərdə tutulan peşəkar inkişaf proqramlarının islahatın əvvəlində formalaşaraq islahat prosesində meydana çıxan ehtiyac və ya tələbləri tam şəkildə təmin edə bilmədiyini göstərdi.

Cəmiyyətin ehtiyacları daim dəyişir, müvafiq olaraq onun məktəblərə münasibətdə gözləntiləri başqa şəklə düşür və hər gün hər bir şagirddə yeni ehtiyaclar meydana çıxır— pedaqoqun işi çox çətin və çox dinamikdir. Hər gün çoxsaylı qərarlar qəbul edərək, müəllim tam məcmuda vəziyyət və şəraitləri nəzərə almalı və həmişə öz fəaliyyəti və ona nail olmanın başlıca məqsədini şüurunda saxlamalıdır [Leithwood, Steinbach, 1995]. Ehtimal ki, müəllimlərin peşəkar inkişafının və müəllimlər arasında, həmçinin müəllimlərlə təhsil siyasətinin hazırlanmasına məsuliyyətli orqanlar arasında etimad mədəniyyətinin formalaşmasının “yenidən dərk edilməsi” [Silovaet al., 2010] zərurəti məhz belə xüsusiyyətli peşəkar fəaliyyətlə şərtlənir.

Mövcud peşəkar inkişaf sistemi, görünür ki, Azərbaycan müəllimlərinin tədris metodlarının təkmilləşdirilməsinə münasibətini dəyişdirdi. İslahat onların diqqətini ixtisasın artırılması sahəsində təlim kursları və seminarları kimi ənənəvi vasitələrdən daimi əməkdaşlığa və peşəkar dəstəklənmənin daha interaktiv və birgə formalarına yönəltdi. Ancaq “peşəkar inkişafın təşkilinin hər mümkün formatlarından biri lokal (hüdudlu) və məhduddur peşəkar inkişafın heç də bütün formaları, hətta nisbətən müsbət təsir göstərənləri belə, bütün müəllimlər üçün uyğun gəlmir. Bəzi formalar nisbətən daha münasib və başqaları ilə müqayisədə təlim üçün daha effektlidir” [Avalos, 2011, P. 17].

Peşəkar inkişafın müxtəlif formalarının müxtəlif mədəniyyətlərdə və müxtəlif məktəblərdə keçirilmiş tədqiqatları təlim prosesinin effektivliyinə təhsil sisteminin quruluşu və fəaliyyəti, təhsil və islahat sahəsindəki siyasət, məktəb mədəniyyəti, köhnəlmiş əqidə və baxışlar, tarixi şərait, məktəblərdə şagirdlərin etik və sosial tərkibi (əqidələr, ənənələr), sosial və mədəni dəyərlər də daxil olmaqla, bir çox amillərin təsir

etdiyini təsdiqlədi. Peşəkar dəstək-lənmə sisteminin təsir qüvvəsini qiymət-ləndirən zaman bu amillərlə hesablaşmamaq olmaz.

Bizim tərəfimizdən aparılmış tədqiqat işini Azərbaycanın təhsil sistemində müəllimlər və təhsil siyasətinin formalaşdı-rılmasına məsuliyyətli orqanlar arasında etibar və əməkdaşlıq mədəniyyətlərinin yaradılması yolunda ilk addımlardan biri kimi nəzərdən keçirmək olar. Monitorinqin başlanğıc mərhələsinin nəticələrinin Azərbaycanın təhsil sisteminin rəhbər orqanlarına təqdim edilməsindən sonra qəbul olunmuş mentorluğun inkişafı üzrə eksperimental proqramın həyata keçirilməsi haqqında qərar belə əməkdaşlığın çox ümidlər verən nümunəsi kimi görünür. Müəllimlərin fikir və mülahizələrinin öyrənilməsinə istiqamətlənmiş, zəruri məlumatı həm təhsil sistemi rəhbərliyinə, həm də peşəkar icmaya təqdim edəcək yeni tədqiqat proqramı islahatın ayrılmaz hissəsini təşkil etməlidir. Müəllimlər və təhsil siyasətini formalaşdıran orqanlar arasındakı dialoqda mühüm olan vasitəçilik rolu təhsil tədqiqatçılarının üzərinə düşür, onlar milli təhsil icması çərçivəsində effektiv tərəf müqabilliyinə kömək edirlər.

## İstifadə edilmiş ədəbiyyat

1. Avalos B. Teacher Professional Development in “Teaching and Teacher Education” over Ten Years //Teaching and Teacher Education, 2011, Vol.27. №1. p.10-20.

2. Gorgodze S. Analyses of Teacher Policies in Georgia. Tbilisi: The International Institute for Education Policy, Planning and Management, 2013.

3. Joldoshalieva R. Continuous Teacher Professional Development in Post-Soviet Kyrgyzstan // Quality in Education: Teaching and Leadership in Challenging Times, 2006, №2, p.788-806. http://ecommons.aku. edu/ book_chapters/89

4. Karimova Y., Kazimzade E., Silova I. Azerbaijan: The Role of Teachers in Education Reform // N.Ivanenko (ed.) Education in Eastern Europe and Eurasia. London: Bloomsbury, 2014, p. 259-276.

5. Silova I., Kazimzade E. The Changing Status of the Teaching Profession in Post-Soviet Azerbaijan: Implications for Teacher Education // K.G.Karras, C.C.Wol-huter (eds) International Handbook of Teacher Education World-Wide. Issues and Challenges. Athens: Atrapos Editions, 2010, Vol. II. p. 55-72.

6. State Commission on Education Reforms of the Azerbaijan Republic Education Reforms Program of the Republic of Azerbaijan. Baku: The Government of the Republic of Azerbaijan, 1999. http://www.e-qanun.az /frame-work/5363.

7. UNICEF Teachers: A Regional Study on Recruitment, Development and Salaries of Teachers in the CEECIS Region. Geneva: UNICEF Regional Office for Cen-tral and Eastern Europe and the Common-wealth of Independent States (CEECIS), 2011.

8. UNICEF Azerbaijan Office Review of the National Curriculum. Final- Report. Final Consultant (A. Crisan) Report to UNICEF, 2007.

**У.Микаилова,**
**Э.Казимзаде**

**Как учителя воспринимают свое профессиональное развитие в контексте реформы образования в Азербайджане**

**Резюме**

В статье анализируются суждения учителей об эффективности системы профессиональной поддержки в контексте Проекта развития сектора образования, осуществленного в Азербайджане в 2008-2013 гг. Используются данные двух опросов — самооценки учителей и оценки

хода реформы учебных программ начальной школы, которые проводились трижды, на разных этапах осуществления реформы. В традиционной системе повышения квалификации учителям отведена роль получателей выгоды от профессиональных программ развития. Однако в последнее десятилетие органы, ответственные за разработку образовательной политики, поощряют учителей к принятию самостоятельных решений в отношении профессионального развития, исходя из индивидуальных потребностей. Участие учителей в проектировании программ профессионального развития повысит эффективность воздействия обучения в рамках таких программ на качество преподавания. Исследователям образования отводится важная роль посредников в диалоге между учителями и руководством системы образования, они могут способствовать формированию эффективного партнерства в рамках образовательного сообщества.

**U.Mikayilova,**
**E.Kazimzade**

**Teachers as reflective learners: teacher perception of professional development in the context of Azerbaijan's curriculum reform**

**Summary**

This paper builds off current research trends on teacher professional development in Eurasian countries, including the diversification of teacher training, opportunities for teacher professional networking, and developing collaborative community culture within schools and the broader education community. This study aims to explore teacher beliefs and thoughts on the effectiveness of professional development, specifically in the context of the Education Sector Reform Project (ESRP), implemented in Azerbaijan during 2008-2013. This study analyzes quantitative data from two surveys- the teacher self-assessment and the education reforms assessment. In the prevailing conventional teacher training system, teachers are perceived as beneficiaries of professional development programs. However, over the last decade, policy-makers are beginning to attach greater importance to professional development where teachers are seen as learners that are encouraged to make professional development decisions based on their needs. Including teachers in the design of teacher professional development programs might be suggested as a way to ensure teacher learning activities have a greater impact on the quality of teaching. Such a participatory approach that strengthens teachers' roles as decision makers in their professional development has the potential to advance the teacher support during education reforms. Education researchers also have an important role as facilitators mediating dialogue between teachers and policy-makers in order to build the effective partnership within the education community.

**“Вопросы образования”, 2016, №2.**



# İNNOVASİYALAR VƏ KREATİV DÜŞÜNCƏNİN FORMALAŞDIRILMASI

**Sevinc Niftiyeva**
***Şirvan şəhərindəki, N.Quliyev adına tam orta məktəbin müəllimi, "Ən yaxşı müəllim" müsabiqəsinin qalibi***

***Açar sözlər:*** *innovasiya, interaktivlik, düşüncə, müxtəliflik, kompetensiya, müqayisə, məntiqi suallar, əsaslandırma, fərziyyələr.*

***Ключевые слова:*** *инновация, интерактивность, мышление, разнообразие, компетентность, сравнения, логические вопросы, технико-экономические, предположения.*

***Key words:*** *innovation, interactivity, thinking, diversity, competence, comparison, logical questions, feasibility, assumptions.*

Tədris prosesində şagirdlərdə innovasiyalar və kreativ düşüncənin formalaşdırılması interaktiv dərsin başlıca məqsədlərindən biridir. İnsanın intellektual fəaliyyətinin, kəşfinin, ixtirasının son pilləsi kimi qəbul edilən innovasiyalar tədris prosesində yeniləşməni, keyfiyyət dəyişmələrini tətbiq etməyi tələb edir. Bunun üçün müəllim bilik və təcrübələrə müxtəlif tərzdə yanaşmaq bacarığına malik olmalıdır. Çalışmalıdır ki, bildiklərini istifadə etməyə, kreativ düşünməyə sahib olsun. Müəllim öz üzərində müntəzəm çalışmalı, uşaqları yeni ideyalara meyil etməyə həvəsləndirməlidir. Motivasiya da məhz bu prosesdə yaranır. Deyildiyi kimi, burada mövzu müxtəlifliyi və yanaşma üsulları əsas rol oynayır. Daha konkret desək, bu maraqlar bir neçə formada, o cümlədən rasional və emosional, faktlar və ümumiləşdirmələr, kollektiv və fərdi, informasiyaverici, problemli, izahedici və axtarış xarakterli ola bilər. Dərs zamanı bu maraqların hər hansı birindən istifadə etməklə şagirdlərdə təxəyyül, təfəkkür, yaddaş və nitqi inkişaf etdirmək olar. Bu prosesdə şagirdlərin müstəqil təfəkkür tərzinin inkişafına, onların dərsə yanaşma mexanizmlərinə xüsusi fikir verilməlidir. Müəllim-şagird, şagird-şagird, şagird-müəllim əməkdaşlığı şagird şəxsiyyətinin yaradıcı qabiliyyətini üzə çıxarmağa imkan yaradır. Orta məktəbdə riyaziyyat dərslərində şagirdin inkişafının əsasında riyazi biliklərinin tətbiqi və İKT ilə bərabər pedaqoji texnologiyalar durur. Dərs prosesində hər hansı bir mövzunun struktur quruluşunu məntiqi quraraq, onu bugünkü reallıqlarla uzlaşdırıb müzakirəyə çıxardırlar. İnteraktiv fəaliyyətdə olan şagirdlər bilik qazanmaqla bərabər öz düşüncələrini inkişaf etdirir, təhlil, müqayisə, proqnoz etmək kimi dərketmə üsullarına yiyələnmiş olurlar. Konkret riyazi biliklər əsasında istifadə olunan bu bacarıqlarla şagirdlər yeni bilik qazanırlar. Yaradıcı işin effektiv alınması üçün mütləq riyazi tapşırığın mürəkkəblik səviyyəsi nəzərə alınmaqla bərabər şagirdlərin

inkişaf səviyyəsi də nəzərə alınmalıdır. Əgər şagird tədris prosesində öyrənmə vasitələrindən mükəmməl istifadə edə bilirsə, onda o, verilən tapşırığın öhdəsindən də mükəmməl gələ bilir.

Şagirdlərdə öyrənmə bacarıqları interaktiv təlim fəaliyyətinə əsasən inkişaf edərək formalaşır. Komandada müzakirə, dəyirmi masa, karusel, anlayışların çıxarılması və s. strukturlarında interaktiv fəaliyyətdə olan hər bir şagird öz biliklərini komanda üzvləri ilə paylaşaraq, bu paylaşmada qazanılan yeni biliklərlə öz köhnə biliklərini daha da təkmilləşdirərək onu yeni formada qurur. Bu yaradılan yeni bilik interaktiv dərs prosesində ümumi sinif müzakirəsi obyekti olanda o hər bir fərddə fərdi olaraq daha da genişlənərək zənginləşir. İKT və interaktiv təlim texnologiyası ilə 8-ci sinifdə qurulan riyaziyyat dərsində “Pifaqor teoremi” mövzusunda əsas məqsəd şagirdlərin bu tip həyati bacarıqlar anlamını üzə çıxartmaq və onu yeni bilgilərlə genişləndirməkdir. İnteraktiv dərs promethan-




elektron lövhə ilə keçirilir. Şagirdlərə yuxarıdakı şəkilli məsələ ilə müraciət edilir:

–Verilən məsələni həll etmək üçün nə etməliyik?

Hər bir komanda müzakirədən sonra öz fikirlərini bildirir və onu əsaslandırmağa çalışırlar. Müəllim müzakirədən alınan bilikləri və şagirdlərin əvvəlki biliklərini nəzərə alaraq qruplara bərabər tapşırıqlar verərək həm teoremin isbatı, həm də tələb edilən məsələnin asan yolla tapılması qaydası göstərilir. Mövzu müzakirəsi zamanı şagirdlər kvadratın sahəsi, üçbucağın sahəsi, iki ifadənin kvadratların cəmi mövzularını da araşdıraraq mövzu ilə əlaqəli səbəblərini tapıb göstərirlər. Təbii ki, mövzunun açılmasında müəllim tərəfindən qabaqcadan elektron lövhədə (promethan) hazırlanmış tapşırıqların da böyük rolu vardır. Məhz bu tapşırıqların köməkliyi ilə şagirdlər məntiqi, tənqidi və inkişafetdirici təfəkkürü inkişaf etdirərək doğru istiqamətə yönəlir. Və şagirdlər özləri nəticə çıxararaq Misir üçbucaqları haqqında məlumatlar alır, Pifaqor ədədlərini tanıya bilir. Bundan sonra nümunələrə əsasən tapşırıqlar yerinə yetirməyə çalışırlar. Verilmiş riyazi materialları komandada araşdıraraq öz fikirlərini ümumi müzakirəyə çıxardırlar. Tapşırıqlar şagirdlərdə mühakimə, təhlil, sintez, proqnoz kimi intellektual bacarıqların inkişafına yönəlmişdir. Bununla bərabər riyaziyyatın keçmiş dərslərinin bugünkü günlə bağlanması fəndaxili inteqrasiyaya gətirib çıxartmaqla bərabər, şagirdlərdə riyazi biliklərin real biliklərə çevrilmə, ondan gündəlik yaşam tərzində yararlanma bacarıqlarını inkişaf etdirməyə yönəlmişdir. Müəllimin əsaslı və məntiqi qoyduğu sual və tapşırıqları sərbəst interaktiv fəaliyyətdə yerinə yetirən şagirdlər öz düşüncə tərzlərini bu istiqamətdə qururlar. Komandada görülən işin nəticəsi hər bir komandanın seçdiyi liderin təqdimatında edilir. Təqdimatın qiymətləndirilməsi komanda üzvlərinin və müəllimin iştirakı ilə aparılır. Qiymətləndirmənin bu üsulu şagirdlərin diqqətli olmasına, onların irəli çəkilən fərziyyə və ehtimallarının nə qədər əsaslı olmasını təyin etməsinə, termin və lüğətlərdən düzgün istifadə etməsinə, qiymətləndirməyə obyektiv yanaşma baca-

rıqlarının daha da inkişaf etdirilməsinə yönəlmişdir. Sinifdə olan 4-5 komandanın təqdimatı, şagirdlərin ayrı-ayrı düşüncə tərzi, riyazi hesablamalara fərqli yanaşmaları, əldə etdikləri biliklərlə keçmiş biliklərinin özünəməxsus müqayisəsi şagird təfəkkürü qarşısında geniş bir dərketmə xüsusiyyəti yaratmış olur. Bu biliklər birliyində hər bir şagird öz daxili potensialının imkanları qədər yararlanır, öz biliklərini təkmilləşdirir və ona yeni biliklər qataraq öz biliklərini özünəməxsus şəraitdə zənginləşdirir. Təlimdə interaktiv metod tədris prosesində şagirdlərin fəallığını artırmaqla yanaşı, eyni zamanda verilmiş mövzunun şagirdlər tərəfindən yüksək səviyyədə araşdırılandan sonra əldə olunan nəticə ilə paylaşanda mövzu şagirdlər tərəfindən yüksək səviyyədə öyrənilir. Bu isə metodik cəhətdən əlverişli üsulla ötürülərək mənimsənilən biliklərdən xeyli fərqlənir. Və əsas fərq ondan ibarətdir ki, şagirdlər passiv olaraq bilik qəbul etmirlər, onlar özləri tələb olunan materialları araşdıraraq nəticə əldə edib onunla paylaşırlar. Paylaşma zamanı müxtəlif yanaşmalarla təmasda olan şagird təfəkkürü müxtəlif düşüncə formalarına yiyələnmə bacarıqlarını inkişaf etdirir. Bu üsulla əldə edilən bilik və bacarıqlar XXI əsrin şagird kompetentliyinin əsaslarıdır.

*Rəyçi: prof. Ə.Ağayev*

## İstifadə edilmiş ədəbiyyat

1. Ağayev Ə. Seçilmiş əsərləri. I-II cildlər. Bakı, 2014.
2. Qədimova X. İnteraktiv təlim metodları. Bakı, 2005.
3. Abdulla Q. Təlim və tərbiyədə interaktiv texnologiya. Bakı, 2001.
4. Veysova Z. Fəal/interaktiv təlim: Müəllimlər üçün vəsait. Bakı, 2007.
5. Гасанов М. Формализация, моделирование и информационные модели. Гянджа, 2009.

**С.Нифтиева**

**Инновации и формирование креативного мышления**

**Резюме**

В статье процессе обучения для создания интереса у учащихся и занятиями используют любой из доступных форм для развития воображения, памяти и речи. Изменяя традиционный подход к образованию учащихся наряду с другими предметами и на уроках математики упоминают о создании интерактивных мероприятий и презентаций их навыков обучения о которых представлены более очевидные примеры.

В статье окончательно отмечается высокая роль интерактивного метода в восприятии и активности учащихся.

**S.Niftiyeva**

**Innovation and formation of creative thinking**

**Summary**

In the article, to rouse interest for lesson using of one of any existed forms on the learning process is development of the students’ memory, imagination and speech abilities. Founding of the students’ activity at math lesson together other subjects with changing the approach to the traditional education is also conversed and given examples more obviously about the growth directions of their learning abilities.

As a result, the role of the interactive method on students’ actvity and improvement of the traning is notified in the article.

# PEDAQOJİ TEXNOLOGİYALARIN TƏHSİL SİSTEMİNDƏ ROLU

**Şəfa Kazımova,**
***ARTPİ-nin böyük elmi işçisi***

***Açar sözlər:*** *təhsil, ibtidai təhsil, texnologiya, pedaqoji texnologiya, təhsil sistemi.*
***Ключевые слова:*** *образование, начальное образование, технология, педагогическая технология, система образования.*
***Key words:*** *education, primary education, technology, pedagogical technology, the educational system.*

Azərbaycan Respublikasında mədəniyyətlərin qovuşması və müasir iqtisadi yüksəlişlərin fonunda təhsil, tərbiyə və mədəni inkişaf sahəsində uğurlu nailiyyətlər əldə edilmişdir. Bu nailiyyətlərin əsası ötən əsrin 90-cı illərinin əvvəllərində Azərbaycanın öz müstəqilliyini əldə etməsi ilə qoyulmuşdur. "Təhsil haqqında" Azərbaycan Respublikasının Qanununun qüvvəyə minməsi ilə təhsil sahəsində bir sıra mütərəqqi yeniliklər həyata keçirildi. Təhsilin mövcud struktur, forma və məzmun məsələləri bir də nəzərdən keçirildi. Tədris fənlərinin bəzilərinin adı və məzmunu dəyişdirildi və dərs saatları yenidən formalaşdırıldı. Həyata keçirilən yenilənmə prosesləri zamanı dərsdə istifadə olunan tədris metod və formaları da dəqiqləşdirildi və yeni optimal metodların istifadəsinə rəvac verildi. Bütün bu proseslər təhsilin dünya təhsil məkanına inteqrasiya olunması vacibliyini yaratdı və bir sıra xarici ölkələrlə tədris-təcrübə mübadiləsi həyata keçirildi. Bu mübadilə prosesi zamanı xarici ölkələrin tədris təcrübələri mənimsənildi və yeni pedaqoji texnologiyalar Azərbaycan tədris sisteminin mərkəzinə gətirildi. Bu baxımdan pedaqoji texnologiyaların təhsil sistemində rolu və onun tətbiq üsulları günümüzdə xüsusi aktuallıq kəsb etdi.

Tədris planına daxil edilən yeni fənlərdən biri də texnologiya fənnidir. Texnologiya sözünün mənası aydınlaşdırılan zaman hər şeydən öncə onun hərfi mənası açıqlanmalıdır. "Texnologiya" yunan sözü olub (techne (bacarıq)+logos (öyrənmə)) məhsulun hazırlanması bacarığı, istehsal proseslərinin yerinə yetirilməsi üçün üsul və vasitələr haqqında biliklər toplusu deməkdir (3). "Texnologiya" sözü tədqiqatçıların qarşısına daha çox dəqiq elmlərin termini kimi çıxsa da, son illərdə ümumilikdə təhsil prosesinin və humanitar elmlərin də məzmununda bu sözə sıx-sıx rast gəlinir. Çünki texnologiya və texnoloji proseslər həyatımızın bütün hissələrinə nüfuz etmişdir və onu asanlaşdırmışdır. Bu mənada, texnologiya dedikdə hər hansı bir prosesin öyrənmə ardıcıllığı və ümumilikdə, prosesin özünün mahiyyəti başa düşülür.

Ümumiyyətlə, texnologiya dedikdə sistemli, məqsədyönlü əməliyyatlar komplekti başa düşülməlidir. Bu əməliyyatlar komplekti nə qədər optimal olsa, insan həyatını bir o qədər asanlaşdırar. İnsanlar yaşamın, fəaliyyətin asanlaşdırılması və optimallaşdırılması baxımından fərqli texnologiyalar axtarışında olduqlarından daim yeni texnoloji sistemlər yaradır və onu tətbiq edirlər. Bu baxımdan texnologiya dedikdə, fəaliyyətin optimallaşdırılması başa düşülür. Lakin nəzərə almaq lazımdır ki, hətta çətin

əməliyyatların da özünün texnologiyası vardır və texnologiya hər hansı bir fəaliyyətin prosedural mahiyyətidir.

Texnologiya anlayışından bəhs edərkən onun növlərinə nəzər salmaq və təhsil prosesində istifadə olunan texnoloji fəaliyyətləri, eləcə də pedaqoji texnologiyaları araşdırmaq lazım gəlir. Texnologiyalar istifadə olunduğu sahələrdən asılı olaraq bir neçə növdə təsnif oluna bilər. Məsələn, informasiya texnologiyaları, pedaqoji texnologiyalar, hesablama texnologiyaları və s.

“Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası” sənədində göstərilir ki, təhsil prosesində texnologiyalara əsaslanmadan təhsilin optimal qurulması mümkün deyil və texnologiyalardan istifadə edilərək təlimin təşkil olunması dövlət siyasətinin mühüm tərkib hissəsidir. “Təhsilin inkişafında mühüm irəliləyişlərə nail olmuş ölkələrin təcrübəsi göstərir ki, informasiya-kommunikasiya texnologiyalarına əsaslanan, yaradıcı düşüncəni inkişaf etdirən və təhsilalanın fərdi xüsusiyyətlərini nəzərə alan müasir, fəal-interaktiv təlim metodları daha yüksək nəticələr verir (1).

Araşdırma sahəmiz təhsil olduğundan texnologiyaların pedaqogikaya aid olan növü – pedaqoji texnologiyalar bizim daha çox diqqətimizi cəlb edir. Pedaqoji texnologiyalar müxtəlif alim və tədqiqatçılar tərəfindən araşdırılmışdır. Azərbaycanda pedaqoji texnologiyalar geniş tədqiqata cəlb olunmuş, dərsin pedaqoji texnologiyalara əsasən qurulması və tədrisin fəallaşdırılmasının mühüm amil olduğu vurğulanmış və müəyyən edilmişdir ki, “öyrənənlərin təlim prosesinin mərkəzinə gətirilməsi; tədris-təlim prosesinin qurulmasında öyrənənin şəxsiyyətin bütövlüyünün nəzərə alınması (ekzistensiallıq); inkişafetdiricilik; inteqrativlik; fundamentallıq” (4) pedaqoji texnologiyalara əsasən qurulmuş dərsin əsas prinsipləridir. Göründüyü kimi, bu tədqiqatlarda dərsə və pedaqoji texnologiyalara bütöv bir komponent kimi yanaşılmış və onun hərtərəfli olduğu nəzərə çatdırılmışdır.

Tədris prosesinin yeknəsəqlikdən qurtarmasının yolunu pedaqoji texnologiyaların tətbiqində görən alimlər bu qənaətə gəldilər ki, “Standart dərslərin yaratdığı yorğunluq xofunun, problemlərin həllinə yönəldilmiş qeyri-standart, fəal, yaxud konstruktiv dərs modellərindən istifadə olunmasının müsbət və ya mənfi tərəfləri barədə müzakirələr keçirilməli, təkliflər verilməlidir. Müxtəlif improvizələrdən, pedaqoji yanaşmalardan istifadə etməklə dərslərini şagirdlər üçün sehrli aləmə çevirə bilən müəllimlərin fikirləri dinlənilməli, təcrübələri müzakirə obyektinə çevrilməlidir” (5).

Pedaqoji texnologiyalardan istifadə tədris prosesini canlandırır və onu şagirdlərin daha çox maraq göstərdiyi bir obyektə çevirir. Əgər tədris prosesində pedaqoji texnologiyalardan və informasiya-kommunikasiya texnologiyalarından istifadə təmin olunmasa tədrisin keyfiyyəti arzuolunan dərəcəyə yüksələ bilməz. Belə ki, hazırda məzmun standartları elə təşkil olunmuşdur ki, onu texnologiyalardan istifadə etmədən reallaşdırmaq qeyri-mümkündür.

Pedaqoji texnologiyalardan istifadə təhsil sisteminin inkişafını təmin edən əsas amillərdəndir. Həm informasiya-kommunikasiya texnologiyaları, həm də pedaqoji texnologiyalar tədris prosesinin optimallaşdırılması üçün vacib amillərdir. Müəllimin əməyini yüngülləşdirən, şagirdin zehni inkişafını və təfəkkür proseslərini formalaşdıran pedaqoji texnologiyalar daim tədris prosesində istifadə olunmalı və ümumilikdə təhsil sisteminin inkişafını təmin etməlidir.

Pedaqoji texnologiyalar arasında daha çox istifadə olunanlar fərqli tədris üsullarıdır. Dərslərin keçirilmə texnologiyası, öyrətmə üsulları, məzmun standartlarının reallaşdırılma strategiyaları müəllimlər

tərəfindən fərqli yollarla tətbiq olunur. Yaradıcı müəllimlər mövcud texnologiyaları öz təcrübələri ilə zənginləşdirirlər. Tətbiq olunan pedaqoji texnologiyaların metodikasına müəyyən dəyişiklik edib onu mövcud tədris sisteminə uyğunlaşdıran yaradıcı müəllimlər zaman keçdikcə özləri də müəyyən öyrətmə texnologiyaları ilə işləyirlər və onu həmkarları ilə bölüşürlər.

İnformasiya Cəmiyyətinin ən mühüm tələblərindən biri də müasir inkişafa uyğun yaradıcı, informasiya-kommunikasiya vasitələrindən səmərəli istifadə edə bilən vətəndaşların yetişdirilməsidir. Məktəblər hazırda bu vəzifənin öhdəsindən asanlıqla gəlirlər. Regionlarda olan tədris müəssisələrinin də hazırda maddi-texniki baza təminatı formalaşdırılmaqdadır. Müəllimlər müxtəlif öyrədici kurslarda iştirak edərək öz peşəkarlıqlarını inkişaf etdirirlər.

Elektron lövhələrdən, fəal təlim metodlarından istifadə təhsilalanların səriştəli şəxsiyyət kimi formalaşmasını təmin edir. Şəxsiyyətyönlü təhsil məzmununun yaradılması "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" sənədində nəzərdə tutulan əsas strateji hədəflərdən biridir.

Araşdırmalar nəticəsində təsdiq olundu ki, pedaqoji texnologiyalardan istifadə olunması təhsili inkişaf etdirən əsas amillərdən biridir. Eyni zamanda pedaqoji texnologiyalardan yerli-yerində istifadə olunmalı və o, inkişaf etmiş təhsil-tədris prosesinin vasitələrindən biri olmalıdır. Pedaqoji texnologiyalardan istifadə həm təhsilalanların, həm də təhsilverənlərin keyfiyyət göstəricilərindən biridir və texnologiyalar daim tədris prosesinin mərkəzində dayanmaqla onun inkişafını təmin edir.

*Rəyçi: prof. İ.İsayev*

## İstifadə edilmiş ədəbiyyat

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. //Azərbaycan məktəbi, 2013, №5.
2. Əliyeva F., Məmmədova Ü. Müasir təlim texnologiyaları. Dərs vəsaiti. Bakı, 2014.
3. Quliyeva S., Qafarova N., Ağayeva N. və b. İnformatika. Dərs vəsaiti. Bakı: Çaşıoğlu, 2011.
4. Mehrabov A. Müasir dərs: onun təşkili və gedişinə qoyulan əsas tələblər. "Təhsil problemləri" qəzeti, 2013, 31 iyul.

**Ш.Кязимова**

**Роль педагогических технологий в системе образования**

**Резюме**

В статье описывается роль педагогических технологий в системе образования. Педагогические технологии являются основными факторами, обеспечивающиеся развитие системы образования. Педагогические технологии облегчают работу учителя, формирует умственное развитие и когнитивные процессы учащегося.

**Sh.Kazimova**

**The role of pedagogical technologies in the educational system**

**Summary**

The article is about the role of pedagogical technologies in the educational system. Using pedagogical technologies are the main factors which it provides the development of the educational system. Pedagogical technologies what facilitates the work of the teachers, forms the student's mental development and cognitive processes, it always should be used in the teaching process and totally provide the development

# TƏLİMİN KEYFİYYƏTİ VƏ PEDAQOJİ TEXNOLOGİYALAR

**Zülfiyyə Vəliyeva,**
***Respublikanın əməkdar müəllimi***

***Açar sözlər:*** *innovasiya, yeni pedaqoji texnologiyalar, metodlar, təhsilin keyfiyyəti, innovativ təlim metodları, təfəkkür məktəbi, pedaqoji texnologiya.*

***Ключевые слова:*** *инновация, новые педагогические технологии, методы, качество образования, инновационные методы обучения, школа мышления, педагогическая технология.*

***Key words:*** *innovation, new teaching technologies, methods, the quality of education, innovative teaching methods, school of thinking, educational technology.*

Təlimin keyfiyyətinin artırılması müasir dövrün əsas tələblərindən biridir. Çünki keyfiyyət cəmiyyətdə təhsil prosesinin konkret göstəricisidir.

Təlimin keyfiyyətinə təsir edən amillərdən biri pedaqoji texnologiyalardır. Kurikuluma dair sənədlərdə təlim prosesində innovasiyalardan geniş istifadə edilməsi, yeni təlim texnologiyalarının tətbiqi xüsusi qeyd edilmişdir. Bu istiqamət təhsilin məzmununun səmərəli mənimsənilməsini təmin edən, yeni pedaqoji texnologiyalardan fəal istifadə edən səriştəli təhsilverənin formalaşdırılmasına xidmət edir. Burada təhsilverənlərin peşəkarlığının yüksəldilməsi, təhsilalanların nailiyyətlərinin qiymətləndirilməsi üzrə yeni sistemlərin qurulması, təhsilalanların istedadının aşkar olunması və inkişafı ilə bağlı aparılan işlər, habelə xüsusi qayğıya ehtiyacı olanlar üçün inklüziv təlim metodologiyasından istifadə xüsusi diqqətə alınır. “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nda ölkəmizdə qabaqcıl texnologiyalara əsaslanan infrastruktura malik təhsil sisteminin yaradılması nəzərdə tutulmuşdur. Ona görə də innovativ təlim metodlarından müasir pedaqoji texnologiyalardan səmərəli istifadə sürətlənməkdədir.

Təlim prosesi zamanı yüksək keyfiyyətlərə malik şagirdlərin yetişdirilməsi mexaniki hafizəyə deyil, tənqidi təfəkkürə istinad etməyi və idraki fəallığın yüksəldilməsini tələb edir. Yeni pedaqoji texnologiyaların tədris prosesinə tətbiq edilməsində əsas məqsəd ondan ibarətdir ki, şagirdlər çox qısa yolla heç bir səhvə yol vermədən nəticəyə yaxınlaşa bilsinlər.

Araşdırmalarda göstərilir ki, tədrisdə texnoloji yanaşma tədris prosesini dəqiq idarə etməyə imkan verməklə bərabər, təhsil məqsədlərinin əvvəlcədən yüksək səviyyədə yerinə yetirilməsinə zəmin yaratmalıdır. Müəllim pedaqoji texnologiyaların tədris prosesinə tətbiqi üçün öz işini elə qurmalıdır ki, interaktiv təlim metodlarının imkanlarından ən optimal yollarla istifadə etməyə nail olsun. Təlim üçün metod və texnologiyalar qarşıya qoyulmuş məqsəd və şəraitdən asılı olaraq seçilməlidir. Əsas odur ki, təlim uşaqları inkişaf etdirsin, onlara düşünmək, müstəqil fikir söyləmək, biliklərini tətbiq edə bilmək bacarıqları aşılasın; onlarda ünsiyyət, anlaşma mədəniyyəti, öz problemlərini həll edə bilmək qabiliyyəti formalaşdırsın.

Müəllim təlim zamanı yeni pedaqoji texnologiyaların tətbiqinə nail olursa, o, təşkilatçılığı üzərinə götürməklə şagirdlərin fəallığını artırmış olur ki, bu da onların interaktiv fəaliyyətlərinin artmasına, inteqrativ bilik və bacarıqlarının dərinləşməsinə, intellektual səviyyələrinin yüksəlməsinə səbəb olur. Azərbaycan müstəqilliyini bərpa etdikdən sonra demokratik yolla vətəndaşa, ümumilikdə cəmiyyətə xidmət yüksəlmiş, həmçinin müstəqil dövlətin iqtisadi-siyasi, mədəni yüksəlişinə və gənc nəslin inkişafına gətirib çıxarmışdır.

"Azərbaycan Respublikasının təhsil sahəsində İslahat Proqramı" haqqında (15 iyun 1999-cu il) qəbul edilmiş sərəncam təhsilin inkişafına təkan vermişdir. İslahatın tələbləri baxımından təhsilləndirici, tərbiyələndirici və inkişafetdirici sahələr diqqət mərkəzində olmaqla yeni-yeni təlim metodları – innovativ elmi metodları yaranmışdır. Bu da öz növbəsində dünya təhsil sisteminə, qloballaşma prosesinə yaxınlaşmağa imkan vermişdir.

Fəal təlim, interaktiv təlim, tənqidi, didaktik, məntiqi, nəzəri, deduktiv, texniki, produktiv (yaradıcı), sistemli təfəkkür və s. meydana gəlmişdir [3. s.13]. Təlim zamanı müəllim bu üsullardan istifadə etməklə humanistliyi, şəxsiyyətin yetişməsini, müəllim-şagird münasibətlərinin əməkdaşlığını və s. önə çəkməlidir.

Müasir dərs şagirdlərdə müəyyən bilik əldə etməsinə və vərdişlərin yaranmasına, formalaşmasına imkanlar açır [5. s.52].

Təlimin formalaşdırılmasında bir sıra metodlar xüsusi əhəmiyyət daşıyır:

Kollektivlə iş, qruplarla iş, cütlərlə iş, fərdi iş, beyin həmləsi, anlayışların çıxarılması, müzakirə, rollar üzrə oyun, layihələrin hazırlanması, təqdimatlar, debat, müzakirə xətləri, esse, fasiləli oxu üsulu, qrup bölgüsünün aparılmasına dair və s. göstərmək olar. Fənnin tədrisi prosesində şagird nailiyyətlərinin qiymətləndirilməsi də diqqət mərkəzində olmalıdır. Qiymətləndirmənin də bir çox meyarları vardır:

Pedaqoji tədqiqatlardan məlum olur ki, tədrisin əsasını üç məsələ təşkil edir: "Nə üçün öyrənilməlidir?", "Nə öyrənilməlidir?", "Necə öyrənilməlidir?".

"Nə üçün öyrənilməlidir?" sualına cavab verən cəhətlər tədris prosesinin məqsəd və vəzifələrini təşkil edir. Bu, əsasən, tədris proqramlarının izahat vərəqində, metodik vəsait və göstərişlərdə, "Pedaqogika" dərsliklərində öz ifadəsini tapır.

"Nə öyrənilməlidir?" sualına cavab Dövlət Təhsil Standartlarında, kurikulumlarda, tədris proqramlarında, dərslik və dərs vəsaitlərində öz əksini tapır. "Nə öyrənilməlidir?" sualına cavab, əsasən, dövlət tərəfindən müəyyənləşdirilir və demək olar ki, uzun müddət dəyişilməz olaraq qalır. "Necə öyrənilməlidir?" sualına cavab isə bu artıq metodikadır. Bu məsələlər fənnə daxil olan materialların harada, kim tərəfindən, necə və hansı metodlarla öyrədilməsini əhatə edir.

Qeyd edək ki, tədrisə daxil olan materialları "necə öyrətmək", hansı iş formalarından, metod və vasitələrdən istifadə etmək barədə hökmlər vermək, resept xarakterli göstərişlər vermək çətindir. Çünki öyrətmə prosesi orijinal, bir-birinə bənzəməyən, yalnız müəllimin öyrətmə metodikasına xas olan bir pedaqoji prosesdir. Bunun nəticəsidir ki, tədris prosesində istifadə olunan metodlar, iş formaları haqqında bu gün də çox müxtəlif fikirlər söylənilir. Məlum olduğu kimi, tədris prosesində əsas üç amil iştirak edir: müəllim, şagirdlər və tədris olunan materiallar. Təlimin metod və vasitələrindən bəhs edən pedaqoq alimlər bunlardan birini və ya ikisini əsas götürür və onları aktuallaşdırır, onlara üstünlük verirlər. Bu

proses müxtəlif dövrlərdə müxtəlif cür işlənmiş və həyata keçirilmişdir.

2005-ci ildə Azərbaycan Avropa məkanına inteqrasiya olundu, Boloniya təhsil prosesinə qoşuldu, qlobal dünyaya daxil oldu. Məhz bu dövrdən etibarən interaktiv təlim metodları meydana gəldi. Bu metodlar tez bir zamanda rəğbət qazandı və məktəblərimizdə geniş istifadə edilməyə başlandı. İnteraktiv təlim metodları şagirdlərin fəal idrak fəaliyyətinə əsaslanan və təhsil prosesinin digər iştirakçıları ilə əməkdaşlıq şəraitində həyata keçirilən təlimi nəzərdə tutur.

Bu, bir növ “necə öyrətmək” məsələsini özündə ehtiva edir. Strategiyada göstərilir ki, “Təhsilin inkişafında mühüm irəliləyişlərə nail olmuş ölkələrin təcrübəsi göstərir ki, informasiya-kommunikasiya texnologiyalarına əsaslanan, yaradıcı düşüncəni inkişaf etdirən və təhsilalanın fərdi xüsusiyyətlərini nəzərə alan müasir, fəal-interaktiv təlim metodları daha yüksək nəticələr verir. Həmin məqsədlə, davamlı olaraq mütərəqqi tədris metodlarının yaradılması və müəllimlərin səriştəsinin artırılması təhsil siyasətində mühüm yer tutur”.

Bu gün məktəblərimizdə tədris prosesində interaktiv təlim metodlarından istifadə getdikcə genişlənməkdə, artmaqda və öz səmərəsini verməkdədir. Avropa alimlərinin fikrincə, səmərəli, təkmil pedaqoji fəaliyyətin yarısı pedaqoji texnologiyaların, o biri yarısı isə müəllimin pedaqoji ustalığının payına düşür.

İnteraktiv təlim metodları müəllim və şagirdlərin fəal əməkdaşlığını ön plana çəkir. Burada yalnız müəllim-şagird əməkdaşlığı deyil, həm də şagird-şagird əməkdaşlığı əsas yer tutur. "İnteraktiv təlim zamanı müəllimin başlıca vəzifəsi şagirdlərə yardımçı olmaqdan, təlim prosesində şagirdlərin fəaliyyətini əlaqələndirib onları yaradıcı axtarışa həvəs yaratmaqdan, axtarıb araşdırmağı, nəyi harada öyrənməyi öyrətməkdən ibarətdir" (2. I c, s.636).

Həm bilik mənbəyinə, həm şagirdlərin qavrama, dərketmə xüsusiyyətlərinə, həm də müəllim ilə şagirdlərin əməkdaşlığına əsaslanan interaktiv təlim metodları şagirdlərin təfəkkürünü, yaradıcı fəaliyyətini inkişaf etdirir. "Təcrübə göstərir ki, şagirdlərin təfəkkür müstəqilliyi mühüm didaktik əhəmiyyət kəsb etməklə yanaşı, həm də zəruri tərbiyəvi əhəmiyyət kəsb edir. Belə ki, şagird müstəqil bilik qazanmaqla (yaradıcı və tənqidi təfəkkür prosesində) həm də fəal həyat mövqeyinə malik olur, onda təşəbbüskarlıq, öz gücünə inam, çətinliklərdən qorxmamaq kimi müsbət iradi keyfiyyətlər formalaşır" (3. s. 6).

Fəal və interaktiv metodların tətbiqi prinsipləri müəyyənləşdirilmişdir ki, onlar aşağıdakılardır:

1) Şəxsiyyətyönümlü təlim prinsipi; 2) fəal idrak prinsipi; 3) inkişafetdirici təlim prinsipi; 4) qabaqlayıcı təlim prinsipi; 5) təlim və tərbiyənin çevikliyi prinsipi; 6) əməkdaşlıq prinsipi; 7) dialoji təlim prinsipi (4. s. 9-10).

Tədris prosesinin optimallaşdırılması üçün bir neçə texnologiyanı eyni zamanda tətbiq etməyə imkan yaranır. Pedaqoji prosesin və inkişafın təmin olunmasında çox böyük əhəmiyyət kəsb edən həmin imkanlar həyatiliyi, müasir mövqeyi ilə diqqəti cəlb edir. Çünki şəxsiyyətin hərtərəfli, ahəngdar inkişafını təmin edən əlverişli şəraitin yaradılması, eyni zamanda, təlim prosesinin optimallaşmasına, qazanılan biliklərin, anlayışların şüurluluğuna, əhatəliliyinə, bu məqsədlə yeni təlim metodlarının meydana çıxmasına və tətbiqinə gətirib çıxarır. Bütün bunlar isə öz növbəsində yeni təlim texnologiyalarının effektliyini inandırıcı şəkildə nəzərə çatdırır. Məhz, buna görədir ki, tanınmış pedaqoq alimlər və mütəxəssislər pedaqoji texnologiyaların izahında mahiyyət dolğunluğuna xüsusi diqqət yetirirlər. Belə bir

mövqe yeni təlim texnologiyalarını daha yaxşı başa düşməyə, onların səmərəli inkişafına və tətbiqinə zəmin yaradır. Unutmaq olmaz ki, hər hansı təhsil sahəsinin özünəməxsus xüsusiyyətlərini bilmədən, bunlara uyğun yanaşma tərzlərini, vasitə və yolları müəyyənləşdirmədən yeni təlim texnologiyalarını mükəmməl mənimsəmək, bu istiqamətdə qarşıda duran vəzifələri uğurla həyata keçirmək mümkün deyil. Bütün bunlar da heç şübhəsiz, təlim keyfiyyətinin yüksəlməsinə, təkmilləşməsinə bilavasitə təsir göstərir, şagirdlərin mənimsəmə keyfiyyətini artırır.

***Rəyçi: prof. M.Həsənov***

## İstifadə edilmiş ədəbiyyat

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. // Azərbaycan məktəbi, 2013, №5.
2. Hüseynzadə R. Pedaqogika. 2 cilddə. I cild. Bakı, 2013.
3. Həsənov M. Bəhmənova C. İbtidai siniflərdə fəal və interaktiv metodlardan istifadənin nəzəri-praktik məsələləri. (Metodik vəsait). Bakı, 2008.
4. Veysova Z. Fəal (interaкtiv) təlim. Müəllimlər üçün vəsait. Bakı, 2007.

**З.Велиева**

**Качество обучения и педагогические технологии**

**Резюме**

В статье рассказывается о том что в процессе обучения выделяется в основном три фактора: "Почему изучать", "Что изучать" , "Как изучать". Вот эти три фактора претворяются в жизнь методами обучения.

В разных исторических периодах использовались разные методы обучения. А после интеграции в европейский сектор образования широко используются активные и интерактивные методы обучения. Эти методы оптимизируют процесс образования и положительно влияют на качество обучения. Использование новых технологий в процессе обучения успешно используется с хорошими результатами в наших школах.

**Z.Valiyeva**

**The quality of training and pedagogical technologies**

**Summary**

The article explains that the learning process is released mainly by three factors: "Why study", "What to study," "How to study". These three factors are coming to life teaching methods.

In different historical periods used different teaching methods. After integration into the European education sector are widely used active and interactive teaching methods. These methods optimize the educational process and positively affect the quality of education. The use of new technologies in the process of training is successfully used with good results in our schools.

# FƏNLƏRİN TƏDRİSİNDƏ MÜASİR YANAŞMALAR

**Xəyalə Əhədova,**
***Salyan şəhərindəki, 4 nömrəli tam orta məktəbin müəllimi***

*Məqalədə müasir dövrdə dərsə verilən tələblərdən, mövzuya uyğun metodların seçilməsindən, konstruktivist və situativ baxışlardan, təlim nəticələrinin məqsədəuyğun şəkildə reallaşdırılmasından bəhs edilir.*

***Açar sözlər:*** *müasir yanaşma, interaktiv metod, situativ təlim, modelləşdirmə.*
***Ключевые слова:*** *современный подход, интерактивные методы, ситуативное обучение, моделирование.*
***Key words:*** *modern approach, interactive method, situational training, modeling.*

Azərbaycan Respublikasının ümumtəhsil məktəblərində kurikulumların tətbiqi dərin və əhatəli biliyə, bacarıq və vərdişlərə, yüksək intellektə, geniş dünyagörüşünə malik olan və onu daim inkişaf etdirməyə qadir vətəndaş formalaşdırmağa xidmət edir.

Mövcud kurikulumların əsas xüsusiyyəti ondan ibarətdir ki, biliklərin mənimsənilməsi prosesi müəllimin rəhbərliyi altında mümkün olur. Müəllim bu prosesi nəzarətdə saxlamalıdır.

Bu gün hər bir müəllim inkişaf etməkdə olan cəmiyyətin tələblərinə cavab verə bilən üsullar və təşkilati formalardan istifadə etməlidir. Yalnız bu yolla şagirdlər tədris məzmununu mənimsəyən və sərbəst olaraq yeni informasiya istehsalına malik ola bilərlər. Əksər müəllimlər üçün bu yanaşmalar olduqca cəsarətli görünə bilər. Ona görə də, müəllimlərin belə yanaşmalara yiyələnməsi xeyli zamandan sonra mümkün ola bilər. Onlar peşəkar müəllim kimi yetişmək prosesində müasir yanaşmalara gündəlik işin mahiyyəti kimi baxılır.

Nəticəyönümlü standartlarla müəyyənləşdirilən təlim prosesində şagirdlərin fənn üzrə bilik və bacarıqlara yiyələnmələri üçün pedaqogika elminin müəyyən etdiyi müxtəlif təlim texnologiyaları, onların ayrı-ayrı metodik elementlərindən istifadə edilməklə yanaşı, şagirdlərin yaş və psixoloji xüsusiyyətlərinə uyğun gələn müasir üsullardan və texnologiyalardan istifadə edilməlidir. Belə ki, interaktiv metod və üsullar şagirdlərin maraqlarını təmin etməklə fəallığının artmasına, birgə fəaliyyət bacarıqlarının inkişafına gətirib çıxaracaq.

Fənn kurikulumlarının tətbiqi ilə əlaqədar olaraq riyaziyyat fənninin tədrisinə verilən tələblər öz əvvəlki funksiyasını dəyişmiş yeni konsepsiyaya uyğun reallaşdırılmaqdadır. Riyaziyyat üzrə kurikulumda fənnin məzmunu elə müəyyənləşdirilmişdir ki, böyüməkdə olan nəsil məktəbi bitirəndə müəyyən sahə üzrə sistemli həyati biliyə sahib olsun, həyat hadisələrini lazımi şəkildə dərk etməyə, onun haqqında sərbəst, müstəqil fikir yürütməyə münasibət bildirməyi bacarsın. Təlimə müasir baxışlar konstruktivist və situativ təlim konsepsiyalarına əsaslanır. Əvvəllər olduğu kimi bilik, əsasən, sabit obyekt kimi qəbul olunmur, o, fərdin obyektə dair təcrübələri əsasında formalaşdırılır. Konstruktivist baxışa görə,

təlim konstruktiv prosesdir və bu proses zamanı şagird biliyin daxili mənzərəsini, yəni təcrübənin şəxsi interpretasiyasını yaradır. Bu cür təsvir davamlı olaraq dəyişikliyə açıqdır, onun strukturu və əlaqələndirilməsi digər bilik strukturları üçün əsas təşkil edir. Təlim ilə bağlı situativ baxış sosial, mədəni, tarixi və siyasi kontekstdə fəal iştirak vasitəsilə həyata keçirilir. Bu baxışa görə, təlim ortaq fəaliyyət metodlarına malik qruplara və cəmiyyətə nüfuz etməklə kollektiv təlimə çevrilir. Modelləşdirmə, müzakirə və qərar qəbuletmə kimi situativ birgə fəaliyyətlər aktiv iştirakın mühüm elementi ortaq təcrübələrə əsaslanan dialoq vasitəsilə dəstəklənir.

Tədris prosesində çalışmaq lazımdır ki, şagirdlər fərziyyələr irəli sürsün, onları ya təsdiq, ya da inkar etsin, dialoq prosesində inandırıcı arqumentlər formalaşdırsın, şagirdlər aldıqları cavablarla məntiqi nəticə çıxarmağa istiqamətləndirilsin. Dialoq yolu ilə şagirdlər “riyazi düşünməyə” alışırlar. Onları bu müasir yanaşmalara həvəsləndirmək üçün riyazi ideyalarla əlaqələri yaxşılaşmalı, ortaq bilikləri tətbiq etmək üçün şagirdlərə hər cür imkan yaradılmalıdır. Belə hallarda müəllim hər bir şagirdlə dialoqa girməli, problemlərinin həlli üçün onlarla birgə çalışmalıdır. Müəllimlər tez-tez şagirdlərlə ünsiyyətə girməli, onlar belə ünsiyyətdən zövq və həvəslə ayrılmalıdırlar.

Çünki qiymətləndirmə müəllimlə şagird haqqında tam təsəvvür almağa imkan verir. Qiymətləndirmə zamanı şagirdlərin riyazi anlayış və prosedurları anlamalarını, əməliyyatı sürətlə yerinə yetirmələrini və resurslardan səmərəli şəkildə istifadə etmə qabiliyyətlərini müəyyən edir.

Konstruktivist və situativ baxışa görə, təlim real həyati şəraiti əks etdirən zəngin məzmun kontekstində baş verməlidir. Bunun üçün konstruktiv proses həyata keçirilməli və məktəbdənkənar mühitə də sirayət etməlidir. Burada əsas elementlər idraki təlim, real həyati problemlərin həlli ilə bağlı əməkdaşlığın əks etdirilməsi və məsələ həlli zamanı mümkün metod və üsullardan istifadənin təmin olunmasıdır. Məzmun sahəsi üzrə düşünmə prosesinin sürətləndirilməsində şagirdin nümayiş etdirdiyi effektivlik onun təlimi üçün ölçü rolunu oynayır. Belə yanaşmada əsas çətinlik təlimə nəzarəti şagirdə doğru yönəldərkən əmələ gəlir. Bu zaman təlimin xüsusiyyəti və biliklər nəzərə alınaraq təlim məqsədləri şagirdlərin özlərinin ehtiyaclara görə müəyyən olunmalı, nəzərdə tutulan fəaliyyətlər onların yaşadığı dünyagörüşünə görə formalaşdırılmalı, qabiliyyətlərin aşılanması üçün şagirdlər yoldaşları ilə birgə işləməli, aparılan qiymətləndirmələr isə təhlilə əsaslanmalıdır.

Kurikulum çərçivə sənədi yeni təlim üsullarının əsas prinsiplərini əks etdirir və bu prinsiplər bütövlükdə təlimin yeni konsepsiyası ilə əlaqədardır. Bu konsepsiyaya görə təlim prosesi əvvəlcədən müəyyənləşdirilmiş nəticələrə əsaslanır və bu prosesdə müəllim əlaqələndirici, istiqamətverici və məsləhətverici subyekt kimi, şagirdlər isə müstəqil, tədqiqatçı subyekt kimi fəaliyyət göstərir. Bu zaman təlimin və tədrisin yeni konsepsiyasının, başqa sözlə standartlar şəklində ifadə olunmuş təlim nəticələrinin məqsədəuyğun şəkildə reallaşması üçün müəllim aşağıdakı prinsiplərə əməl etməlidir:

Müasir dövrdə riyaziyyat təliminə qoyulan tələblər fərqlidir. Bu tələblərdən biri riyaziyyat dərsində həyata keçirilən təlim-tərbiyə, proseslərin ideya siyasi səviyyəsi dövrün, zamanın tələblərinə cavab verməlidir. Həmçinin öyrədilən tədris materialının məzmunu yüksək elmi səviyyədə olmalı, riyaziyyat elminin inkişafını göstərməlidir. Müəllim tədris olunan mövzu ilə bağlı ən

son yeniliklərlə tanış olmalı, lazım gələrsə şagirdləri məlumatlandırmalıdır. Tələblər sırasına daxil olanlardan biri də hər bir dərsin məqsədləri (inkişafetdirici, öyrədici, tərbiyəedici) əvvəlcədən dəqiq müəyyənləşdirilməli, dərsin quruluşu və bütün mərhələlərinin reallaşdırılmasının həmin məqsədlərə nail olmağa yönəldilməsi tələbidir. Bu zaman müəllim elə bir metod seçməlidir ki, dərsin məqsədlərinin həyata keçirilməsinə və təlimin məzmununa müvafiq olsun, həm də şagirdlərin idraki fəallığını, təfəkkürünü və hafizəsini inkişaf etdirsin, onlarda axtarıcılıq, tədqiqat aparmaq həvəsi yaratsın.

Müəllimlər bilirlər və bilməlidirlər ki, onlar şagirdlərin zəkasını inkişaf etdirməyə borcludurlar. Bu, bizim şərəfli vəzifəmizdir. O da məlumdur ki, son texnologiyalar şagirdlərdə məntiqi, riyazi düşüncə və mühakimələri inkişaf etdirməyə kömək edir. Şagirdləri bunlardan çəkindirmək yox, onları tələb olunan qaydada işləməyə həvəsləndirmək lazımdır.

Müasir dövrdə riyaziyyat dərsinə verilən mühüm tələblərdən biri də dərsdə şagirdlərin müstəqil işlərə cəlb olunması, onların müstəqil fəaliyyət göstərməsidir. Müasir riyaziyyat dərsləri İKT ilə təmin olunmalı və onlardan dərsin məqsədinə uyğun istifadə olunmalıdır. Fəndaxili və fənlərarası inteqrasiyadan geniş istifadə olunmalı, yeni materialın öyrədilməsi inteqrativ formada aparılmalıdır. Dərsin bütün mərhələləri bir-birini tamamlamalı, hər mərhələyə ayrılan vaxt düzgün müəyyənləşdirilməli, həm müəllimdə, həm də şagirddə vaxtdan qənaət etmək vərdişi yaradılmalıdır. Müasir dərsin mühüm tələblərindən biri də şagirdlərin bilik və bacarıqlarının inkişafına nəzarət etmək, onların səviyyəsini qiymətləndirməkdir. Bunun üçün sistematik şəkildə formativ və summativ yoxlamalar keçirilməli, nəticələr təhlil olunmalı, maraqlı tərəflər məlumatlandırılmalıdır. Dərsdə səmimi ünsiyyətə və qarşılıqlı hörmətə söykənən işgüzar mühit yaradılmalı, şagirdlər qorxu hissindən uzaq azad və rahat şəraitdə fəaliyyət göstərməlidirlər.

***Rəyçi*: *prof. H.Əhmədov***

## İstifadə edilmiş ədəbiyyat

1. Əhmədov A., Abbasov Ə. Təhsilin prioritet istiqamətlərindən biri. // Azərbaycan məktəbi, 2013, №5.
2. Abdullayeva E. Riyaziyyat təliminin təşkilində nəzərə alınmalı əsas tələblər. “Azərbaycan müəllimi” qəzeti, 25 oktyabr 2012, №42.
3. Süleymanov V. Dərs prosesində şagirdlərin yaradıcı təfəkkürünün inkişafı. // Azərbaycan məktəbi, 2016, №2.
4. Məktəb kurikulumları. Bakı, 2015.

**X.Ахедова**

**Современные подходы в преподавании предметов**

**Резюме**

В статье говорится о требованиях, данных к уроку в современной эпохе, о выборе адекватных к теме методов, о конструктивистских и ситуационных взглядах, о целесообразных реализации.

**Kh.Ahadova**

**Modern approaches to teaching the subjects**

**Summary**

The article is dedicated to the requirements of lessons in modern time, appropriate methods chosen to the topics, constructive and situational thoughts, and realization of training results.



<u>*Multikulturalizm*</u>

# MULTİKULTURALİZM - HƏYAT TƏRZİMİZDİR

**Elmira Qasımova,**

***ADPU-nun dosenti, tarix üzrə fəlsəfə doktoru***

***Açar sözlər:*** *multikulturalizm, tolerantlıq, sivilizasiyalar, millətlər, etnoslar.*

***Ключевые слова:*** *мультикультурализм, толерантность, цивилизации, нации, этнические группы.*

***Key words:*** *multiculturalism, tolerance, civilizations, nations, ethnicities.*

Dini və milli tolerantlıq, millətlərarası münasibətlərin inkişaf etdirilməsi müasir dövrün ən aktual problemlərindəndir. Bütün bunları özündə ehtiva edən multikulturalizm – mədəniyyətlərin və sivilizasiyalararası dialoqun tərəfidir. O, ayrıca götürülmüş ölkədə və bütövlükdə dünyada müxtəlif millətlərə və məzhəblərə məxsus insanların mədəni müxtəlifliklərinin qorunması, inkişafı və harmonizasiyasına, azsaylı xalqların, dövlətlərin milli mədəniyyətinə inteqrasiyasına yönəldilmişdir. Multikulturalizm, ilk növbədə tolerantlığın təcəssümüdür. Onsuz insanlar arasında qarşılıqlı anlaşma, qarşılıqlı zənginləşmə, dostluq və əməkdaşlıq mümkün deyildir.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin sərəncamı ilə 2016-cı il Azərbaycanda "Multikulturalizm ili" elan olunmuşdur. Sərəncama müvafiq olaraq ölkəmizdə önəmli tədbirlər həyata keçirilməkdədir. Bununla əlaqədar tədris müəssisələrində çalışan pedaqoji işçilərin, ilk növbədə tarixin tədrisi ilə məşğul olanların üzərinə multikulturalizm haqqında elmi biliklərin dərindən öyrənilməsi və yayılması kimi çox məsuliyyətli vəzifələr düşür. Düzdür, indiyədək ölkəmizin məktəblərində tədris materiallarının tərtibində bu məsələyə ayrıca yer verilməmişdir. Hazırda isə universitetlərdə "Azərbaycan multikulturalizminə giriş" bir fənn kimi öz yerini tutmaqdadır. Multikulturalizmin dövlət siyasəti olmasını nəzərə alaraq bu fənnin tədrisi bakalavr pilləsinin bütün ixtisasları üçün nəzərdə tutulmuşdur. Fənnin tədrisinə 45 saat ayrılmışdır, bunun 30 saatı mühazirə, 15 saatı məşğələdir.

"Azərbaycan multikulturalizminə giriş" fənninin tədrisi istər ölkəmizdə, istərsə də xarici ölkələrdə az müddətdə böyük uğurlar qazanmışdır. Hazırda xarici və yerli universitetlərdə Azərbaycan multikulturalizmi fənninin tədrisi layihəsi çərçivəsində bu fənn 13 xarici universitetdə və respublikamızın 28 ali təhsil müəssisəsində tədris edilir. Azərbaycanın iki universitetində multikulturalizm kafedrası yaradılıb. İndi Rusiya, Türkiyə, Portuqaliya, Gürcüstan, Litva, Çexiya, İtaliya, Bolqarıstan, Belarus, İndoneziya kimi ölkələrin ali təhsil ocaqlarında tələbələr Azərbaycan multikulturalizminin mahiyyəti və önəmi ilə bağlı ətraflı məlumat almaq imkanına malikdirlər. Bu, bir tərəfdən xalqımızın dəyərli əyani təbliği və təşviqi olmaqla yanaşı, digər tərəfdən ölkə həqiqətlərinin beynəlxalq ictimaiyyətə çatdırılmasının ən optimal variantıdır. Yuxarıda adı çəkilən universitetlərin tələbələri bu mövzunun araşdırılması üçün Azərbaycana səfər edir, əsl reallığı gözləri ilə görürlər. Ölkəmizin multikultural cəhətdən zəngin Quba, Qusar, Xaçmaz, Nabran kimi bölgələrində yəhudi, ləzgi, qırız, xınalıq, buduq, hapıt və başqa

dillərdə danışan xalqlarda intişar tapan azərbaycançılıq ideyalarının şahidi olurlar. Bu xalqların gənclərinin Qarabağ döyüşlərində fədakarlıqla vuruşub, şəhid olmaları əsl tolerantlıq nümunələri kimi qarşılanır. Eyni zamanda, Qubada aşkar edilən məzarlığı görənlər onu törədənlərin insanlıq simasını itirdiklərinin şahidi olur. Xarici turistlərin Azərbaycanda mövcud olan milli-etnik birliyə, onlar arasındakı doğma münasibətlərə heyran qalmaları bu baxımdan təbiidir.

Təcrübə təsdiq edir ki, multikulturalizm informasiya və qlobal cəmiyyətin formalaşmasına, xalqların tarixi məsuliyyətinin artmasına, siyasətə və idarəçiliyə, sülhə və beynəlxalq münasibətlərə, mədəniyyətlərin təkamülünə böyük təsir göstərir.

Avropa, ümumiyyətlə, Qərb dövlətləri multikulturalizmi idarə etməyin kifayət qədər mürəkkəb kulturoloji vəzifə olması ilə əlaqədar ondan imtina etmişlər. Halbuki Azərbaycanda multikulturalizm dövlət siyasəti səviyyəsinə qaldırılmışdır. Tarixi keçmişini unutmayan xalqımız aqil babalarımızın yolu ilə gedərək, necə deyərlər, multikulturalizmə sahib çıxmışlar. Artıq sübut olunmuşdur ki, müasir multimədəni cəmiyyətlər kulturoloji strategiyalara əsaslanan düşünülmüş multikulturalizm siyasəti olmadan sabit inkişaf yolu tuta bilməzlər. Bunun sübutlarından biri də odur ki, Azərbaycanda milli mədəniyyətə müvəffəqiyyətlə inteqrasiya olan müxtəlif xalqların nümayəndələri harmonik inkişaf edirlər. Multikulturalizmdən imtina etmək qarşıdurmaya, fobiyaya, milli və dini münaqişələrə şərait yaratmaq deməkdir. “Multikulturalizm başqa dinin, millətin nümayəndəsinə insani münasibət deməkdir” (K.Abdulla).

Azərbaycan multikulturalizmi haqqında danışanlar ona da əsaslanırlar ki, ölkəmizdə multikulturalizm dəyərinə verilən qiymət onun nəticəsidir ki, ümummilli liderimiz Heydər Əliyevin siyasi iradəsi nəticəsində Azərbaycanda tarixən sahib olduğu tolerantlıq və multikulturalizm ənənələrinin yenidən bərpası zəruri olmuşdur. Ümummilli lider multikulturalizm siyasətinə hər zaman ölkəmizin demokratik inkişafının ayrılmaz tərkib hissəsi kimi baxmışdır.

Azərbaycan multikulturalizmi xalqımızın tarixi kökündə formalaşan və yaşayan möhtəşəm mənəvi, elmi-siyasi qaynaqlara əsaslanmışdır. İstər tarixi mənbələr, istərsə ədəbi-bədii abidələrdə yaşayan bu qaynaqlar xalqımızın daxili aləmini, ruhunu, mənəvi zənginliyini adekvat göstərən etibarlı mənbədir. Bu gün xalqımıza xas olan tolerant, multikultural dəyərlər əsrlər boyu əcdadlarımızın canında, qanında yaşayıb bizə miras qalan dəyərlərdir.

Bəşəriyyətə xas olan bir fikir, düşüncə forması kimi Azərbaycan multikulturalizmi öz mənşəyini dünyanın ən qədim düşüncə abidəsi olan türk mifindən və azərbaycanlı peyğəmbər Zərdüştün “Avesta” abidəsindən, “Kitabi-Dədə Qorqud”dan alır. Azərbaycan klassiklərinin əsərlərində də başqa dinin, millətin nümayəndələrinə böyük hörmət və ehtiramla yanaşılmışdır.

Müasir dünyamızda yaşanan gerçəkliklər multikulturalizm tolerantlığını insan həyatının ən ali həqiqətinə çevirmişdir. Yaxın-uzaq ölkələrdə baş verən müharibələr, humanitar fəlakətlər, insan faciələri üçün çıxış yolunun ancaq tolerantlıqda olduğu bir daha təsdiq olunur. Tolerantlığın olmaması üzündən “tarix qan dəryasına” bürünmüşdür. Belə siyasətin nəticəsi olaraq, Avropa dövlətlərinin yeni dövrdə apardıqları qanlı döyüşlərin sayını yada salmaq kifayətdir: 1500-1599-cu illər – 87 döyüş; 1600-1699-cu illər – 239 döyüş; 1700-1799-cu illər – 781 döyüş; 1900-1940-cı illər artıq 892 döyüş. Təkcə XX əsrdə ABŞ 235 hərbi əməliyyat keçirib. Atlantik üzərindən aparılan və 300 illik utandırıcı tarixə ancaq 1865-ci ildə son qoyulan qara qul ticarətinin davam etdiyi müddətdə on beş milyon azad

insan bu siyasətin qurbanı olmuşdur. Braziliyada təkcə 1900-1950-ci illər arasında düz 100 qəbilə birliyi, tayfa yox olmuşdur. Əlbəttə, o cinayətləri törədənlər söz yox ki, "heç zaman fikir azadlığına dözümlülük (tolerantlıq) göstərə bilməyən"lər olmuşdur. Şərq və Qərbin təmasında qərar tutan tarixi tolerantlıq ənənələrinə sahib olan müstəqil Azərbaycan dövləti bu gün reallaşdırdığı multikultural siyasətlə dünya ölkələri içərisində ön cərgədə gedir. Hətta dünyanın ən böyük dövlətləri belə bunu etiraf etməkdən çəkinmirlər. Azərbaycan Respublikası Prezidenti İlham Əliyevin məqsədyönlü siyasəti bu sahədə müəyyən edilmiş multikultural hədəflərə doğru aydın istiqamət götürmüş, təhsildə, idmanda, musiqidə böyük uğurlar qazanılmışdır.

Respublikamızda bu istiqamətdə həyata keçirilən tədbirlər beynəlxalq miqyasda birmənalı şəkildə təqdir olunur. Ölkəmizdə fərqli milli, dini mənsubiyyəti olan icmalar, müxtəlif millətlərin nümayəndələri qarşılıqlı əməkdaşlıq və mehribançılıq şəraitində tarix boyu yaşamış və bu gün də yaşamaqdadırlar.

Prezident İlham Əliyev bu məqamı xüsusi qeyd edərək demişdir: "Əsrlər boyu bütün mədəniyyətlər, dinlər və etnik qrupların nümayəndələri Azərbaycanda bir ailə kimi yaşamışlar. Bu bizim böyük sərvətimizdir. Azərbaycan kimi ölkələrin nümunəsi yaxşı göstəricidir ki, multikulturalizm yaşayır və bu müsbət meyilləri stimullaşdırmalıyıq". Milli-mənəvi dəyərlərinə, tolerantlıq ənənələrinə sadiq, müasir, güclü bir dövlət kimi Azərbaycan bu gün özünün hərtərəfli inkişafı ilə bütün müsəlman aləmi üçün xoş bir nümunəyə, parlaq tərəqqi modelinə çevrilmişdir.

Bütün bunlar həm də onun nəticəsidir ki, hər bir azərbaycanlı, ölkəmizdə tarixən yaşayan hər bir adi insan birgəyaşayış normasını xalqımızın milli-mənəvi dəyərlərinin ayrılmaz hissəsi sayır, dövlətçilik ənənələrimizdə multikulturalizmi təqdir edir.

Multikulturalizmin prinsip və müddəaları həyatın bütün sahələri ilə bərabər təhsil sahəsinə də nüfuz edir. Məhz multikultural təhsil bütün millətlər, etnoslar üçün həyati tələbat kimi qiymətlidir. Azərbaycan cəmiyyətinin indiki inkişaf səviyyəsində multikultural təlim-tərbiyə artıq məktəb təhsilində özünü qabarıq göstərməkdədir. Müdriklər həmişə belə hesab etmişlər ki, insan yalnız təhsil sayəsində həyatda sülh, əmin-amanlıq, qarşılıqlı anlaşma və əməkdaşlıq, tolerantlıq münasibətləri qazana bilər.

Təhsilə multikultural yanaşma insanların müxtəlif etnik mədəniyyətlərə yiyələnməsi, tolerantlıq, fərqli şəraitlərə uyğunlaşma, dialoqa girmək bacarığı yaradır. O bir tərəfdən təhsilalanların həyata pozitiv köklənmələrinə kömək edir.

Azərbaycan tarixi multikulturalizm ənənələri ilə zəngindir. Bir-birini izləyən və tamamlayan fakt və hadisələr Azərbaycanda insanların tarixi yaddaşına, milli mentalitetinə, xalqlar arasında tolerantlıq münasibətlərinin formalaşmasına bu gün son dərəcə müsbət təsir göstərir. Artıq məktəblərdə "Azərbaycan tarixi" fənn kurikulumuna əsasən tədris olunur və həmin tarixin qədim zamanlardan bugünədək ən mühüm tarixi hadisə, proses və təzahürləri barədə ətraflı məlumatlar əldə edilir. Azərbaycanın Rusiyaya birləşdirilməsi, Azərbaycanda sovet hakimiyyətinin qələbəsi kimi böyük tarixi dövrlər şagirdlərə yeni baxışlara uyğun təqdim olunur. Şagird Azərbaycan tarixində mühüm rol oynayan şəxsiyyətləri tanıyır, onların vətən qarşısındakı xidmətlərinin mənasını anlamağa başlayır.

"Azərbaycan tarixi" fənni şagirdlərin

yüksək intellektə, biliyə, geniş dünyagörüşünə malik olmasında, onların şəxsiyyət kimi formalaşmasında, soykökünü, adət-ənənələri, milli-mənəvi dəyərlərini, ailəsini, vətənini, millətini sevməsində, bunlarla yanaşı onlarda tolerantlıq keyfiyyətinin bərqərar olmasında böyük rol oynayır. Əlbəttə, burada bir sıra məsələlərin dərsliklərdə və daha vacibi müəllimin şərhində yer tutmasının səviyyəsi də əhəmiyyət kəsb edir. Əlbəttə, dərsliklərdə də, şərhlərdə də hər şey aydın olmalıdır. İngilis yazıçısı Oskar Uayld “Oxumaq, yaxud oxumamaq” adlı məqaləsində yazırdı ki, pis kitablardan insanları qorumaq işini, hətta universitetlərin missiyaları sırasına daxil etmək vacibdir. Çünki neqativ faktlar tez yadda qalır, uzun müddət onları yaddaşlardan silmək olmur, ona görə tolerantlıq kimi həssas məsələlər kitab, dərslik materiallarında elə verilməlidir ki, onlar şagirdlərin zənginləşməsinə kömək etsin. Bəzi neqativ faktlar tolerantlığa mənfi təsir göstərir. Çünki ölkəmizdə tolerant cəmiyyətinin bərqərar olmasından, müasir inkişafı ilə dünyada nüfuzunun artmasından rahatsız olan qara qüvvələr də vardır. Onlar bəzi faktlardan qərəzli məqsədlər üçün istifadə edirlər, hətta bir qrup gəncləri çaşdırmağa da çalışırlar. Ona görə də, müsbət tarixi tolerantlıq ənənələri yaddaşlarda möhkəmləndirilməlidir.

Azərbaycan Prezidenti İlham Əliyevin sözləri ilə desək, Azərbaycanda hökm sürən ictimai-siyasi quruculuqdan asılı olmayaraq bütün dövrlərdə Azərbaycan dözümlülük, tolerantlıq məkanı olmuşdur. Bu gün müstəqil Azərbaycan öz siyasətini bu təlim üzərində qurur.

“Azərbaycan tarixi”ndən şagirdlər tolerantlığa dair kifayət qədər məlumat ala bilirlər. Başqa xalqlara, dinlərə, təriqətlərə dözümlülük türk-Azərbaycan mədəniyyətinin ən gözəl və ən qiymətli cəhəti kimi başlıca əhəmiyyət kəsb edir. Tarixdən o da məlumdur ki, türklər fəth etdiyi ölkələrin yerli mədəniyyətinə hörmətlə yanaşır, onlarla barbarlar kimi davranmırdılar. Hətta müxtəlif dini-etnik əsaslara biganəlik də göstərmirdilər. Azərbaycan Səfəvilər dövlətinin banisi Ş.İ.Xətainin anası, Ağqoyunlu hökmdarı Uzun Həsənin qızı Aləmşah bəyim – Dəspinə xatun Trabzon hakimi IV İohanın xristian qızı idi. Belə faktlar tariximizdə istənilən qədərdir.

Akademik Kamal Abdulla özünün “Azərbaycan multikulturalizminin ədəbi-bədii qaynaqları” əsərində yazır: “Poeziyamızda müxtəlif dinlərin müqəddəslərinə - İbrahimə, Musaya, Süleymana, Yaquba, İsa Məsihə, Məryəmə dərin hörmətlə müraciət edilməsi, onların həyat və əməlləri ilə bağlı Şərq poetikasının sehrli və füsunkar cığırlarında uyğun təşbeh və bənzətmələr qurulması, istər müqayisəli, istərsə də müqayisəsiz bədii fiqurlar yaradılması artıq öz-özlüyündə multikultural və tolerant əhvalın bariz nümunəsi kimi diqqəti cəlb edir”.

Multikultural dəyərlər oğuz etnokulturasının üzvi tərkib hissəsi olan “Kitabi-Dədə Qorqud”da öz əksini daha qabarıq tapmışdır. Eposda xristian qızları da bacarıqlı, sədaqətli, mərd, cəsarətli təsvir və təqdim olunur. Nizaminin “Yeddi gözəl”ində qəhrəmanlar hərəsi bir ölkədəndir.

Ölkəmizdə aparılan düzgün siyasətin bəhrəsidir ki, hazırda multikulturalizm ölkəmizdə alternativi olmayan həyat tərzinə çevrilmişdir. Müstəqilliyimizin mövcudluğu ölkəmizin insanları arasında qarşılıqlı anlaşma, zənginləşmə mühiti yaratmışdır.

Beynəlxalq yay universitetlərinin açılış mərasimindəki çıxışında Azərbaycanın dünya miqyasında beynəlxalq dialoq və əməkdaşlıq məkanı kimi tanıdıldığını deyən təhsil nazirinin müavini Ceyhun Bayramov bildirib ki, siyasi, iqtisadi və digər sahələrdə qazanılan nailiyyətlər tolerantlıq nümunəsi olan və tanınmış imicə sahib Azərbaycanı

beynəlxalq ictimaiyyət daha yaxşı tanıtdırmaqla bərabər, dünyanı diqqətcil ölkəyə yönəldə bilib.

Dövlətimizin başçısı Azərbaycanda multikulturalizmə münasibət bildirərək demişdir: "Multikulturalizm Azərbaycanda dövlət siyasətidir. Qeyd etməliyəm ki, artıq tarixi keçmişimiz də bunu diqtə edir. Eyni zamanda multikulturalizm Azərbaycanda həyat tərzidir. Biz gündəlik həyatımızda bu prinsiplər əsasında fəaliyyət göstəririk. Bu prinsiplər cəmiyyətin mütləq əksəriyyəti tərəfindən dəstəklənir, müdafiə edilir".

Respublikamızda yaşayan etnik etnonimlər – xınalıq, tat, kürd, talış, udin, avar, ləzgi, qırız, buduq və b. multikulturalizmin daşıyıcılarıdır. Məhz onların birliyi ölkəmizdə dövlət siyasətinin aparıcı istiqamətlərindən biridir, xalqımızın alternativsiz həyat tərzidir, bütövlükdə Azərbaycanın zəngin mənəvi sərvəti və toxunulmaz xəzinəsidir. Bir sözlə, Azərbaycan multikultural durumunun dünyaya açılan aynasıdır.

2016-cı ilin ölkəmizdə "Multikulturalizm ili" elan edilməsi haqqında 11 yanvar 2016-cı il tarixli sərəncama müvafiq olaraq yaradılmış Bakı Beynəlxalq Multikulturalizm Mərkəzi, Azərbaycan Milli Elmlər Akademiyası, Azərbaycan Yaradıcılıq Fondunun birlikdə nəşr etdiyi "Multikulturalizm" jurnalının birinci sayının oxuculara təqdim olunması Azərbaycanın dünyaya örnək ola bilən bir ölkə olmasını bir daha təsdiq etdi. Bu, Azərbaycanın "dünya mədəniyyətləri çələngi" yaratmaq yolunda ən uğurlu addımıdır. Yeni jurnal ölkəmizdə yaşayan hər bir xalqın, etnik qrupun yeni mətbuat orqanıdır. Yuxarıda deyilənlərə bir də nəzər saldıqda belə bir gerçək qənaətə gəlmək olur ki, bu gün Azərbaycan multikulturalizmi modeli dünya səviyyəsində ən mükəmməl örnək kimi qəbul olunur. Əsl həqiqət budur ki, ölkəmizdə yaşarlı tarixi köklərə malik multikulturalizm daha da inkişaf edir, yeni pozitiv çalarlarla zənginləşir.

***Rəyçi: dos. N.Nəcəfov***

## İstifadə edilmiş ədəbiyyat

1. Kamal A. Azərbaycan multikulturalizminin ədəbi-bədii qaynaqları. Bakı, 2016.
2. "Multikulturalizm" jurnalı, 2016, №1.
3. Həmidova İ. Azərbaycan multikulturalizmi milli sərvətimizdir. //Azərbaycan məktəbi, 2016, №2.
4. Azərbaycan multikulturalizmi fənni dünya universitetlərində uğurla tədris olunur. 525-ci qəzet, 20 iyun 2015.
5. Dini və milli tolerantlıq, millətlərarası münasibətlərin inkişaf etdirilməsi. 525-ci qəzet, 14 dekabr 2015.

**Э.Гасымова**

**Мультикультурализм - образ жизни**

**Резюме**

В статье говорится о сути мултикультурализма, о влиянии на межличностные отношения толерантства. Уделяется строгое внимание на изучение мултикультурализма в Азербайджане. В статье приведены интересные факты.

2016 год обьявлен в Азербайджане годом мултикультурализма.

**E.Gasimova**

**Multiculturalism is a way of life**

**Summary**

In the article it is spoken about the essence of multiculturalism and its impact on tolerant relations. Great attention is paid to the study of multiculturalism in Azerbaijan. Interesting facts are presented here.

2016 is declared the year of multiculturalism in Azerbaijan.

# MULTİKULTURALİZMİN METODİKİ ASPEKTLƏRİ

**Kəmalə Həşimova,**

***Xətai rayonu, 249 nömrəli tam orta məktəbin müəllimi***

***Açar sözlər:*** *multikulturalizm, pedaqogika, təlim, tərbiyə, şəxsiyyət, dəyər, fənn, milli, metodiki aspektlər.*

***Ключевые слова:*** *мултикулътурализм, педагогика, обучение, воспитание, личность, ценность, предмет, национальный, методические аспекты.*

***Key words:*** *multiculturalism, pedagogy, training, urbringing, personality, worth, discipline, national, methodical aspects.*

Azərbaycan xalqının ümummilli lideri, multikulturalizmin banisi Heydər Əliyev hər zaman multikultural dəyərlərə böyük əhəmiyyət vermişdir. Bu dəyərlər Azərbaycan xalqının bütövlüyünün qorunmasına, inkişafına xidmət edir. Bu baxımdan ölkəmizdə dövlət siyasəti kimi qəbul edilən, insanların həyat tərzi olan multikulturalizmin metodiki aspektlərinin öyrənilməsi vacibdir.

Azərbaycanda millətlərarası və dinlərarası münasibətlər milli-mənəvi dəyər kimi həm də bəşəri məzmun, bəşəri keyfiyyət daşıyır. Azərbaycan xalq pedaqogikasında bu məsələyə həmişə həssas yanaşılmış, xalqların tarixi köklərinə, müxtəlif mədəniyyətlərə, o cümlədən musiqiyə hörmət göstərilmiş, birgəyaşayış, tolerantlıq təbliğ olunmuşdur.

Bütün bu sadalananlar şagirdlərin tərbiyə işində, o cümlədən mənəvi-estetik tərbiyəsində əhəmiyyətli rol oynayır. Ona görə təlim-tərbiyə prosesində şəxsiyyətin formalaşdırılması işi bu məsələyə xüsusi diqqət yetirilməsini tələb edir. Multikultural dəyərlər öyrədilərkən musiqi dəyərlərində ümumazərbaycan mədəni konteksti, azərbaycançılıq məfkurəsi mənəvi baza kimi qəbul edilməli, təhsilalanların tərbiyəsi bu təməllər üzərində qurulmalıdır.

Təlim prosesində təhsilalanlara multikultural dəyərlərin ardıcıl və sistemli aşılanması şagirdlərin müstəqil həyata hazırlığında, şəxsiyyət kimi formalaşmasında böyük əhəmiyyət kəsb edir. Musiqi kurikulumunun, yeni təhsil proqramlarının, tədris vəsaitlərinin, müxtəlif resursların imkanlarından istifadə etməklə multikultural dəyərlərlə bağlı şagirdlərə geniş və dərin biliklər, zəruri bacarıqlar aşılanmalıdır. Multikultural dəyərlər insanları əmin-amanlığa, sülhə, birgəyaşayışa, dostluğa, qardaşlığa, ölkənin, vətənin bütövlüyünün qorunmasına səsləyir. Ümumtəhsil məktəblərində musiqi təlim və tərbiyəsinin, musiqi mədəniyyətinin formalaşdırılmasında bu səpkidə musiqi əsərləri şagirdlərə çatdırılmalıdır.

Bu gün Azərbaycanda tolerantlığın ən bariz nümunəsi olan dünya dinlərinə münasibət ənənəvi olaraq qarşılıqlı etimad və əmin-amanlıq şəraitində fəaliyyət göstərir, islam və qeyri-islam dini icmaları öz etiqadlarını azad və sərbəst şəkildə yerinə yetirirlər.

Aydın məsələdir ki, bütün zamanlarda xalqı qədim, köklü xalq kimi tanıdan və dünya cəmiyyətinə qəbul etdirən onun tarixi, mübarizliyi, milli-mənəvi dəyərləridir.

Tədris prosesində, xüsusən humanitar fənlərin tədrisində qədim ənənələrimizlə bağlı multikultural dəyərləri, tolerantlığı həssas və inandırıcı faktlarla, o cümlədən musiqinin dili ilə çatdırmaqdır.

Heydər Əliyev fondunun Prezidenti Mehriban Əliyevanın təşəbbüsü və qayğısı ilə klassik muğam sənətinin intibahı ili başlamış, muğam müsabiqələri və beynəlxalq festivalların keçirilməsi multikultural dəyər-

lərin öz yerini tutmasına imkan və şərait yaratmışdır. Məlumdur ki, musiqi insanı ən gərgin, narahat anında da halından çıxarıb öz aləminə aparır, necə deyərlər, ovsunlayır. Uşaqlar belə hallarda sanki özlərini tapırlar. Ona görə də, musiqini sevənlər, onu ruhunda yaşadanlar, əsasən, tolerant olurlar. C.Məmmədquluzadənin "Kamança" əsərində musiqinin ecazkar təsiri əliqılınclı adamın da yumuşamasına, tolerantlığına səbəb olur.

Musiqi dərslərində şagirdlər xalq musiqi nümunələri ilə yanaşı professional musiqi əsərləri ilə də yaxından tanış olmalı, onlardakı bəşəri dəyərləri dərk etməyə hazırlaşmalıdırlar.

Müxtəlif etnoslardan, etnik qruplardan ibarət ölkə əhalisi ağır işğalçılıq müharibələrinə, məhrumiyyətlərə, təzyiqlərə, mürtəce təbliğatlara baxmayaraq bütün dövrlərdə birliyini qoruyub saxlaya bilmişdir. Çoxsaylı müxtəlif səbəblər sırasında ölkənin əsas əhalisi olan və böyük əksəriyyəti təşkil edən Azərbaycan türklərinin mentalitetindəki tolerantlığı xüsusi qeyd etmək zəruridir.

Dünyada müsəlman dövləti kimi tanınan Azərbaycanda müsəlmanlarla bərabər xristianlıq, iudaizm və digər qeyri-ənənəvi dinlərə mənsub xeyli sayda vətəndaş və vətəndaşlığı olmayan insanlar yaşayır. Həmçinin burada ənənəvi dini bağlılıqları olmayan toplumlar, məsələn, qaraçılar da yaşayır. Hər hansı bir başqa dinə və millətə mənsub olduğuna görə Azərbaycan ərazisində insanlara cəmiyyət tərəfindən radikal münasibət göstərilməyib.

Ümumtəhsil məktəblərində oxuyan şagirdlərin musiqi-estetik zövqünün formalaşdırılmasına ciddi fikir verilməsi böyüyən nəsildə estetik, elmi-emosional tərbiyənin gücləndirilməsinə, onların intellektual səviyyəsinin inkişafına xidmət etmişdir. Bu işdə xalq musiqisinin təsir dairəsi daha genişdir. Xalq musiqisinin mənimsənilməsi, müasir musiqimizin, habelə başqa xalqların musiqi nümunələrinin də öyrədilməsində bu tələblər gözlənilməlidir. Ü.Hacıbəyli yazırdı ki, Azərbaycan xalq musiqisinin təşkili yalnız azərbaycanlılar tərəfindən anlaşılıb sevilir, o, bir çox xalqların qəlbinə yol aça bilir. Bu musiqi, xüsusilə Zaqafqaziya və Orta Asiya xalqlarına daha yaxındır.

Eyni fikirləri S.Vurğun da söyləmişdir: "Azərbaycan musiqisi muğamat üzərində qurulmuşdur. Eyni zamanda bu yalnız Azərbaycan zövqü deyil, bütün Qafqaz, Şərq xalqlarının bədii zövqüdür. Biz bununla fəxr edirik ki, bizim yaratdığımız böyük musiqi məktəbi nəinki Azərbaycanda, bəlkə Azərbaycandan xaricdə bir çox xalqlar arasında öz möhkəm təsirini göstərməkdədir".

S.Vurğun musiqinin mənəvi-estetik təsirindən bəhs edərək onun ümumdünya estetik sərvəti olması üzərində xüsusi dayanır. Onun fikrincə, musiqi xalqlar dostluğunu, beynəlmiləlçilik hislərini qüvvətləndirir".

Bu tarixi ənənənin qorunub saxlanılmasında son vaxtlar milli musiqimizə verilən qiymətlər də az rol oynamır. Əlbəttə ki, dini və milli tolerantlıq həm də insan hüquq və azadlıqlarının demokratiyanın təməl prinsiplərindəndir. Çünki mədəniyyətlərin dialoqsuz anlamağın yolu hər bir mədəniyyətin, hər bir cəmiyyətin özünəməxsusluğunu anlamaqdan və qoruyub saxlamaqdan keçir. Yaxşı haldır ki, yeni musiqi proqramlarında müxtəlif incəsənət növləri arasında əlaqələr öz əksini tapmışdır. Multikultural ənənələrin möhkəmlənməsində ölkəmizdə başqa xalqların dəyərləri və normalar kontekstində milli mədəniyyətimizin simvollarını ürəkdən təbliğ etməyimiz də az rol oynamayır. Azərbaycan incəsənətinin təbliği artıq ideoloji prosesə çevrilmişdir. Bu baxımdan dövlət çoxmədəniyyətliliyin daha da inkişaf etməsində maraqlı olmaya bilməz.

Novator bir musiqi müəllimi kimi mən fəaliyyətim boyu dövlətçiliyimizin qəbul

etdiyi ənənələrə sadiq şəkildə tədris aparır, öz fəaliyyətimdə multikultural dəyərlərin təbliğinə çalışıram. Azərbaycan musiqisi ilə yanaşı bütün dünya xalqlarının musiqiləri, mədəniyyətləri barədə şagirdlərimə məlumatlar verir, onları bəşəri dəyərlərə hörmətlə yanaşmağa səsləyirəm.

Multikulturalizm mədəniyyətlərin və sivilizasiyaların dialoqu üçün zəruri şərtlərdəndir. Dünyada müxtəlif dillərdə danışan insanlara məxsus milli-mənəvi dəyərlərin qorunması, inkişafı, xüsusən azsaylı xalqların milli mədəniyyətinə hörmət ardıcıl gözlənilməlidir. Bu da insanlar arasında qarşılıqlı anlaşma, qarşılıqlı zənginləşmə, dostluq və əməkdaşlıq məsələlərini tənzimləyir.

Ümumtəhsil məktəblərinin 6-cı sinfində Üzeyir Hacıbəyli, Niyazi, Əfsər Cavanşir-ovun yaradıcılığı ilə paralel şəkildə Frederik Şopenin “Mi-minor vals”ı, Frans Şubertin “Serenada”sı, N.Rimskinin “Qar qız” operasını eyni diqqət və məhəbbətlə tədris edirəm.

7-ci sinifdə Cövdət Hacıyev, Əfrasiyab Bədəlbəyli, Vasif Adıgözəlovla yanaşı İohan Sebastyan Bax, Pyotr Çaykovski, İohan Ştraus, Jorj Bize, Dmitri Şostakoviçin simfoniya, baletləri haqqında biliklər şagirdlərin böyük marağına səbəb olur.

Yenə də 7-ci sinfin “Musiqi” dərsliyində verilmiş Mixail İppolitov – İvanovun 1925-ci ildə qələmə aldığı “Türk fraqmentləri” süitasında bir neçə Azərbaycan musiqilərindən, o cümlədən “Ninni” musiqisindən də istifadə olunub” faktlar tədris olunan zaman musiqinin multikultural dəyər olması onlara bir daha aydın olur. Bu tip faktlar sayəsində musiqinin dünyəviliyini anlatmaq daha asan başa gələr. Bütün bunlar metodiki aspektlər kimi öz aktuallığını heç vaxt itirmir.

Mədəni müxtəliflik şəraitində yaşayan bir xalqın övladları olmaqla onlar dünya musiqisini milli kontekstdə, xalq musiqimizi isə beynəlxalq aspektdə öyrənir və bununla da musiqilərarası inteqrativliyə, mədəniyyətlərin qaynayıb-qarışmasına yol açılır.

***Rəyçi: prof. V.Xəlilov***

## İstifadə edilmiş ədəbiyyat

1. Cəbrayılov İ. Mədəni müxtəliflik dünya və Azərbaycan. Elmi-konfrans. 29 aprel, 2016.

2. Nəcəfov E. Müxtəlif ölkələrdə multikulturalizm siyasətinin müqayisəli təhlili. Bakı: Araz, 2015.

3. Rüstəm Kamal. İşığa doğru. Ədəbiyyat qəzeti, 27 avqust 2016.

**К.Гашимова**

**Методические аспекты мультикультурализма**

**Резюме**

В статье раскрывается сущность мультикультурализма, акцентируется внимание на его ческих аспектах. В современном обществе наблюдается значимость исследования и изучения методических аспектов мультикультурализма. В целостности для формирования зрелой личности является изучение мультикультуральных ценностей и прививание этих ценностей обучающимся.

**K.Hashimova**

**Methodical aspects of multiculturalism**

**Summary**

In the article, the essence of multiculturalism is researched and its methodical aspects are brought to the attention. In today's society, there is the importance of research and study of methodical aspects of multiculturalism. It is important to study multicultural values for the development of the mature personality and deliver these values to the learners.



# MAARİFÇİ PEDAQOQ

**Alxan Bayramoğlu,**
***Bakı Dövlət Universitetinin professoru,***
***filologiya üzrə elmlər doktoru***

***Açar sözlər:*** *xalq maarifi, maarif xadimi, seminariya, elmi-pedaqoji, mənəvi-əxlaqi, ictimai düşüncə.*

***Ключевые слова:*** *народное образование, просвещенческий деятель, семинария, научно-педагогическое, морально-духовное, общественное мнение.*

***Key words:*** *public education, education worker, seminary, scientific, moral and spiritual, social thinking.*

Azərbaycan ictimai-bədii və mədəni fikrinin, xalq maarifinin inkişafında özgün xidmətləri olan nasir, alim, maarif xadimi və publisistlərdən biri də Abdulla bəy Sübhanverdixanov-Divanbəyoğludur. O, 1883-cü il yanvarın 1-də Qazax qəzasının Hüseynbəyli kəndində anadan olmuşdur. Atası Vəli ağa, anası Hənifə xanım Molla Əhməd qızı öz xeyirxahlıqları, nəcibliklər ilə el-obanın dərin hörmət və rəğbətini qazanmışdılar.

A.Divanbəyoğlu 1930-cu ildə rus dilində yazdığı "Avtobioqrafiya"sında göstərir ki, ibtidai təhsilini Qazaxda almışdır. O, valideynlərini erkən yaşda itirmişdir. Yeniyetmə yaşlarında yoxsulluq içində yaşamalı olsa da, təhsilə həvəsi azalmamış, özünün də qeyd etdiyi kimi, ana qohumları onun bu meyil və yanğısını nəzərə alıb təhsilini davam etdirməsinə maddi və mənəvi dəstək vermişlər. Bu işdə Abdulla bəyin valideynlərinin qoyub getdikləri xeyirxah əməlləri və işıqlı xatirələri də rol oynamışdır. Abdulla bəyin Qori Müəllimlər Seminariyasının müsəlman şöbəsinə qəbula hazırlaşmasına o zaman Qazaxda işləyən İsa bəy Abakarov təmənnasız kömək etmiş, müsabiqədən keçməsi üçün onu tələb olunan elmi səviyyədə hazırlaşdırmışdır. Qori Müəl-limlər Seminariyasının məzunu olan İ.Abakarov oraya qəbul şərtlərini və tələbləri gözəl bilirdi. Odur ki, A.Sübhanverdixanov 1899-cu ildə həmin seminariyaya daxil ola bilmiş və 1903-cü ildə oranı uğurla bitirmişdir.

Seminariyada oxuduğu illərdə A.Sübhanverdixanov qabaqcılyönümlü pedaqoji və maarifçilik məsələlərinə, ədəbiyyata ciddi maraq göstərmiş, Uşinski, Pestalossi, Russo və b. pedaqoqların, Qərbi Avropa və rus ədəbiyyatı klassiklərinin əsərlərini mütaliə etmişdir. Bunun nəticəsi olaraq seminariyanın üçüncü əsas sinfində oxuyarkən "Yeni məktəb" adlı elmi əsər yazmışdı. Bu əsərdə A.Sübhanverdixanov "Fransada Demolenin, İngiltərədə Reddinin, Almaniyada Fortun məktəblərindən misal gətirərək sxolastik təlimə qarşı çıxır, elmlərin həyatla əlaqəsini, şüurlu mənimsənilməsini irəli sürürdü". Sitatda adları çəkilən şəxslər özlərini Jan Jak Russonun tələbələri sayır və təlim-tərbiyəni, tədrisi cəmiyyətlə, təbiət və ətraf mühitlə əlaqəli şəkildə həyata keçirməyə üstünlük verirdilər. A.Sübhanverdixanovun bu elmi işi onun Russo fəlsəfəsinə, ümumən XVIII əsr

fransız maarifçilərinin ilkin təbiət nəzəriyyəsinə kifayət qədər yaxından bələd olduğunu göstərir. Bu bələdliyin və təsirin qabarıq izləri, yəni təbii inkişaf qanunları ilə cəmiyyət qanunları arasındakı ziddiyyətlərin sosial-psixoloji ağrıları – ədibin “Əbdül və Şahzadə”, “Can yanğısı”, “Ardoy dərəsi”, “Duman”, “Cəng” və s. əsərlərinin qəhrəmanlarının taleyində görünür. Təkcə onu xatırlayaq ki, “Əbdül və Şahzadə” əsəri elə həmin ildə (1902) qələmə alınmışdır.

A.Sübhanverdixanov – Divanbəyoğlu 1903-cü ildə seminariyanı bitirib ibtidai məktəb müəllimi hüququ alır. Təyinatla Acarıstanın Qaradağlı-Caynam məktəbində beş ay (iyun-oktyabr) işlədikdən sonra həmin ilin 20 oktyabrında keçmiş Batumi vilayətinin Xertivissi ibtidai məktəbinə müdir təyin edilir. 1904-cü ildə isə Bakıdakı VI rus-tatar məktəbində müəllim işləməyə göndərilir.

Abdulla bəyin həyat və fəaliyyətinin Bakı dövrü daha qaynar, zəngin və maraqlı olmuşdur. O, 1906-cı ildə yaradılan “Nicat” maarif cəmiyyəti xətti ilə maarif və mədəniyyətə dair mühazirələr oxuyur. Həmçinin 1910-cu ildə yaradılan “Nəşri-maarif” cəmiyyətinin təşkilində və fəaliyyətində yaxından iştirak edir, 1912-1913-cü illərdə Bakıda təşkil edilən ikiillik müəllimlər hazırlığı kursunda ana dili müəllimlərinə dərs keçir. Eyni zamanda, 1910-cu ildə N.Nərimanovun Bakıda açdığı ədəbiyyat dərnəyində sənət və həyat həqiqəti məsələlərinə dair mühazirələr oxuyur, əvvəllər yazdığı bədii əsərləri (“Can yanğısı”, “Cəng” və s.) üzərində yenidən işləyib onları qəzetlərdə və kitab halında çap etdirir. Ədibin “İlan”, “Fəhlə”, “Parlaq ulduz” əsərləri isə oxuculara “Dəbistan” (1906) və “Haqq yolu” (1912) jurnallarında çatdırılır.

Məşhur bəstəkar və pedaqoqlardan olan Müslüm Maqomayev 1916-cı ildə Bakıda ikinci dərəcəli rus-tatar məktəbi açarkən Abdulla bəyi də oraya dəvət edir. A.Divanbəyoğlu 1919-cu ilin ortalarınadək həmin məktəbdə müəllim, 1919-cu ilin ortalarından 1920-ci ilin aprel çevrilişinədək isə AXC-nin Daxili İşlər Nazirliyində tərcüməçi vəzifəsində çalışır.

1920-ci ilin iyun ayında A.Divanbəyoğlu N.Nərimanovun zəmanəti ilə Bakı Xalq Maarif Şöbəsində işə qəbul edilir. O, eyni zamanda Xalq Xarici İşlər Nazirliyində də çalışır. 1921-ci ilin 30 oktyabrından Zaqafqaziya proletar hərbi məktəbinin müdavimlərinə coğrafiya, tarix və fizika fənlərindən dərs deməyə dəvət olunur və bu dəvəti qəbul edir.

Abdulla bəy 1926-cı ilin payızına qədər Xalq Maarif Komissarlığında müxtəlif vəzifələrdə: təlimatçı, məktəb inspektoru, tədris müəssisələrində pedaqoji şöbə müdiri və s. vəzifələrdə çalışır. 1921-1922-ci illərdə Gəncə, Şamxor, Salyan, Quba, Göyçay qəzalarında məktəb və maarifin vəziyyətini yoxlayaraq, hesabatlar hazırlayır. 1923-1924-cü illərdə “Elmi-heyvanat” (zoologiya) dərsliyini yazır. “Xalq maarifi” jurnalının ikinci redaktoru təyin edilir. Bütün bunlarla yanaşı, təhsilini artırmaq qayğısına da qalır; bu məqsədlə 1923-cü ildə Azərbaycan Dövlət Universitetinin tarix fakültəsinin şərqşünaslıq şöbəsində dinləyici, 1924-cü ildə isə tələbə kimi dərslərə davam edir. O, rus və fars dillərini dərindən bilməklə qalmayıb, alman və latın dillərini də öyrənməyə çalışır. Universitetdə oxuyarkən eyni zamanda həmin ali təhsil ocağının tibb fakültəsində Azərbaycan dilindən dərs deyir. Azərbaycanı Tədqiq və Tətəbbö Cəmiyyəti təşkil olunanda onun işinə cəlb edilən Abdulla bəy Azərbaycan tarixinin, etnoqrafiya və folklorunun öyrənilməsi, material toplanışı və onların təsnifi istiqamətində mühüm işlər görür. Cəmiyyətin “Azərbaycanı öyrənmə yolu” jurnalında “Müctəhid feodal”, “Şəki xanlarının tarixi və onların nəsilləri” başlıqlı

elmi məqalələrini çap etdirir.

Bundan başqa A.Divanbəyoğlu "İran və Osmanlı məsələsi", "Türk sistemli kəndlərdə totemizm", "Folklor materiallarının təsnifi", "Məcnunun Leyliyə məhəbbəti" və s. elmi əsərlərin, Azərbaycan tarixinin yazılması məqsədilə toplama materiallarının və s. əsərlərin də müəllifidir. Həmin əsərləri yazdığı illərdə – 1924-1931-ci illərdə o, Azərbaycan Elmi Tədqiqat İnstitutunda ikinci şöbənin rəyasət heyətinin üzvü, tarix şöbəsinin katibi, elmi katib, baş elmi işçi, həmçinin SSRİ EA Azərbaycan filialının birinci dərəcəli elmi işçisi və s. vəzifələrdə çalışmışdır.

1930-1931-ci illərdə A.Divanbəyoğlu eyni zamanda Abdulla Şaiq adına Nümunə Məktəbinin - pedaqoji texnikumun müdiri işləmiş, sonra K.Marks adına Azərbaycan Xalq Təsərrüfatı İnstitutunda Azərbaycan dili, daha sonra M.Əzizbəyov adına Azərbaycan Neft İnstitutunda rus dili müəllimi işləmiş, eyni zamanda dərsliklərin tərtibi və rus dilindən Azərbaycan dilinə tərcüməsi ilə məşğul olmuşdur. 1935-ci ildə Neft İnstitutunun dosenti seçilmişdir.

A.Divanbəyoğlu bir müddət (22 dekabr 1922-ci ildən 17 iyun 1926-cı ilə kimi) Azərbaycan Mərkəzi Dövlət Arxivində şöbə müdiri, sonra isə direktor vəzifələrində çalışmış, arxiv materiallarının komplektləşdirilməsi, məhv olmaqdan qorunması üçün səmərəli fəaliyyət göstərmiş və Respublikamızda ilk Arxiv işi qurucularından biri olmuşdur.

Ümumilikdə bütün həyatı boyu xalqının və vətəninin mədəni-mənəvi tərəqqisi, xoşbəxt, işıqlı gələcəyi Abdulla bəyi bir vətəndaş kimi daim narahat etmiş, düşündürmüşdür. Ona görə fəaliyyətinin bütün – elmi, ədəbi, pedaqoji, ictimai-mədəni, publisistik və s. sahələrində bu amala xidmət yolunda vətəndaş təəssübkeşliyi və fədakarlığı ilə çalışmışdır. Onun bu keyfiyyətləri ilə yanaşı yüksək əxlaqı, zəhmətsevərliyi, istedad və qabiliyyəti həm tələbəlik dövründə, həm də əmək fəaliyyəti illərində müəllimləri, alim və yazıçı həmkarları, iş yoldaşları tərəfindən həmişə yüksək qiymətləndirilmişdir.

Abdulla bəy Divanbəyoğlu 1936-cı il yanvarın 6-da Bakıda vəfat edərkən dostlarından Zübeyir Vəlizadə onun ölümünə "Ağır itki" adlı təsirli bir şeir həsr etmişdir. Azərbaycan Dövlət Ədəbiyyat və İncəsənət Arxivində 517-ci fondda həmin şeirin əlyazmasından, çoxlu sənəd və fotodan başqa Abdulla bəyin ölüm yatağında və iş otağında yazı masasının fotosu da qorunub saxlanılır.

A.Divanbəyoğlu bədii əsərlərində də maarifçilik məsələlərinə dair yeri gəldikcə özünün pedaqoji fikir və mülahizələrini irəli sürmüşdür. Elmi ədəbiyyatda Abdulla bəy Divanbəyoğlu romantizm ədəbi cərəyanının görkəmli nümayəndəsi kimi tanınmaqla yanaşı onun yaradıcılığına maarifçiliyin təbiətindən doğan lirizm, sentimentallıq, həmçinin müəyyən mərhələdə realizm və inqilabi-demokratik təsvir, təhkiyə tərzi də xasdır. Ədibin "Köçərilərin həyatının müşahidələrinə dair", "Əbdül və Şahzadə", "Ardoy dərəsi", "Can yanğısı" əsərlərində maarifçi romantika, J.J.Russonun ilkin təbiət nəzəriyyəsindən–təbiət-cəmiyyət qarşılaşdırmasından irəli gələn sentimental əhvali-ruhiyyə, "İlan", "Fəhlə", bir qədər də "Cəng"də realist təsvir və inqilabi-demokratik düşüncə tərzi üstünlük təşkil edir.

Abdulla bəy Divanbəyoğlu bədii yaradıcılığa Qori Müəllimlər Seminariyasında oxuyarkən (1901) qələmə aldığı "Köçərilərin həyatının müşahidələrinə dair" adlı əsəri ilə başlamışdır. Müəllifin göstərdiyi kimi, əsərdə əksini tapan müşahidə və təsvirlər konkret dövrü – 1901-ci ilin 7 iyunundan 8 avqustunadək müddəti əhatə edir. Rus dilində qələmə alınan bu əsərdə maldarlıqla məşğul olduqları üçün

yay aylarını yaylaqlarda, soyuq fəsli aran (qışlaq) zonasında yarımköçəri həyat sürən elat camaatının yaylaq həyatı, buradakı məişət tərzi, adət-ənənəsi, dünyagörüşü və həyata baxışları dolğun və canlı bədii lövhələrlə təsvir edilmişdir. Əsərdə əksini tapan təsvir və hadisələr Azərbaycanın Dilican yaylaqlarında – “Cəsur dağ”, “Qəddar xan”, “Ocaq dağı” və s. səfalı guşələrində cərəyan edir. Əsərdə köçəri həyatının həm romantikası, həm də çətinlikləri canlı, aydın bir dillə təsvir edilir.

“Köçərilərin həyatının müşahidələrinə dair” əsəri etnoqrafik faktların zənginliyi, müəllifin incə müşahidə, obrazlı təsvir və təhkiyə qabiliyyətini, xalq həyatına bələdliyini göstərməsi baxımından da diqqətəlayiqdir. Əsərdə müəllifin maarifçi baxışları da əksini tapmışdır: o, bu cür pak, saf, humanist, əxlaqlı, namuslu və həyalı, səxavətli və genişürəkli elat camaatının maarif və mədəniyyətin, elm və texnikanın bəhrəsindən məhrum, cəmiyyətin inkişafından geri qalmasından dərin təəssüf hissi keçirir. Ədibin vətəndaş kədəri xalqın, onun ayrı-ayrı fərdlərinin istedad və qabiliyyətinin şəraitsizlik ucbatından məişət qayğılarına sərf olunmaqla əslində puç olmasından irəli gəlir. Bu tipli gerilik və mədəni, elmi səviyyəsi aşağı səviyyədə qalmaq xalqın görüşlərində mövhumi təsəvvürlərin kök salması, onların hərəkət və davranışlarında, zahiri də olsa, qabalığın tez-tez nəzərə çarpması, məişət və ailədə patriarxal davranış normalarının kifayət qədər güclü təzahürü insan talelərinin daşlaşmış qanun və adətlərdən asılı olması və s. və i.a. gətirib çıxarması ilə nəticələnir. Odur ki, xalqın ilkin təbiiliyindən gələn və indiyədək qorunub saxlanılan müsbət etnik-mədəni, mənəvi-əxlaqi keyfiyyətləri ilə bağlı yazıçının rəğbət, qürur və məhəbbətinə bir vətəndaşlıq kədəri də qarışır.

A.Divanbəyoğlu xalqın, vətənin işıqlı sabahı, xoşbəxt gələcəyi ilə bağlı bəslədiyi arzu və ideallarını gözəl və cazibədar olduğu qədər də kədərli görüntülərin timsalında ifadə etmişdir. Ədibin həmin fikir və duyğuları, arzu və idealları onun sonrakı əsərlərində özünün ideya-bədii əksini daha dolğun və kamil şəkildə tapmışdır.

Kəndistan əhli içərisində xurafat və mövhumatın hökm sürməsindən təəssüflənən müəllif azad qadın cəmiyyətinin varlığından sevinir. Az da olsa, bu cür hərəkətlərin mövcudluğuna və cavan kişilərin mühafizəkar qocaların təzyiq, təhniz və töhmətlərindən onları qorumaq təşəbbüslərinə isə sevinc dolu ümidlə baxır. Azad ruhlu, həyat eşqli qızların və gənc qadınların xurafat yüklü mövhumi təsəvvürlərlə bağlı əhvalatlardan (məsələn, meşədəki bulaq başında, guya, ardoyun peyda olması rəvayətindən, bacarıqla yararlanıb öz səadətlərinə qovuşmaq əzmindən, uşaq oyunu, adi məişət mənzərələri və digər epizodlardan, onların canlı təsvirindən, onlara müəllif mövqeyinin xarakterindən və s. Abdulla bəy Divanbəyoğlunun yazıçılıq təxəyyülünün izləri və həmin əhvalatların onun dünyagörüşünə, vətəndaş mövqeyinə kifayət qədər təsir etdiyi, dərin izlər buraxdığı aydın dörünür. Təsadüfi deyil ki, ədibin “Əbdül və Şahzadə”, “Can yanğısı”, “Ardoy dərəsi”, “Duman”, “Cəng” və digər əsərlərində “Köçərilərin həyatına dair müşahidələrin verdiyi “həyat materialı” kifayət qədərdir.

A.Divanbəyoğlu “Əbdül və Şahzadə” povestini də (1902) rus dilində yazmışdır. Ədibin sağlığında çapa vermədiyi bu əsəri 1950-ci illərdə Azərbaycan dilinə pedaqoq Əzizə Cəfərzadə tərcümə etmiş, əsər ayrıca kitab şəklində ilk dəfə 1966-cı ildə “Azərnəşr”də, ikinci dəfə ədibin 2006-cı ildə çapdan çıxan “Seçilmiş əsərləri”ndə Vasif Nəsiboğlu və İnayət Bəktaşinin tərcüməsində nəşr edilmişdir.

Maarifçilik təlimində olan təbii hüquq nəzəriyyəsi, yəni təbiətin saflıq və xeyirxahlıq mənbəyi kimi dərk edilərək üstün tutulması, insanın dünyaya azad gəlməsi, lakin cəmiyyət tərəfindən onun təbii hüquqlarının pozulması, feodal mütləqiyyətinə kəskin etiraz, sosial-mədəni inkişafda daha çox təkamül yoluna, mənəvi kamilləşməyə xüsusi diqqət yetirilməsi sentimentalistlərin baxışları üçün də səciyyəvi idi. Tədqiqatçılar bu cəhətlərin XIX əsrin sonları, XX əsrin əvvəllərində Azərbaycan fəlsəfi-ictimai fikrində, o cümlədən sentimentalistlərin görüşlərində bütün dolğunluğu ilə müşahidə olunduğunu elmi-nəzəri cəhətdən əsaslandırarkən A.Divanbəyoğlunun əbəbi və elmi irsinə daha çox istinad etmişdir.

Qeyd edək ki, XIX əsrin sonları, XX əsrin əvvəllərində ictimai və ədəbi fikirdə qadın hüquqsuzluğunun aradan qaldırılması və qadınların günün tələbləri səviyyəsində təhsil və tərbiyə almaları məsələsi bütün ciddiyyəti ilə ortaya atılmışdı. Çünki cəmiyyətin və millətin yarısını əhatə edən ən vacib keyfiyyətlərə malik bir hissəsinin – qadınların savadlanaraq cəmiyyətin əsas hərəkətverici qüvvələrindən birinə çevrilməsi məsələsi həll edilmədən milli tərəqqi arzularının həyata keçəcəyinin mümkünsüzlüyü başa düşülürdü. Ancaq problemin həlli yolunda güclü maneələrin olduğu və həmin maneələrin milli-ictimai düşüncə, adət və məişətdə dərin kök saldığı və hər hansı yeniliyə mühafizəkarcasına, qətiyyətlə müqavimət göstərdiyi, yeni ruhlu qüvvələrin isə sosial-mədəni mühitdə hələ son dərəcə ehtiyat, şübhə və xof qarışıq təlaşla qarşılandığı da nəzərdən qaçmırdı. Bütün bunlar və ədəbi-ictimai qəhrəmanların vətənpərvərlikləri onlarda müəyyən ümidsizlik və bədbinliyin yaranmasına, nəticədə dərin ruhi-hissi sarsıntılar keçirib qəlbən sızlamalarına gətirib çıxarırdı. “Əbdül və Şahzadə” əsərinin qəhrəmanı mövcud vəziyyəti çox gözəl anlayıb qiymətləndirdiyi üçün onun qəlbini vətənpərvərlikdən doğan coşqun və ümidsiz duyğular sarmışdır.

AMEA-nın müxbir üzvü, professor Yaşar Qarayev yazır: “Povestdə (“Əbdül və Şahzadə”də – A.B.) sosial ədalətə, təkcə qadın emansipasiyasına yox, ümumiyyətlə, milli, şəxsi və ictimai azadlıq probleminə müəllifin romantik-maarifçi münasibəti də maraqlıdır. Burada təkcə bəy və mülkədar, təkcə kapitalist (sinfi amil) kütləvi yoxsulluğun yeganə səbəbi və günahkarı elan edilmir, yox, müəllif standartlardan kənara çıxır və yoxsulluğun günahını həm də yoxsulluğun özündə görür.

Hətta əlacsız, avara və fərsiz, axırıncı tüfeyli olsan belə, sən yoxsulsansa, müqəssir qolçomaqdır, bütün özün kimilərinin hamısını topla, mülkədarı və onun kimiləri bir sinif kimi ləğv elə, məhv et! – bu stereotipi qəti inkar edən A.Divanbəyoğlu zəhməti, mübarizəni nəinki zənginliyin, hətta azadlığın və müstəqilliyin də fənni və şərti hesab edirdi”.

“Can yanğısı” bir çox cəhətdən dövrü üçün xarakterik əsərdir. Burada Viktor Hüqo romantizminin, xüsusi ilə J.J.Russo baxışlarının təsiri açıq görünməkdədir. Burada ictimai mühit çirkablı bir adam kimi, təmiz adamların qatili kimi təsvir olunur. Şəhər, texnika, mədəniyyət, müasir ictimai əlaqələr pislənir. Bunlara qarşı kənd idillyası, saf təbiət, ibtidai əkinçilik, maldarlıq həyatı, köhnə kənd idealizə olunur. Kənd şəhərə, keçmiş indiyə, təbiət texnikaya, xəyal həqiqətə, arzu vəziyyətə qarşı qoyulur. Ruqiyyənin ailəsi və kəndi parlaq və yüksək bir nümunə kimi görünür. Ruqiyyə müəllifin fikrincə, bu gözəl aləmin timsalıdır. “Mədəni” insan isə bu pak məxluqu zədələyir, pozur, öz pis əxlaqı ilə məhv edir”.

“Can yanğısı” təbiətin, dağlar qoynunun füsunkar səhər mənzərəsinin təsviri

ilə başlayır. Səhərin erkən çağında quşların cəh-cəhinə, yarpaqların xışıltısına, səhər mehinin şəfaverici ətrinə, səmanın saf və təmizənginliyinə birdən-birə "qəmli qadın səsi ilə mahnı qarışır". "Səs gecə ötən qumru kimi oxuyurdu. Bu gözəl hər kəs idisə, qəzasından narazı olduğu nəğməsindən aşkar görünürdü. Canı sızıldayır və ağladığı səsinin titrəməsindən anlaşılırdı. Yumru təpənin araxasından Mələk gün kimi tülu etdi…"

Yaşar Qarayev yazır: "Can yanğısı" romanında… Vətən məhəbbəti və qadın məhəbbəti qarşı-qarşıya qoyulur və bu dəfə Vətən-qadın təkbətəkində müəllif üstünlüyü qadına yox, vətənə verir: maraqlıdır ki, əsərdə ilk dəfə vətənin və məhəbbətin – meşəyə – təbiətə məhəbbətin "Şəhər məhəbbəti" üzərində aşkar üstünlüyü görünür. A.Divanbəyoğlu maarifçi romantikanın təbiət və vətən kultunu, hər ikisini vəhdətdə tərənnüm edir".

Doğrudur, vətən Əhmədi çəkir. Ancaq o, vətən üçün gözə dəyən bir iş görmür, yalnız qəsbkarlığı ilə məşğul olur. Əvəzində yolunu azır, mənəvi-əxlaqi uçuruma yuvarlanaraq Ruqiyyəni də özü ilə birgə fəlakətə doğru aparır. Öz növbəsində Ruqiyyə də vətəni, doğma obanın, təbiətin havası üçün darıxır, öz rahatlığını onun qoynunda görür. Maraqlıdır ki, bu iki vətəndən biri– təbiət qoynu hər iki gəncə səadət və xoşbəxtlik bəxş edirsə, şəhər həyatı onları fəlakətə sürükləyir. Müəllif yenə üstünlüyü ilkin təbiət fəlsəfəsinə verir. Hadisələrin inkişafından da məlum olur ki, qəhrəmanların tale uğursuzluqları sanki onların düşdükləri mühitin təsiri ilə meydana çıxır. Əhməd Ruqiyyə ilə evlənənə qədər də, evlənəndən sonra da şəhərdə yaşadığı dövrlərin hər ikisinin sonu fəlakətlə nəticələnir. O, şəhər həyatının əvvəlki mərhələsində cinayət məsuliyyətinə cəlb edilib həbsə salınıb, sonra qaçıb bir müddət dərbədər həyat keçirdiyi kimi, ikinci mərhələsində də Ruqiyyəni, onun məhəbbətini itirərək axırda yenə çöllərə düşür. Ruqiyyəgildə, onun özü və valideynləri ilə birgə təbiət qoynunda yaşadığı dövrdə isə qayğısız və xoşbəxtdir. Əhməd nə qədər Ruqiyyə ilə bir yerdə və təbiətin qoynundadırsa, o qədər də xoşbəxtdir. Ancaq Ruqiyyəni həm mənən, həm də cismən itirdikdən sonra onun şəxsi faciəsi qat-qat artır. O özü düçar olduğu faciədə günahını dərk edəndən sonra deyir: "Ruqiyyə məhv oldu, fövt oldu… Yanım birdən-birə boşaldı, dünya gözümdən düşdü, qəza məni səhraya saldı, mənə nə qaldı?"

"Can yanğısı" 1926-cı ildə kitab halında nəşr ediləndə ədəbi və elmi ictimaiyyət onu maraqla qarşıladı; "Kommunist", "Yeni fikir" qəzetlərində əsər haqda məlumat verildi, ona münasibət bildirildi. Həmin yazıların üzü köçürülərək A.Divanbəyoğlu tərəfindən saxlanılmışdır.

A.Divanbəyoğlunun dünyagörüşündə, ictimai mövqeyində və yaradıcılığında meydana çıxan bu yeni cəhətlər təsadüfi olmayıb, milli ictimai-mədəni və sosial-siyasi düşüncədə baş verən hadisə və proseslərin nəticəsi idi. Belə ki, XIX əsrin sonu, XX əsrin ilk illərində maarifçi düşüncəyə siyasi bir ab – hava da əlavə edilməyə başlayırdı. Həmin ideyalar bolşeviklərin və digər siyasi qüvvələrin cəmiyyətin əzilən geniş kütləsinin ictimai və iqtisadi həyatın inkişafında öz əməyi ilə mühüm rol oynayan fəhlə və kəndlilərin, əzilən kasıb təbəqənin həyatdakı sosial vəziyyəti ilə mədəni, mənəvi və hüquqi ehtiyaclarının tərs mütənasib olduğunu günün ən aktual problemi kimi irəli sürmələrindən qidalanırdı. Ancaq A.Divanbəyoğlunun və digər həmfikirlərinin mövqeyi bolşeviklərin sinfi mübarizə doktrinasından tamamilə uzaq olub, cəmiyyətdə sosial ədalətsizliyin aradan qaldırılması arzusundan o yana getmirdi. "Fəhlə" hekayəsinin əsas mövzusu və ideyası da cəmiyyətdə meydana çıxıb

*6

getdikcə dərinləşməkdə olan sosial təbəqələşməni, onun törətdiyi mənəvi-əxlaqi, ictimai və iqtisadi fəsadları diqqət mərkəzinə gətirib xalqı həmin fəsadların aradan qaldırılmasına, insanlığın, haqqın, ədalətin cəmiyyətdə bərqərar edilməsinə çağırmaqdır. "İlan"dan başlayıb "Fəhlə"də inkişaf edən bu ideya-əxlaqi, sosial-mədəni elementlər Abdulla bəy Divanbəyoğlu yaradıcılığı üçün yeni bir mərhələ hesab edilməlidir. Təsadüfi deyil ki, ədibin "Cəng" povestinin qəhrəmanları öz fəallıqları ilə onun əvvəlki əsərlərinin qəhrəmanlarından seçilirlər.

Əsər "Cəng" adı ilə 1910-cu ildə "Günəş" qəzetində, həmin qəzet nəşrini dayandırdıqdan sonra isə davamı 1911-ci ildə "Yeni həqiqət" qəzetində hissə-hissə nəşr edilmişdir.

Göründüyü kimi, XIX əsrin sonları və XX əsrin ilk onilliklərində ölkədə sosial-iqtisadi həyatda baş verən təbəqələşmə və varlanma prosesinin mədəni-əxlaqi atmosferdə törətdiyi fəlakətlər təbəqələr və nəsillərarası "Cəng"in fonunda əsərdə sənətkarlıqla əks etdirilmişdir. Bütün bunlar A.Divanbəyoğlu yaradıcılığının mövzu və ideya-estetik cəhətdən getdikcə zənginləşdiyini, yeni keyfiyyət qazandığını nümayiş etdirməkdədir.

A.Divanbəyoğlu "Avtobioqrafiya"sında 1912-ci ildə "Alov" ("Plamya") adlı romanının kitab şəklində çap edildiyini və həmin əsərin 1927-ci ildə ikinci dəfə nəşr olunduğunu göstərir. Hələlik həmin əsər əlimizdə olmasa da, müşahidə və araşdırmalar Abdulla bəyin yaradıcılığının əsərdən əsərə təkmilləşdiyini, dövrün ruhuna, inkişaf ritmi və xüsusiyyətlərinə uyğun olaraq yeni-yeni ideya-bədii keyfiyyət qazandığını göstərir.

Bütövlükdə Abdulla bəy Divanbəyoğlunun (Sübhanverdixanovun) ədəbi və elmi-publisistik, irsi, elmi-pedaqoji ideyaları, milli mədəniyyət və ictimai düşüncəmizin orijinal ifadə tərzinə malik parlaq və bənzərsiz, duyğu və arzu dolu bir səhifəsi kimi öz təravətini qoruyub saxlamaqdadır.

***Rəyçi*: *prof. Z.Əsgərli***

## İstifadə edilmiş ədəbiyyat

1. Mir Cəlal. Azərbaycanda ədəbi məktəblər (1905-1917). Bakı: Maarif, 1988.
2. Qarayev Y. Azərbaycan ədəbiyyatı: XIX-XX yüzillər. Bakı: Elm, 2002.
3. Abdulla bəy Divanbəyoğlu. Seçilmiş əsərləri. Bakı: Şərq-Qərb, 2006.
4. Bəktaşi İ. A.Divanbəyoğlu. Bakı: Gənclik, 1984.
5. Bəktaşi İ. A.Divanbəyoğlunun elmi-publisistik əsərləri. ADU-nun Elmi əsərləri, 1965.
6. Seyidov F. Qori Seminariyası və onun məzunları. Bakı: Maarif, 1988.
7. Azərbaycan pedaqoji antologiyası. XIX əsr, XX əsrin əvvəlləri. Bakı, 2011.

**А.Байрамоглы**

**Педагог-просветитель**

**Резюме**

В статье говорится о литературной, научно-педагогической деятельности писателя-ученого, педагога, общественного деятеля А.Диванбекоглы.

**A.Bayramoglu**

**Enlightenment pedagogue**

**Summary**

The article is dedicated to the writer, scientist, educator, social activist Divanbayoglu and his scientific-pedagogical activity.



# TÜRKOLOJİ QURULTAY: ÖZBƏKİSTANDA YENİ ƏLİFBA MƏSƏLƏSİ

**Səxavət Ociyev,**
***Akademik, Ə.Nəvai adına Səmərqənd Dövlət Universitetinin professoru***

***Açar sözlər:*** *türkoloji qurultay, yeni əlifba, türkoloq alimlər, türkdilli xalqlar.*
***Ключевые слова:*** *тюркологический съезд, новый алфавит, ученые-тюркологи, тюркоязычные народы.*
***Key words:*** *turkish congress, new alphabet, turkish scientists, turkish speaking peoples.*

Azərbaycan və Özbəkistan eyni taleyi yaşayan türkdilli ölkələr kimi əsrlər boyu bir-birinə sadiq olan qardaş xalqlardır.

1996-cı ildə ümummilli lider Heydər Əliyev Özbəkistan Prezidenti İslam Kərimovun Azərbaycana səfəri zamanı demişdir: " Özbəkistan və Azərbaycan xalqlarının mədəni əlaqələri çox-çox qədim zamanlara gedir… Bu gün biz bir daha yaxınlaşırıq. Bütün bunlar o bünövrə üstündə qurulur, hansı ki, bizim keçmiş nəslimiz, ata-babalarımız tərəfindən qoyulmuşdur. Bütün bunlar mümkün olur ona görə ki, biz bu kökdən şaxələnən xalqlarıq. Bizi tarixi köklərimiz çox möhkəm bağlayır. Eyni dilə, eyni dinə malik olmağımız, bir-birinə ən yaxın, hətta eyni olan adət-ənənələrimiz, əxlaqi dəyərlərimiz, mədəniyyətimiz, ədəbiyyatımız - bütün bunlar o baza, o bünövrədir ki, hansıların əsasında və üzərində bugünkü Azərbaycan-Özbəkistan münasibətləri qurulur".

Bu fikri davam etdirən Özbəkistan Prezidenti cavab nitqində demişdir: "Heydər Əliyev mədəniyyət haqqında çox geniş qeyd etdi və mən buna əlavə edə bilmərəm. İstərdim ki, dahi azərbaycanlılardan Nizami Gəncəvi, Məhəmməd Füzulinin adlarını çəkim, hansılara ki, bizdə bəlkə də sizdəkindən də çox hörmət bəslənilir. Bunu ona görə deyirəm ki, Füzulinin özbək dilinə tərcümə edilmiş qəzəlləri Özbəkistanımızın ən uzaq guşəsində belə hər zaman böyük maraqla dinlənilir və həyatı yeni nəbzdə, ruhda düşünməyə kömək edir. Əgər zamanın görkəmli insanları haqqında dedikdə, millətcə azərbaycanlı olan, bizim yazıçımız Maxsud Şeyxzadə haqqında deyə bilərik ki, O, Azərbaycanın Özbəkistan tarixinə əbədi olaraq həkk olunmasında əvəzsiz hissə qoşmuşdur" .

Azərbaycan-Özbəkistan xalqları arasında olan elmi, mədəni və dostluq əlaqələrinin inkişafında, xüsusən XX əsrin birinci yarısındakı ən dəhşətli tarixi anlardan və onun elm, mədəniyyət, dil azadlığı uğrunda zəhmət çəkən və bu yolda qurban olan görkəmli ədiblərimizi də xatırlamamaq olmur.

Ata-ana irsi ilə keçən, ana südü ilə yoğrulan, ana dili vasitəsi ilə hər bir xalqın elm, fənn, mədəniyyəti inkişaf edərək öz vətəndaşlarını vətənə sədaqətli, insanlara dəyanətli tərbiyə etmək vəzifəsini daşıyır. "Vətənini sevən ziyalılar bilir ki, "Əgər hər hansı bir milləti məhv etmək istəyirsənsə, yetər ki, o millətin dilini və mədəniyyətini əlindən al ki, o millət özü-özündən məhv

olsun". Ona görə də, ana dili, əlifba məsələsi öncül vəzifələrdən birinə çevrilmişdi.

XX əsrin birinci yarısında, keçmiş sovet məkanında zorakılıqla sovetlər birliyinə qoşulmuş türkdilli xalqlar, o cümlədən Azərbaycan və Özbəkistan xalqlarının dili və əlifbası əlindən alınaraq, elm və mədəniyyəti məhv olunmağa məruz qalmışdır. Onların sırasında tatarlar, türkmənlər, qazaxlar, kırqızlar, kabardin-balkarlar, başkirlər, çeçenlər və başqaları da vardı.

Həqiqət naminə demək olar ki, bütün tarix boyu milləti yaşatmaq və yaxud məhv olmağa məhkum olmaq kimi neqativ hadisələrlə mübarizə aparmaqda Azərbaycan xalqı, xüsusən ziyalılar ön sırada durmuşlar. Məhz o dövrdə də Azərbaycan ziyalıları öz elm və mədəniyyətinin inkişafı keşiyində birincilər sırasında durmuşdu. Təsadüfi deyildir ki, Azərbaycan təşəbbüsü öz üzərinə götürərək 26 fevral 1926-cı ildə I Türkoloji qurultayın Bakı şəhərində keçirilməsinə nail oldu. Qurultaya Türkiyə dövlətinin nümayəndələri, Özbəkistan, Türkmənistan, Qazaxıstan, Qırğızıstan, həmçinin Rusiyanın tatar-başkirlər, çeçenlər və başqa xalqlarını təmsil edən görkəmli türkoloqlar dəvət edilmişdilər.

Qurultaya 131 nümayəndə gəlmişdi. Özbəkistanı 13 nəfər təmsil edirdi. Eyni zamanda qurultayda 60 nəfər dilçi, ədəbiyyatşünas, şərqşünas və b. iştirak edirdi. Qurultayın 17 iclası keçirilmiş, burada 37 məruzə dinlənilmişdi. Bu məruzələrdən 5-i türk xalqlarının tarixi və etnoqrafiyasına, 2-si türk xalqlarının ədəbiyyatına, 7-si türk xalqlarının dillərinə, 7-si əlifba probleminə, 6-sı orfoqrafiya probleminə, 2-si türk xalqlarının mədəniyyətinə, 5 məruzə türk ədəbi dilçilik terminologiya problemlərinə, 2 məruzə isə türk dillərinin tədrisi məsələlərinə həsr olunmuşdu. Qurultayda V.V.Bartold, Miller, L.V.Şerba, Oldenburq, A.Samoyloviç, Aşmarin, Malov kimi alimlər məruzə etmişdir.

Qurultayın son iclası qurtaranda nümayəndələr özbək şairi Ə.Nəvainin yubileyinə getdilər. Həmin günlərdə Azərbaycanda özbək klassiki Ə.Nəvainin 485 illik yubileyi qeyd olunurdu. Maraqlıdır ki, qurultayın bütün 500 iştirakçısı birlikdə həmin yubileyə getdi. Bu, Azərbaycanda özbək mədəniyyətinə böyük hörmətin bariz ifadəsi idi.

Qurultaydan sonra bir neçə il onun qərarları yerinə yetirilirdi. Belə tədbirlərdən biri də plenumların keçirilməsi idi. Belə plenumlardan biri Bakıda 1927-ci ilin iyul ayında olmuşdur. Burada lak, darkin, ləzgi, abxaz və başqaları üçün əlifba tərtib edildi. 1928-ci ildə belə bir plenum Daşkənddə keçirildi. Azərbaycan öz estafetini Daşkəndə ötürdü. Sonra bu işlər Kazanda və Almatıda davam etdirildi. Lakin 1937-ci ilin repressiyası yaxınlaşırdı. 1940-cı il yanvarın 1-dən başlayaraq latın əlifbasından rus əlifbasına keçid başlandı. Türkoloji qurultayın izi itirilməyə yönəldi.

Bir qədər əvvələ qayıdaq. Türkoloji qurultaydan sonra gündəmdə əlifba məsələsinin həlli dururdu. Orta Asiyada bu işə ümid edən Özbəkistan idi.

Lakin qeyd etmək lazımdır ki, özbəklərin layihəsi çox ləngimişdi. Onlar Birinci Türkoloji Qurultaydan dörd-beş ay keçməsinə baxmayaraq, təzyiqlərə məruz qalaraq ciddi bir iş görə bilmirdilər. Hələ də layihələrini Azərbaycandakı "Yeni Əlifba Komitəsi"nə təqdim etməmişdilər. Ona görə də özbəklərlə yeni əlifba ilə bağlı görüşməyə ehtiyac duyulurdu. Belə qlobal məsələni Özbəkistansız həll etmək mümkün olmurdu. Bu məqsədlə "Yeni Əlifba Komitəsi"nin qarşıdan gələn plenumlarına qədər Özbəkistanda və Türkmənistanda müzakirələr, söhbətlər aparmaq bir tələbata çevrilmişdi. Buradakı söhbətləri və müzakirələri daha təcrübəli olan Xalid Səid Xocayev aparma-

lıydı. Ona görə də, Azərbaycanda Yeni Əlifba Komitəsinin sədri Səməd Ağamalıoğlu Xalid Səidə onu da demişdir ki, Türkmənistanda və Özbəkistanda yeni əlifbanı hazırlamağı Allahın ixtiyarına buraxıblar. Onlar Birinci Türkoloji Qurultaydan sonra yeni əlifba ilə bağlı bir iş görməyiblər. "Hər nə isə indi Türküstana get, türkmənlər, özbəklər ilə görüş, təzədən işə girişmələri üçün hər nə lazımsa, mənə teleqraf ilə bildir; ədəbiyyat lazımsa göndərərəm; pulları yoxsa komitənin kassasından pul da verərəm; onlar təkcə işə başlasınlar; bir də mənim namımdan rica et, proje məsələsində də bizi çətinlikdə buraxmasınlar".

Səməd Ağamalıoğlunun tapşırığından sonra Xalid Səid 1926-cı il iyunun 5-də Bakıdan Türküstan ellərinə ikinci dəfə yollanır.

Xalid Səid əvvəlcə Özbəkistana doğru hərəkət etməli olur. Və yeni əlifba ilə bağlı məsələni müzakirə etmək üçün Özbəkistan Mərkəzi İcraiyyə Komitəsi sədrinin evində olur. Ona, Azərbaycanda yeni əlifbanın böyük nəticələr verdiyini deyir. Yeni əlifbanın faydalı olduğunu anlatmağa çalışır. Yeni əlifbanı həyata keçirmək üçün lazım olan idarələrə əmr verilməsini xahiş edir. Xalid Səidə deyilir ki, Özbəkistanda yeni əlifba qəbul edilib, Özbəkistan Mərkəzi İcraiyyə Komitəsi yanında yeni əlifba komitəsi də yaradılıb. Həm də Komitə yeni əlifba ilə işləri idarələrdə həyata keçirməyə çalışacağını da vəd edir. Ancaq məktəblərdə yeni əlifbanı həyata keçirmək üçün maarif komissarlığına müraciət etməyin vacibliyi də Xalid Səidin nəzərinə çatdırılır. Xalid Səid maarif komissarlığına gedir. O Komissarlar Şurasına, komissarlar şurasının sədri Feyzulla Xocayevin evinə gedir, görüşməyinin məqsədini ona izah edir. Komissarlar şurasının sədri Feyzulla Xocayev Xalid Səidi yenidən maarif komissarının yanına göndərir. Xalid Səid firqə məsul katibinin yanına gedir. Və ona deyir ki, maarif komissarlığına, komissarlar şurasına getsə də, məsələ ilə bağlı heç bir dəstək almayıbdır. Firqə məsul katibi Xalid Səidə deyir ki, o da tapşıracaq, sabah bir də maarif komissarlığına getsin. Bununla da Xalid Səidi görüşdüyü hər kəs başından edirdi. Bütün bu çətinliklərə baxmayaraq, Xalid Səid elmi şurada qərarın çıxarılmasına nail olur. Ən başlıcası görüləcək işlərin planı tutulur ki, 1926-cı il avqustun on beşinə qədər bütün Özbəkistanda iki min ibtidai məktəb müəllimi yeni əlifba ilə savadlanacaq, bu əlifbanı öyrənəcəkdi. Xalid Səidə görə, bu, ilk addım, həm də böyük addım idi.

Xalid Səid Xocayev bütün bu çətinliklərə baxmayaraq yazırdı: "...Azərbaycanda ilk əvvəl Mirzə Fətəli Axundzadə ilə başlayan yeni əlifba fikri böyük inqilab nəticəsində yenə Azərbaycan Yeni Əlifba Komitəsinin fəal təşəbbüsü ilə həyata tətbiq edildi". O davam edərək yazırdı: "... Bu qurultay (Birinci Türkoloji Qurultay – B.X.) Şərq aləmindəki mədəni inqilabın ən mühümü olan əlifba inqilabının rəsmi surətdə təməl və əsasını qoymuş olduğu kimi əsrlərcə ərəb əlifbasının müşkülatı altında əzilən xalqlar ilə əlifbadan məhrum olan, bir çox ibtidai halda yaşayan xalqlar üçün elmi, fənni əsaslar üzərinə qurulan bir əlifba verdi".

Bildiyiniz kimi, qurultayın məsələlərindən ən əsası sovet məkanında olan türk xalqlarının ana dilinin geniş inkişafı üçün əvvəlcə latın əlifbasının çap edilməsi lazım idi. Buna da qurultay müvəffəqiyyətlə nail oldu.

Bəzi anlaşılmazlıqlar olsa da, özbək türkoloqları da Yeni Türk Əlifbasının Mərkəzi Komitəsinin Bakıda qərarlaşmasını düzgün addım hesab edirdilər. Həm də bu fikirlə razılaşırdılar ki, Yeni Türk Əlifbasının Mərkəzi Komitəsi indiyə qədər köçəri həyat sürüb, latınlaşma nöqteyi-nəzərinin

təbliği cəhətdən müəyyən işlər görülüb. Türkoloji qurultaydan sonra bu komitənin üzərinə düşən tapşırıqlar daha da genişləndi və Azərbaycan, Qazaxıstan, Orta Asiya və s. xalqlara aid olan tapşırıqların icrasına başlandı. Bu təsir dairəsinə Sibir, Uzaq Şərq xalqları da daxil olurdu. Türkoloqlar düşünürdülər ki, belə vəziyyətdə yeni əlifbaya keçən regionlarda türkdilli xalqları onların yaxın qonşuluqda olan xalqların müəyyən təsirindən qorumaq da lazım gəlirdi.

Qurultayda Özbəkistandan gələn nümayəndələr fəallıq göstərirdilər. Özbəkistanı Məşriq Yunus oğlu Elbəy (1899-1942), Aşurəli Zaxiriy (1885-1937), Rəim İnaqamov (1902-1938), Qazi Alim Yunusov (1889-1942), Abdurəşid Abducabbarov, İsmayıl Sədriy, Şakircan Rəhimov, Nazir Turakulov və başqaları təmsil edirdi. Onlar qurultayın abu-havasından yararlanaraq, öz vətənlərinə qayıdanda, heç nədən çəkinmədən, qızğın iş apararaq, özbək dili üçün əvvəlki latın əlifbasını qəbul etdilər. Sonrakı illərdə bu əlifba tədricən təkmilləşdirilərək, onun variantları bir neçə dəfə dəyişdirilmişdir.

O illərin tarixindən bəllidir ki, 1938-ci ilə qədər Sovet rejimi bütün gücü ilə, qəddarlıqla Rusiya ərazisindəki müsəlman xalqlarının, eləcə də, Azərbaycan və Orta Asiya xalqlarının latın qrafikasına keçməsinə dözmədilər. Belə qara buludlar Özbəkistanın da başının üstünü aldı.

Acınacaqlı haldır ki, millətin gələcəyi naminə bu yolda canından keçən ən görkəmli vətənpərvər ziyalılar amansızcasına məhv edilir. Onlar Stalin rejiminin qurbanı oldular. Onu da vurğulamaq istəyirəm ki, onların üçü Səmərqənd şəhərindən idi. Məşriq Yunus oğlu Elbəy və Abdurəşid Abducabbarovlar daha fəal idilər.

Məşriq Yunus oğlu Elbəy 1898-ci ildə Özbəkistanın Bostanlıq rayonunun Xumsan kəndində kasıb kəndli ailəsində anadan olub. Elbəyin uşaqlıq illəri Türkistan torpaqlarının bölünməsi, talan-tarac edildiyi ağır dövrdə keçirdi. O, 1905-ci ildə dörd illik məktəbə daxil olur və əla oxuyur. Sonra Daşkəndə gələrək, Quyu Divanbəyi məhəlləsində 1911-ci ildə yeni üsullu (Üsulicədid) məktəbinə daxil olur. Maddi sıxıntı içərisində yaşayan Elbəy təhsilini davam etdirib elm öyrənirdi. Daşkənd şəhərinin, Şayxontoxur məhəlləsində Münəvvər Qarının (o dövrdə ən nümunəvi sayılan) Rüşdiyyə məktəbini bitirdikdən sonra müəllimlik edir. Müəllimliklə bərabər Elbəy mətbəədə də işləyir. Beləcə, o, mətbuat, çap işlərini də öyrəndi. Yaradıcılığının ilk mərhələsinə başlayaraq, müxtəlif mətbuatlarda məqalələr çap etməyə başladı. Türkistanın əvvəl çar Rusiyasının, sonra isə bolşeviklərin alovunda yandığı bir vaxtda, Elbəy kimi ürəyiodlu vətənpərvər ziyalılara ehtiyac var idi. Eyni zamanda sovet idealogiyası qabaqcıl milli ziyalıları nəzarətdə saxlasa da, onları ələ alıb, özlərinə xidmət etdirmək məqsədi ilə bəzən onlara şərait də yaradırdılar. Elə bu illərdə gənc şair, yazıçı Elbəy 1917-ci ildən başlayaraq, müxtəlif mətbuatlarda “Kurolqa” (silaha), “Turan”, “Türk sözü”, xüsusən 1920-ci ildən texnikum və institutda dərs verdiyi zaman, araşdırmalar apardı, dərsliklər yaratdı, məqalələr dərc etdi. Qeyd etdiyimiz kimi, bolşeviklərin aldadıcı güzəştlərindən bir az yararlanan Elbəy 1926-cı ildə Bakı qurultayından geri döndükdən sonra vətəninə, xalqına edilən haqsızlığa dözə bilmədiyindən öz etirazını “Lena gülləboranı”, “Azadlıq gülləboranı”, “Özbək igidinə”, “Müjdələr”, “Dəniz”, “Solğun çiçək”, “Könül çiçəyi” və başqa çoxsaylı şeirləri ilə bildirirdi. Elbəyin zəngin elm və publisistik irsini qısa bir vaxt çərçivəsində, yaxud bir neçə vərəqə sığdırmaq mümkün deyil. Acınacaqlısı odur ki, cəmi qırx dörd il ömür yaşamış, onun da beş ilini stalin rejimi cəsuslarının zülmünə dözə bilməyib 1942-ci

ildə “xalq düşməni” damğası ilə həbsxanada vəfat etmişdi. Məhz müstəqillik qazandıqdan sonra Elbəyin əsərləri çap olundu və xatirəsi əbədiləşdirildi.

Qazi Alim Yunusov (1889-1942) – Özbəkistanın tarixçisi və folklorşünası kimi fəaliyyət göstərmişdir. Daşkənd şəhərində doğulsa da əsasən qədim Səmərqənd şəhərində yaşayıb-yaratmışdır. Özbəkistan Akademiyası mərkəzində sədr müavini vəzifəsində çalışarkən xalq epik mahnılarını, dastanlarını və özbək xalqının tarixi barəsində materiallar toplayaraq çap etdirmişdir. Onun da millətsevərliyi, bilimdanlığı nəticəsində 4 dekabr 1937-ci ildə NKVD-nin üçlüyü tərəfindən on il həbs olunmuşdur. 5 may 1942-ci ildə Arxangel vilayətində həbsxanada vəfat etmişdir.

O da digər özbəklər kimi etiraf edirdi ki, yeni əlifbanın binası ilk dəfə Azərbaycanda qoyulmuşdur. Azərbaycan bu sahədə türk xalqları içərisində daha irəlidə olmuşdur. Bir sıra fikir ayrılıqlarına münasibət bildirən Səməd Ağamalı oğlu yazırdı ki: “Kazanda, Özbəkistanda, Türkmənistanda, Krımda yeni əlifba düşmənləri deyirlər ki, əgər Kazan, Krım, Türkmənistan və başqaları yeni əlifbanı götürsələr, qeyri-türklərdən ayrılacaqlar. Biz soruşuruq, bu nə deməkdir”.

Göründüyü kimi, yeni əlifbanın qəbulu Özbəkistanda da birmənalı qarşılanmamışdı. Orada da yeni əlifbanın həm tərəfdarları, həm də əleyhdarları vardı. O zaman hər yerdə yeni əlifbanı yeni üsul, köhnə əlifbanı (ərəb əlifbasını) köhnə üsul hesab edirdilər.

Məhz o illərdə yeni əlifba tərəfdarlarından biri də Səid Rza Əlizadə idi. O öz əsərləri ilə uğurlu elmi nailiyyətlər qazanmaq əzmində olmuşdur. Əlizadə qurultaya qatılmasa da, burada irəli sürülən ideyaların reallaşması uğrunda çalışmışdır. O, Özbəkistanda, xüsusən Səmərqənddə istiqlal uğrunda özbək ziyalıları ilə çiyin-çiyinə mübarizə aparmış görkəmli pedaqoq, yazıçı, şair, tərcüməçi səviyyəsinə yüksəlmişdir. Azərbaycanlı Səid Rza (1887-1945) bütün ömrünü Səmərqənddə yaşayaraq, ömrünü Türküstan elm, fənn, mədəniyyətinə həsr etmişdir. O, 1917-ci ildə özbək ibtidai məktəbləri üçün ilk əlifbanı (Birinci il), 1920, 1924, 1925-ci illərdə tacik ibtidai məktəbləri üçün əlifba (Soli naxustin), 1919-1921-ci illərdə özü təsis və baş redaktorluq etdiyi “Şöləyi inqilab” (İnqilab alovu) jurnalı 91 nömrədə, 4000 nüsxədə çap olunaraq, bütün Türküstana yayılmış və maraqla oxunmuş, həmçinin, gizli yollarla bütün şərq dövlətlərinə yayılmışdır. Bu jurnalın birinci nömrəsi Səmərqənd ölkəşünaslıq muzeyində saxlanılmış, 1990-cı illərin əvvəllərində bizim tərəfimizdən qalan nüsxələr Tacikistan milli kitabxanasından fotokopiyalar edilərək gətirilib, geniş tədqiq olunmuşdur. Ümumiyyətlə, Əlizadəşünaslarla birlikdə Səid Rzanın 500-ə yaxın elmi əsərləri, məqalələri, şeirləri üzə çıxarılmışıdır.

S.R.Əlizadənin yeniliklərindən biri də onun ana dilinə müraciəti idi. Onun 1914-cü ildə “Ayna” (“Güzgü”) jurnalının 35-ci nömrəsində çap olunmuş “Hər millət öz dili ilə fəxr edir” adlı məqaləsi, demək olar ki, bu gün də çox aktualdır. Bu məqalədə o yazırdı: “Zəmanəmizdəki iki mühüm məsələlərdən biri də dil məsələsidir. Ayıq millətlər bunun əhəmiyyətini birinci məsələlərdən artıq hesab edirlər. Həmişə öz dillərindən xəbərdar olurlar, hər kim yeri gələndə, bir xarici söz yerinə iki ya üç kəlmə öz sözlərindən qoşub axırına yetirirlər. Həqiqətən, həm hansı bir millət ki, öz dilini özgə lüğətlərdən təmiz saxlasa, öz millətini mühafizə etsə, din və adətini əldən verməz. Lakin biz türkistanlılar isə qəflət və cəhalətimizin çoxluğundan bu mühüm məsələdən həm xəbərsizik. Öz dilimizdə

türkcə, ya ərəbcə sözlər olduğu halda, yenə də həvəs üçün rus və yaxud fransız sözlərini araya qoşub, istifadə edirik. İki türkistanlı bir-biri ilə danışanda həvəslə rus sözlərini araya gətirmək, xüsusən ayıb olmalıdır.

Bu Türkistanımızda hansı bir rus yaxud erməni öz dilini qoyub, bir-biri ilə türkcə danışırlar?! Amma biz danışdığımız vaxtda heç olmasa, hər bir cümlədə bir kəlmə rus sözü işlədirik.

Aydındır ki, heç bir ağıllı, huşlu adam rusca oxuyub, danışmaq lazım deyil deyə bilməz. Lakin öz dilini qoyub, öz həmyerlisi, həmməzhəbi ilə rusca, fransızca və başqa dildə danışsa, eyibdir, ardır, başqa sözlə desək, gülməlidir. Əgər ki, dilimizin qədir qiymətini mühafizə eləməsək, ona xarici lüğət və sözləri qoşsaq yaxın bir zamanda dil və millətimizi itirəcəyik. Millətimizi itirsək, məzhəbimiz öz-özünə yox olacaq. Onda bizim üçün dilimizi xarici sözlərdən mühafizə eləmək ən birinci mühüm vəzifədir" .

S.R.Əlizadə Akmal İkramov, Fayzulla Xocayev, A.Kadıri, Usman Nasir, Fitrət, Çulpan, N.Turakulov və minlərlə başqa vətənpərvər ziyalılar kimi, 1937-ci ilin qurbanı olaraq, həbs edilib. Böyük türkoloq 1945-ci ildə Vladimir şəhərində məhbuslar həbsxanasında ağır xəstəlikdən vəfat etmişdir.

Özbək xalqının mübarizəsi hədər getmədi. Özbəkistan öz müstəqilliyini elan etdikdən iki il sonra 02 sentyabr 1993-cü ildə latın əlifbasına keçmək barəsində qərar qəbul etdi. Demək olar ki, bugünkü latın əlifbasının kökündə elə o illər qəbul olunan latın qrafikası variantları durur.

Türkoloji qurultayın rolu və əhəmiyyəti danılmazdır. Qeyd etmək lazımdır ki, bu sahədə bütün SSRİ miqyasında türkdilli xalqların yeni latın əlifbasına keçməsi haqqında SSRİ MİK və XKS 7 avqust 1929-cu il qərarı həlledici rol oynamışdır. Fransız şərqşünası professor Mosinyanın sözləri ilə desək, bu qurultaydan sonra "Şərq ayağa qalxır".

***Rəyçi: akad. Hüseyn Əhmədov***

## İstifadə edilmiş ədəbiyyat

1. Азербайджан-Узбекистан: Отв. за выпуск Фатима Абдуллазаде. Баку: Азербайджан, 1997.
2. Əlizadə S. Hər millət öz dili ilə fəxr edir. " Ayna" jurnalı, 1914, № 35.
3. Оджиев С. Жизнь и деятельность Саид Ризо Ализаде. Самарканд: Сугдиён, 1998.
4. Культура и писменность Востока. ки. III. М, 1928.
5. Nəcəfov N., Ociyev S. Səid Rza Əlizadənin dilçilik sahəsindəki fəaliyyəti. Ana sözü, 1996, №3.
6. Xalid Səid. Yeni əlifba yollarında əski xatirə və duyğularım. Bakı, 1929.

**С.Оджиев**

**Тюркологический съезд: задача нового алфавита в Узбекистане**

**Резюме**

В статье говорится об отношении к перекоду в новой алфавит в период Первого Тюркологического съезда в Узбекистане и после него. Напоминаются такие тюркологии, как М.Элбай, Гази Алим Юнусов, Саид Рза.

**S.Ojiyev**

**Turkish Congress: the issue of new alphabet in Uzbekistan**

**Summary**

In the article it is spoken about new alphabet in Uzbekistan before and after the first Congress held in Baku in 1926.Great Turkish pedagogues as M.Elbay, Gazi Alim Yunusov and Said Rza are mentioned in the article.



# TÜRK DÜNYASININ SÖNMƏZ GÜNƏŞİ

**Nəcəf Nəcəfov,**
***Azərbaycan Yazıçılar və Jurnalistlər Birliyinin üzvü, filologiya üzrə fəlsəfə doktoru, dosent, əməkdar müəllim***

*Məqalədə böyük tatar şairi Musa Cəlilin ömür yolundan bəhs edilir. Musa Cəlil faşistlərə əsir düşsə də, mübarizəsini davam etdirmiş, “Moabid dəftər”ini yazmış, öz yenilməzliyi ilə tarixdə iz qoymuşdur. S.Vurğun onun yaradıcılığına yüksək qiymət vermişdir.*

***Açar sözlər:*** *“Moabid dəftəri”, hərbi əsir, vətənpərvərlik fəaliyyəti, ölümündən sonra, bəraət.*

***Ключевые слова:*** *“Моабитская тетрадь”, военнопленный, патриатическая деятельность, посмертно, реабилитация.*

***Key words:*** *"Moabid copy book", military captive, patriotic activity, after his death, was acquitted.*

Bakıda Birinci Türkoloji qurultay çağırılanda tatar xalqının yenilməz oğlu Musa Cəlilin cəmi 20 yaşı vardı. Qurultayda onun sələfləri tatar xalqının dil, əlifba məsələlərinə dair fikirlərinin ifadəçisi kimi çıxış edirdilər. Tatarıstanlı türkoloq Qəlimcan İbrahimov qurultayın Rəyasət Heyətinə seçilmişdi. Öz xalqının başını ucaldan Musa Cəlilin qəhrəmanlıqla dolu, məşəqqətli, zəngin ömür yolu isə hələ qabaqda idi. Türk dünyası yeni istedadını gözləyirdi. İndi Türkoloji qurultayın çağırılmasından 90 il, Musa Cəlilin doğulmasından isə 110 il keçir. Tarix isə izləri itirmir.

“Dünya poeziyasının tarixi bir çox gözəl, görkəmli şairlər tanıyır, lakin xalqın şöhrət və iftixarı olmaq heç də onların hamısına nəsib olmamışdır. Musa Cəlil bütöv xalqın, öz dövrünün şöhrət və iftixarı olan seçmə və xoşbəxt şairlər dəstəsinə mənsubdur”. Bu sözləri Səməd Vurğun tatar şairi Musa Cəlilin vəfatının 10 illiyi münasibətilə keçirilən yığıncaqda söyləmişdir.

Musa Cəlilin sədası Qərbdən Şərqə, bütün türk aləminə, uca Pamir dağlarına da çatmışdı. Tacikistanın xalq şairi Mirzə Tursunzadə yazırdı: “Musa Cəlil ən əziz insan və sevimli şair kimi mənim qəlbimdə yuva qurmuşdur. Musa Cəlili oxuyanda, yaxud onun haqqında fikirləşəndə belə qərara gəlirəm ki, onun bütün həyatı əsl igidlik həyatıdır. Elə bir həyat ki, onunla müasirləri fəxr edirlər, elə bir həyat ki, ondan gələcək nəsillər nümunə götürürlər. Onun “Moabid dəftəri” Pamirin ən ucqar qışlağına qədər gedib çıxmışdır. Öz ölümü ilə qələbə qazanan adamlar ölməzdirlər”.

Musa Mustafa oğlu Cəlilov (Musa Cəlil) 1906-cı ildə keçmiş Orenburq quberniyasının Mustafino kəndində anadan olmuşdur. O, uşaqlıqdan atasını itirmiş, anasının himayəsində yaşamışdır. Atası Mustafa aulda yaşayan kasıb naxırçının oğlu idi. Balaca Musanın dünyagörüşünə anası Rəhimə Ananın böyük təsiri olmuşdur. Mustafadan fərqli olaraq Rəhimə ana sakit, təmkinli qadın idi. Musa 6 yaşından kəndlərindəki məktəbə getmiş, o az vaxtda Qurandan bir neçə surəni əzbərləmişdi. O, ilk təhsilini də müsəlman tədrisi müəssisəsi

olan “Hüseyniyyə” mədrəsəsində (ruhani seminariyada) almışdı.

Dövrünün qaynar hadisələri bu gözüaçıq gəncə də təsir etmişdi. 1917-ci il hadisələri başlayanda on bir yaşlı Musa artıq ilk şeirlərini yazırdı. O, müharibənin mənasızlığını, yüzlərlə insanın qanının nahaq yerə axıdılmasını uşaq qəlbi ilə duyur, yaradıcı xəyalı onu yeni bir aləmə çağırırdı. O, ilk şeirlərini tez-tez tatarca çıxan “Vaxıt” (“Vaxt”) qəzetinə göndərir, çap edilməsini israr edirdi. Lakin onun ilk qələm təcrübəsi olan şeirlərini çap etmirdilər və əslində çap edə də bilməzdilər. Onun ilk əsəri 1919-cu ildə dərc olundu. Sonralar o, indiyədək çap olunmayan şeirlərini yenidən işləyərək 1920-ci ildə “Müharibədə” başlığı ilə çap etdirdi.

Musa Cəlil hələ 1918-1921-ci illərdə xalq mahnıları, nağıllar və əfsanələr əsasında şeirlər, hekayələr, pyeslər qələmə almışdı. Bunların bir qismi elə o zaman işıq üzü görmüşdü. İlk yazılarından hiss olunurdu ki, tatar xalqının içərisindən ürəyi xalqı ilə döyünən yeni istedad yetişir. O, ürək sözlərini xalqına bədii vasitələrlə çatdırmaq arzusu ilə yaşayırdı. “Azadlıq şairinin sözü” adlı şeirində o, qəbir evinə gedənə qədər xalqa sadiq qalacağını bəyan edirdi. 1921-ci ildə bütün ölkədə olduğu kimi Orenburqda da aclıq başlanır. Musanın gözü qarşısında iki qardaşı acından ölür. Uşaqları saxlamaq naminə ana şəhərə üz tutur. O burada da çox əziyyət çəkir. Yeniyetmə gənc isə çətinliklə də olsa “Qızıl ulduz” qəzetinə işə düzəlir və eyni zamanda Orenburq hərbi məktəbinin kursantı kimi qeydə alınır, az sonra isə Tatarıstan Xalq Təhsil İnstitutuna daxil olur. Bu institut onun əvvəllər oxuduğu “Hüseyniyyə” mədrəsəsinin bazasında yaradılmışdı.

Ötən əsrin 20-ci illərindən bədii yaradıcılığa başlayan şairin vətən, xalq, ayrılıq mövzularında yazılmış şeirləri oxucuların marağına səbəb oldu. Erudisiyalı, enerjili bu gənc ictimai hadisələrə biganə qalmır, hətta Rusiyada başlayan vətəndaş müharibəsinin iştirakçısı olur. O Dutovla vuruşur, qanlı döyüşlərin şahidi olur.

1925-ci ildə onun "Biz gəlirik" adlı şeir və poemalar toplusu işıq üzü görür.

1929-cu ildə Musa Cəlilin “Keçmiş günlər” poeması çap olunur. Bu illərdə o komsomol orqanlarında rəhbər vəzifələrə seçilir, siyasi yetkinlik göstərir və tezliklə Moskvaya oxumağa göndərilir. Təhsilini MDU-nun filologiya fakültəsində davam etdirir. Bu illərdə onun doğma dildə yazdığı şeirlər çap olunub, yığıncaqlarda oxunurdu. 1931-ci ildə universiteti bitirib, Kazana qayıdır və burada ictimai-siyasi fəaliyyətini genişləndirir. 1939-cu ildə o, Tatarıstan MSSR-nin Yazıçılar İttifaqının sədri seçilir və rəngarəng yaradıcılığı ilə hamının diqqətini cəlb edir. Artıq Tatarıstanın şair oğlunu tanıyır və sevirdilər. Onun əsərləri əsasında “Altun Çeç” və “İl dar” operaları yaradıldı. Bəstəkar N.Jiqanov onun əsərləri əsasında opera yaratdı. Hətta “İl dar” operası Stalin mükafatına layiq görüldü. Şairin yaradıcılığı üç dövrə bölünür: ilk dövr – 1918-1923-cü illər, ikinci dövr 1924-1932-ci illər, yəni yetkinlik dövrü, üçüncü dövr, 1933-1940-cı illər, yəni müharibəyəqədərki illər. Artıq onun yaradıcılığının ən mürəkkəb, ən çətin, ən məhsuldar dövrü – Böyük Vətən müharibəsi dövrü yaxınlaşırdı. O, 3 iyul 1941-ci ildə Ali Baş Komandanın radio ilə çıxışından sonra könüllü olaraq ordu sırasına yazılır və artilleriya polkunda “atlı kəşfiyyatçı” yerini tutur. Leninqrad və Volkov cəbhələrində döyüşür, hərbi müxbir kimi fəaliyyət göstərir. 1942-ci ildə onun bir neçə şeiri “Artilleristin andı” adlı almanaxa daxil edilir. Lakin bu coşqun ömür anları çox davam etmir. 1942-ci ilin iyulundan Musanın cəbhə məktublarının arası kəsilir. Hər yerə onun itkin düşməsi xəbəri yayılır. 26 iyul 1942-ci ildə ağır döyüşlərdə döşündən yaralanan Musa Cəlil hitlerçilərə əsir düşür. Lakin o bunu mübarizənin sonu

hesab etmir, ona görə də bu vəziyyətlə barışmaq istəmirdi. Tezliklə vətənpərvər şair legionçularla birləşir, almanlar tərəfindən yaradılmış “İdil-Ural” legionuna daxil olur. Az zaman içərisində Polşa torpağında həmyerliləri ilə birləşir. Musa Cəlil bu işləri mədəni-maarif tədbirləri adı altında həyata keçirirdi. Bu məqsədlə o, xor kopellası təşkil edir və böyük siyasi təşkilatlarla da əlaqə yaradırdı. Onun da qoşulduğu “İdil-Ural” adlı 825-ci batalyon günü-gündən böyüyür. Beləliklə də, əsirlərlə iş genişləndirilir, 21 fevral 1943-cü ildə Vitebskdə əsirlər üsyana qalxır. Bu üsyanda 500-600 adam iştirak edirdi. Bütün bunların haradan qaynaqlandığını duyan gestapo tərəfindən 1943-cü ilin avqustunda Musa Cəlil həbs edilir. Sonradan məlum oldu ki, gənc yaşlarından arxada və cəbhədə tatar gənclər təşkilatına rəhbərlik edən Musa Cəlil əsir düşəndə də yaradıcılıqdan ayrılmamışdı, "Moabit dəftəri" adlı şeirlər toplusunu elə bu zaman başa çatdırmışdı.

Əsirlikdə də ciddi fəallıq göstərən Musa Cəlil almanların tatarlardan ibarət təşkil olunmuş legionunun üzvləri arasında antifaşist qüvvələrin yaradıcılarından biri kimi çox iş görmüşdü. O əsirlərin kütləvi şəkildə qaçışını da təşkil etmişdi. Ona görə də Musa Cəlil tutularaq 25 avqust 1944-cü ildə Berlindəki Pletsenzeye həbsxanasına salınır və burada digər məşhur tatar yazıçısı Abdulla Alişlə birlikdə edam edilir.

Müharibə qəhrəmanları bir-birindən çox fərqlənirlər. Məsələn, faşistlərə qarşı mübarizədə İlya Erenburq vətənpərvərlik mövzusundakı məqalələri ilə, Konstantin Simonov, Anna Axmatova, Səməd Vurğun təsirli şeirləri ilə, Aleksandr Tvardovski “Vasili Tyorkin” kimi poemaları ilə fədakarlıq göstərirdilərsə, Mehdi Hüseynzadə, Musa Cəlil də öz həyatlarını təhlükəyə ataraq gizli işlərlə məşğul olurdular.

Müharibədən sonra sovet rejiminin sərt qanunlarının təsiri ilə Azərbaycanda olduğu kimi, Tatarıstanda da əsirlərlə amansızcasına davranılır, ona da Vətən xaini damğası "vurulur", həyat yoldaşı Amina xanımdan və qızı Çulpandan ibarət ailəsi isə sürgün olunur. Yüzlərlə sovet ailəsi kimi bu ailə də ləkələnir. Hətta 1947-ci ilin aprelində Musa Cəlilin adı çox təhlükəli cinayətkarlar sırasına daxil edilir. Lakin həqiqət gec-tez üzə çıxır. Bu vəziyyət onu tanıyanları, o cümlədən, sağ qalan əsir yoldaşlarını da narahat edirdi. Müharibə isə artıq sona çatmışdı. Onun vurduğu yaraların sağalmasına isə hələ çox qalırdı.

1946-cı ildə sabiq hərbi əsir Niqmet Terequlov Tatarıstan Sovet Yazıçılar İttifaqına şairin onlarla şeiri toplanmış blaknotunu təqdim edir. Bir il sonra Brüsseldəki sovet səfirliyinə ikinci dəftər göndərilir. Bu dəftəri Moabit türməsində Belçika Müqavimət hərəkatının üzvü Andre Timmermans saxlamışdı. Onun məlumatına görə, son görüşdə Musa Cəlil ona demişdi ki, biz bir qrup tatar əsirlərini öldürməyə aparırlar, sən, bu dəftəri mənim vətənimə çatdır.

Timmermans ərəb əlifbası ilə yazılmış bu şeirləri gestapodan müsəlman dostunun yazdığı dualar kimi keçirə bilmişdir.

Ortada başqa bir dəftər də olmuşdu. Moabit şeirlərindən ibarət bu dəftər də sabiq hərbi əsir Qabbas Şaripovda qalmışdı. Lakin sən saydığını say: elə bu vaxt Terequlov və Şaripov da həbs olunur. Terequlov həbsdə ölür, Şaripov isə 10 il iş alır. Sonra isə ələ keçməməsi üçün Volqoqrada köçür.

1946-cı ildə Romadakı sovet səfirliyinə türk əsilli Kazım Mirşan tərəfindən bir dəftər də verilir. Bu dəftər səfirlik vasitəsilə Moskvaya göndərilir. Nədənsə, onun izi itir. SSRİ Xarici İşlər Nazirliyinə və digər orqanlara göndərilən sorğular isə cavabsız qalır. Xoşbəxtlikdən “Moabid dəftəri” adlı şeirlər toplusu haradansa Konstantin Simonovun əlinə düşür. Sanki tale Musa Cəlilin “üzünə” gülmüşdü. Artıq ürəyinin qanı ilə yazılmış bu dəftər etibarlı əllərdə idi.

Konstantin Mixayloviç Simonov tanınmış şəxsiyyət idi. Sovet dövləti özü də onunla hesablaşırdı. Onun ilk pyesi – "Bir məhəbbət tarixi" 1940-cı ildə, ikinci pyesi "Bizim şəhərli oğlan" 1941-ci ildə tamaşaya qoyulmuşdur. Onun "Gözlə məni" şeiri cəbhədə əldən-ələ gəzirdi. Burada S.Vurğunun sözləri yada düşür: "K.Simonovun "Gözlə məni" şeiri milyonlarla adamı dərindən həyəcanlandırırdı. Çox saf və dərin bir səmimiyyətlə aşılanmış olan bu şeir Böyük Vətən müharibəsi iştirakçılarının bir çoxunu düşündürən fikirlərə sanki cavab idi". "Ölülər və dirilər" romanı isə onu bütün dünyada məşhurlaşdırmışdı. Eyni adlı kinofilm də çəkilmişdi.

K.Simonov Sosialist Əməyi Qəhrəmanı kimi yüksək ad daşıyırdı. Çoxlu fəxri adları vardı. Belə bir tanınmış şairin Musa Cəlilin şeirlərini rus dilinə tərcümə etməsi tatar şairini bütün ölkədə məhşurlaşdırdı və onu böhtanlardan xilas etdi. K.Simonov yazırdı: " Musa Cəlil mənim üçün işgəncələr və ölüm qarşısında yazıçı və vətəndaşlıq mərdliyinin bir simvolu olmuş və belə də olacaqdır. O yalnız böyük şair deyildi, həm də böyük mənəvi gücə və mərdliyə malik olan insan idi". K.Simonovun 1953-cü ildə Musa Cəlil haqqında mərkəzi qəzetlərdə məqaləsi də dərc olundu. Bu işdə ona Musa Cəlilin yazıçı dostu Qazi Kaşşaf da az kömək etmədi. Lakin axtarışlar davam edirdi. 1949-cu ildə Musa Cəlilin belçikali əsir yoldaşı SSRİ-nin Brüsseldəki konsulluğuna gələrək onun əsirlikdə olarkən antifaşist qüvvələrinin döyünən ürəyi və düşünən beyni olduğunu söyləmiş, onun şeirlərinin taleyi ilə maraqlanmağı xahiş etmişdir. Çünki bu əsərlər çox mətləblərin açılmasına kömək edərdi. Stalinin ölümündən sonra yüzlərcə əsirlər kimi Musa Cəlil də öz haqqına çatdı. 1956-cı ildə ölümündən sonra ona Sovet İttifaqı Qəhrəmanı adı verildi. 1957-ci ildə "Moabid dəftəri" şeiri Lenin mükafatına layiq görüldü. Şairin şərəfli adı özünə qaytarıldı, əsərləri də çap olundu. Bir neçə il sonra 1966-cı ildə onun doğma kəndində 60 illik yubileyi keçiriləndə buraya çox məşhur simalar toplaşmışdı. Musa Cəlil haqqında çoxlu xatirələr söyləndi. Onun həyat yolu bir daha vərəqləndi. Yeni səhifələr üzə çıxdı. Şairin adının əbədiləşdirilməsi dövrü başlandı. Kazan şəhərində onun heykəli ucaldıldı, tatar milli dram teatrına onun adı verildi, şairin adını daşıyan ədəbi mükafat təsis olunmuşdu. Musa Cəlil artıq türk yurdu olan Azərbaycanda da oxunur, sevilir, təbliğ olunurdu. 1954-cü ildə Səməd Vurğun Musa Cəlilin xatirəsinə həsr olunmuş "Musa Cəlilə" şeirini yazmışdır.

Bir haşiyə: Azərbaycan xalqının qəhrəman oğlu Mehdi Hüseynzadə ilə Musa Cəlilin həyatında bir uyğunluq, paralellik vardır. Musa Cəlilin də həyat yolu 1944-cü ildə qırılmışdır.

Musa Cəlil də, Mehdi Hüseynzadə 1941-ci ildə ordu sırasına çağırılmış, 1942-ci ildə hər ikisi əsir düşmüşdü. Mehdi Kalaç şəhəri ətrafında qanlı vuruşmaların birində ağır yaralanıb, ələ keçmişdi. 1943-cü ilin sonlarında Mehdi bir dəstə azərbaycanlı əsir ilə faşist əsarətindən qaçıb, Yuqaslaviya və İtaliya partizanlarına qoşulur. O, 9-cu faşist italyan-yuqaslav korpusu qərargahının xüsusi-təxribat-kəşfiyyat dəstəsini yaradır. Bu dəstənin ancaq bir əməliyyatı zamanı 80 faşist məhv edilmiş, 110 nəfər yaralanmışdı. Belə əməliyyatlar çox olmuşdur. Sonuncu dəfə, yəni 1944-cü il noyabrın 16-da faşistlərin böyük hərbi ləvazimat anbarını partladıb geri qayıdarkən yolda o, faşistlərlə qarşılaşmış, əlbəyaxa döyüşlərdə yenə də qalib çıxmış, lakin çoxlu qan itirdiyinə görə həlak olmuşdur. Mixaylonun ölüm xəbəri bütün Adriatik sahillərinə yayılmışdı. Onun dəfn olduğu Çerpovani kəndində başdaşı üzərinə aşağıdakı sözlər həkk olunmuşdur:

"Rahat yat, Azərbaycan xalqının qəhrəman oğlu, əzizimiz Mehdi. Azadlıq naminə göstərdiyin ölməz rəşadət dostlarının qəlbində əbədi yaşayacaqdır".

Göründüyü kimi, o da əsir düşsə də düşərgədən qaçıb Vermaxta qarşı mübarizə aparmış, çətin döyüş tapşırıqlarını və sabutaj əməliyyatlarını yerinə yetirmişdir. Necə deyərlər, son damla qanına qədər vuruşmuşdu.

Müharibədən sonra Musa Cəlil kimi Mehdi Hüseynzadə də əsir düşdüyü üçün "qara siyahıya" salınmış, bir müddət tamam unudulmuş, adının çəkilməsi yasaq edilmişdi, ailəsinə isə düşmən gözü ilə baxılmışdı.

Müharibədən sonra ölkədə hərbi əsirlərin işləri ilə məşğul olunanda faşistlərin təbliğatına uyub xarici regionlarda və Almaniya tərəfində üsyançı orduda vuruşanlarla yanaşı, sözün həqiqi mənasında qəhrəman taleli vətənə bağlı olan adamlara da rast gəlinmişdi. Azərbaycanlı çekistlər yuqaslav partizanları tərəfindən şücaətlə vuruşmuş baş leytenant Mehdi Hüseynzadə haqqında sensasiya doğuran məlumatlar əldə etmişlər. Onun bir çox cəsarətli əməliyyatlar həyata keçirməsini təsdiq edən sənədləri üzə çıxarmışdılar. Mixaylonun başına hitlerçilər 300 min marka qiymət kəsməsi də məlum olmuşdu.

İtaliyalı partizanlar Mehdi haqqında müxtəlif yerlərdə yazır, onun haqqının özünə qaytarılmasını arzu edirdilər. Azərbaycanlı əsrlərin qəhrəmanlığı haqqında İtaliyanın partiya, dövlət xadimləri də danışmağa başladılar.

1957-ci ilin yanvarında Dövlət Təhlükəsizliyi Komitəsi tərəfindən Respublika KP MK-ya M.Hüseynzadənin qəhrəmanlıqları haqqında müfəssəl arayış təqdim olunmuş, MK öz növbəsində sənədləri Moskvaya göndərmişdi. Araşdırmalar nəticəsində məlumatların düzgünlüyü öz təsdiqini tapmış və 1957-ci il aprelin 11-də SSRİ Ali Sovetinin Rəyasət Heyəti Hüseynzadə Mehdi Hənifə oğluna Sovet İttifaqı Qəhrəmanı adı vermişdi (ölümündən sonra). Xatırladaq ki, bu ad Musa Cəlilə də ölümündən sonra verilmişdi. Azərbaycan bunu böyük sevinclə qarşıladı. Sonralar İ.Qasımov və H.Seyidbəyli "Uzaq sahillərdə" romanını yazdı və eyni adlı kinofilm çəkildi. Minnətdarlıqla qeyd etmək lazımdır ki, M.Hüseynzadə haqqında faktların üzə çıxarılması və dəqiqləşdirilməsində ümummilli lider Heydər Əliyev və digər çekistlərin böyük zəhməti olmuşdur. Ulu öndər özü də sonralar çıxışlarının birində bu məsələyə aydınlıq gətirmişdi.

Həyatı, yaradıcılığı, fəaliyyəti bizə doğma olan, Mehdi Hüseynzadə ilə eyni tale yaşamış Musa Cəlili azərbaycanlılar da öz oğlu kimi sevirlər. Ona ən yüksək qiyməti də xalqımızın mütəfəkkir şairi Səməd Vurğun vermişdir: "Əsrlər boyu bir çox şairlər öz böyük yaradıcılığı, böyük və gözəl poeziyaları ilə adlarını əbədiləşdirmişlər. Lakin öz adlarını yalnız böyük poeziyası ilə deyil, həm də şəxsi qəhrəmanlığı, fədakarlığı, tarixin qara, bədxah qüvvələrinə qarşı döyüş meydanında ölümsüz ölümü ilə əbədiləşdirmək onların çox az qisminə nəsib olmuşdur. Böyük ingilis şairi Bayron, məşhur macar şairi Petefi, çex şairi Fuçik və bizim doğma tatar şairi Musa Cəlil belələrindən olmuşlar".

Səməd Vurğunun bu sözləri Anna Axmatovanın fikirləri ilə üst-üstə düşürdü. A.Axmatova yazırdı: " Musa Cəlil faşizmin zülmət qaranlıqları içində işıqlı bir sima kimi parladı və Yulus Fuçiklə bir sırada dayandı. Onlar əsl ziyalı və ədəbiyyatçı nümunəsi oldular. Onlar mənəvi gücün kobud fiziki güc üzərindəki təntənəsini nümayiş etdirdilər. Musa Cəlil xalqımızın hitlerizmə qarşı qəhrəmanlıq mübarizəsi tarixində ən görkəmli bir şəxsiyyət kimi mənim hafizəmdə daimi qalacaqdır".

S.Vurğun Musa Cəlilə xalqın sevgi-

sini ifadə edərək deyirdi:

"Biz dostmuz və böyük şairimizi sevirik, çünki o bizi sevirdi. Biz onu bütün varlığımız ilə sevirik, çünki o bizi ürəkdən və qəlbən sevirdi. Zaman keçəcək, nəsillər bir-birini əvəz edəcək, Musa Cəlilin surəti gələcək nəsillər üçün əfsanəvi surətə dönəcəkdir. Onun haqqında simfoniyalar yaranacaq, dramatik əsərlər, gözəl mahnılar, yüzlərlə gözəl şeirlər yazacaqlar!..."

Səməd Vurğun onun aşağıdakı şeirini nümunə gətirirdi:

Sevgilim, nə zaman desələr sənə
"O yollarda qaldı, büküldü dizi",
İnanma, əzizim! İnanma! Mənə
İnanan dostlarım deməz bu sözü,

Desələr Musanın nə zaman sənə
Düşmən gülləsilə yumuldu gözü.
İnanma, əzizim! Qəlbində mənə
Sevgisi olanlar deməz bu sözü.

Bu şeir məclisdə tatar dilində də səsləndirilirdi:

Сиңа миннән хәбәр китерсәләр,
"Ул егылган арып",— дисәләр,
Син ышанма, бәгърем!
Мондый сүзне
Дуслар әйтмәс, якын күрсәләр.

Сиңа миннән хәбәр китерсәләр,
"Муса инде үлгән",— дисәләр,
Син ышанма, бәгърем!
Мондый сүзне
Дуслар әйтмәс, сине сөйсәләр.

Bu şeirlərin təsiri ilə ilhama gələn böyük şair ürəkdən gələn gözəl sözlərini də deyirdi:

"Xoşbəxtəm ki, Musa Cəlilin bu gözəl, ülvi, mərdlik və gələcəyə ümidlə dolu poeziyasını orijinaldan oxuyuram. Bu gün sizə vəd etmək istəyirəm ki, yaşımın ötməsinə baxamayaraq, onun bu kitabını özüm Azərbaycan dilinə tərcümə edəcəyəm".

Bu sözlər 1954-cü ildə deyilmişdi, ömür isə vəfa etmədi, şairin ölümünə çox az qalmışdı.

Səməd Vurğun bu təntənəli axşamda rus dilində danışır, öz şeirini azərbaycanca, Musa Cəlilin şeirini isə tatarca oxuyurdu. Həmin vaxtlar Tatarıstanın bir çox qəzet və jurnalı Səməd Vurğunun şeirinin tatarca tərcüməsini təqdim etmişdi.

Səməd Vurğun Musa Cəlilin qəhrəmanlığını yüksək qiymətləndirir, ona bütün türk aləminin qüruru kimi baxırdı:

Mənim şair dostum, şair qardaşım,
Vüqarın böyükdür uca dağ kimi.
Sənin hünərinlə mənim də başım
Ucaldı göylərə bir bayraq kimi.

Səməd Vurğun Musa Cəlil haqqında şeirin son bəndini belə bitirirdi:

Neçə sərhəd aşır, el gəzir şeir,
Yurd salır neçə min ürəkdə, canda.
Sənə oğlum deyir, öz balam deyir
Mənim Ana yurdum Azərbaycan da.

Tatarıstanın ali və orta məktəblərində Musa Cəlilin yaradıcılığının tədrisinə və öyrənilməsinə geniş yer verilir. Musa Cəlilin adı hər bir tatar üçün əziz və müqəddəsdir. Moskva şəhərinin ən böyük məktəblərindən biri olan 1186 nömrəli məktəbə Musa Cəlilin adı verilmişdir. Bu məktəb 1997-ci ilin 1sentyabrından fəaliyyət göstərir. Burada məqsəd tatar balalarının öz ana dilini, tatar xalqının tarixini, adət-ənənələrini öyrətməkdir. Burada üç nəslin nümayəndəsi çalışır. Müəllimlərdən 5 nəfər RF və Tatarıstan MR-nın əməkdar müəllimidir. Müəllimlərin bir qisminin alimlik dərəcəsi var. Onların çoxu "İlin müəllimi"dir. Məktəbdə Musa Cəlilin həyatı ilə bağlı muzeylər var. Bunların biri də onun qızı Çulpanın adını daşıyır. Xatirə günlərində buraya gələnlər çox olur. Məktəbdə fəaliyyət göstərən "Cəlilovçular" adlı gənclər təşkilatı bütün regionda məşhurdur. 2008-ci ildə burada Musa Cəlilin heykəli qoyulmuşdu. Moskvanın bu məktəbi milli-mədəni dəyərlərinin təcrübə mübadiləsi üçün baza məktəb sayı-

lır, necə deyərlər, multikultural tədbirlərin mərkəzidir. Rusiya məktəbləri ilə geniş əlaqələri olan məktəb qabaqcıl təhsil ocaqları sırasındadır.

Böyük şairin bəraət aldığı ilk illərdə bəstəkar Nazib Jiqanov “Cəlil” adlı opera yaratmışdır. Saqit Aqiş “Həmyerlilər” (1964) povestini, M.Korolkov “Qırx ölümdən sonra” (1960) kitabını çap etdirmişdir. Onun haqqında Leonid Kvinixidzenin rejissorluğu ilə “Moabid dəftəri” (1968), Almaniyanın Defa studiyasında “Qırmızı çobanyastığı” (“Красная ромашка”) kinofilmi (1968) çəkilmişdir.

1968-ci ildə gənc müəlliflərin ən yaxşı əsərlərinə görə Musa Cəlil adına mükafat təsis olunmuşdur. 1991-ci ildə SSRİ dağılanda bu mükafat dayandırılsa da, Tatarıstan MR-nın Prezidentinin 14 fevral 1997-ci il fərmanı ilə həmin mükafat yenidən bərpa olunmuşdur.

Tatar xalqı öz oğlunu bu gün də əzizləyir və onunla bağlı ən kövrək xatirələri qoruyub saxlayır. Hər il onun ad günündə Moskvada, Moskva vilayətində və RF-nın ayrı-ayrı regionlarında müxtəlif turnirlər keçirilir, yarış qalibləri mükafatlandırılır.

2016-cı ildə Musa Cəlilin anadan olmasının 110 illiyi tamam olur. Tatar xalqı və Musa Cəlilin adını daşıyan onlarca müəssisələr şairin bu yubileyini təntənəli qeyd edir. Azərbaycan xalqı da bu təbriklərə qoşulur.

Musa Cəlilin adı bu gün də klassiklərin adı ilə yanaşı çəkilir. Ölməzlik timsalı olan bu şairin vətənpərvərlik ruhunda yazılmış şeirləri türk dünyasının inciləri sırasındadır. Məqaləni S.Vurğunun sözləri ilə bitirirəm: “Zaman keçəcək, nəsillər bir-birini əvəz edəcək, Musa Cəlilin surəti gələcək nəsillər üçün əfsanəvi surətə dönəcəkdir”.

***Rəyçi: prof. Elman Quliyev***

## İstifadə edilmiş ədəbiyyat

1. S.Vurğun. Seçilmiş əsərləri. nəşriyyatı. Bakı: Elm, 1972.
2. Муса Джалиль. Избранные. М; 1976.
3. Муса Джалиль. Костер над обрывом. М.: Правда, 1987.
4. Корольков Ю. Жизнь — песня. Жизнь и борьба поэта Мусы Джалиля. — М.: Госполитиздат, 1959.
5. Quliyev E. Türk xalqları ədəbiyyatı. Bakı, 2014.
6. Nəcəfov N. Böyük tatar şairi Musa Cəlil. “Azərbaycan müəllimi” qəzeti, 1990.
7. Файзи А. Воспоминания о Мусе Джалиле. Казань, 1966.

**Н.Наджафов**

**Вечное солнце тюркского мира**

**Резюме**

В статье повествуется о жизненном пути великого татарского поэта Муса Джалиля. Несмотря на то, что он попал в плен фашистам, он продолжил свою борьбу, написав свою “Моабитскую тетрадь”, оставив в истории непобедимый след. С.Вургун высоко оценил его творчество.

**N.Najafov**

**Inextinguishable sun of the turkish world**

**Summary**

In the article it is spoken about the great Tatar poet Musa Jalil and his way of life. Though he was captured by fascists, he continued to straggle and wrote “Moabid notebook. “He is always distinguished by his invincibility. The great Azerbaijan poet Samad Vurgun highly appreciated his literary activity.

*Tərbiyə məsələləri*



# MİLLİ-MƏNƏVİ DƏYƏRLƏRƏ YAZIÇI MÜNASİBƏTİ

**Yeganə Qasımova,**
***filologiya üzrə fəlsəfə doktoru***

***Açar sözlər:*** *milli-mənəvi dəyərlər, müsahibə, yazıçı, dialoq , təhlil, sual, xalq.*

***Ключевые слова:*** *национально-духовный ценности, интервью, писатель, диалог, анализировать, вопрос, люди.*

***Key words:*** *national and spiritual values, interview, writer, dialogue, analyze, question, people.*

Milli-mənəvi dəyərlər hər bir xalqın milli sərvətidir, onun yüksək əxlaqi xüsusiyyətlərinin təcəssümüdür. Milli-mənəvi dəyərlər xalqın mənəvi dünyasını zənginləşdirir, tariximizi və mədəniyyətimizi ucaldır. Ona görə də, bu dəyərləri qoruyub saxlamaq hər kəsin müqəddəs borcu sayılır.

Mənəvi dəyərlərimizin təbliği, onun gənc nəslə aşılanması bir vəzifə olaraq pedaqoji işçilərin üzərinə düşsə də mahiyyətinin açılması üçün söz sahiblərinin, yazıçıların da əsərlərindən qaynaqlanır. Daha aydın desək, bədii əsərlər milli-mənəvi dəyərlərin qayəsini, mayasını təşkil edir. Azərbaycan ədəbiyyatında milli-mənəvi dəyərləri özündə ehtiva edən çox qiymətli əsərlər vardır. Bu söz inciləri gənc nəslin tərbiyəsində misilsiz rol oynayır. Ədəbiyyatımızın tarixi göstərir ki, əxlaqi dəyərlərimizin toxunulmazlığı klassiklərimizin yaradıcılıq amalı olmuşdur. Milli-mənəvi dəyərlərə dair çoxlu nümunələr olan roman və dramlar içərisində Azərbaycan Xalq yazıçısı İlyas Əfəndiyevin məqalə və müsahibələri xüsusi yer tutur. Bu müsahibələrdə milli-mənəvi dəyərlərə geniş yer vermişdir. O bu müsahibələrdə müdrik ağsaqqal, nüfuzlu ziyalı kimi çıxış etmiş, xalqımızın mentalitetinin daşıyıcısı olmuşdur.

İlyas Əfəndiyev belə müsahibələri XX əsrin II yarısında nəşr olunan "Ədəbiyyat və incəsənət", "Bakı", "Kommunist", "Azərbaycan", "Ulduz", "Mədəniyyət", "Xəzər", "Şəhriyar" kimi mətbuat orqanları üçün vermişdir. Həmin müsahibələr həcm baxımından geniş olub, əsasən, mədəniyyət, qismən isə ictimai-siyasi məsələləri əhatə edir. Aydındır ki, İ.Əfəndiyevlə aparılan müsahibələr nəzərdə tutulmuş hər hansı mövzu ətrafında yazıçının fikirlərini öyrənmək, məlumat almaq, təhlil aparmaq və oxucu üçün qaranlıq qalan mətləblərə aydınlıq gətirməyə xidmət edir. Təhlilə cəlb olunan müsahibələrin səciyyəvi cəhəti, fikrimizcə, bundadır ki, əvvəla müsahibə alanların əksəriyyəti ədəbi aləmdə imzaları tanınan və ya problemlə bağlı müəyyən bilgiləri olan qələm sahibləridir, həm də İlyas Əfəndiyevə ünvanlanan suallar və mülahizələr dolğunluğu, aktuallığı ilə seçilir və müsahibin öz həyat həqiqətini, məsələyə orijinal yanaşma tərzini aşkarlamaq niyyətini güdür.

"Teatr və dramaturgiya məsələləri" (1981) adlı müsahibəni yazıçı ilə ədəbiyyatşünas alim Təhsin Mütəllimov aparmışdır. Müsahibə onun geniş bir şərhi ilə başlayır. Hər bir sual müasirliyi ilə diqqəti cəlb edir. Müsahibənin bir hissəsi ədəbiyyatda və səhnəmizdə milli-mənəvi dəyərləri özündə

əks etdirən tarixi mövzu məsələsi ilə bağlıdır. T.Mütəllimovun fikrincə, problem bundadır ki, tarixi faktlar, hadisələr, şəxsiyyətlər müasirliyə xidmət etməyəndə, daha çox illüstrativ xarakter daşıyanda, hətta fantaziya hesabına təhrif olunanda, “montaj ediləndə” onun zərəri xeyrindən çox olur. Yaradıcılığında tarixi mövzulara dönə-dönə müraciət edən yazıçı bu mövzuya aid konkret misallar göstərir: “Qarabağ xanı İbrahimxəlil xanın bütün arvad-uşağı ilə bərabər gecə qılıncla doğranması hadisəsi, Şekspir qələminə layiq olan bu faciələr və buna bənzər digər hadisələr bədii ədəbiyyatımızda yenə də öz həqiqi, yüksək ifadəsini gözləyir” (3).

“Həyatla daim təmasda” (1981) yazısında müsahibə dramaturqla sənətşünas Məryəm Həsənzadə arasında qurulur. Azərbaycan Yazıçılarının VII qurultayından sonra gündəmə gələn bu müsahibədən aydın olur ki, İ.Əfəndiyev yazıçı üçün mənəviyyat və əxlaq məsələlərinin ön planda olmasını vacib hesab edir. O təklif edirdi ki, “kənd” və yaxud “şəhər” mövzusunda yazılmasından asılı olmayaraq, bütün hallarda obraz, “insanların psixologiyasında yaranan yenilikləri, mənəvi konfliktləri bəzəyib-düzmədən bütün təbiiliyi ilə, bütün çətinlikləri ilə təsvir edən əsərlərin yaranmasına cəhd etmək lazımdır. Əlbəttə, bu birinci növbədə istedad, səviyyə, həyatla sıx bağlı məsələdir. Yazıçı böyük ideal naminə özünü səfərbər etməyi bacarmalıdır” (4).

Dialoq gedişində toxunulan məsələlərdən biri də xalqın mənəviyyatı sayılan ədəbi dil ilə bağlı olmuşdur. Milli tarix, milli dil, dinimiz, milli mədəniyyət və incəsənət, milli ədəbiyyat, milli özünüdərk, milli musiqimiz, xalqın yaddaşını ehtiva edən fikirlərimiz bizim milli-mənəvi dəyərlərimizdir. Bir sözlə, milli olan bütün nailiyyət və keyfiyyətlərimiz milli dəyərlər sisteminə daxildir. Bu baxımdan İ.Əfəndiyev ədəbi dilin leksik, morfoloji və sintaktik baxımdan zənginləşdirilməsi, söz sırası, bədii dilin xüsusiyyətlərinə dair maraqlı fikirlər irəli sürmüşdür. O, dialekt və şivələrin yeri gələndə ədəbi dildə yer almasına etiraz etmir, lakin bu şərtlə ki, ədəbi dili “məhəlləçiliklər, jarqonlar, süni ifadələr alağının basmasına yol verməməliyik. Biz eyni zamanda “arxaikdir”, “kənardan gəlmədir” deyə artıq xalqın dilinə, ədəbi dilə çoxdan daxil olmuş söz və ifadələrdən də imtina edə bilmərik” (4).

İ.Əfəndiyev yeni sözün dilə daxil olmasını bu halda qəbul edir ki, o, ümumxalq rəğbətini qazanmış olsun. “Ədəbiyyata gətirilən sözü yazıçı elə işlətməlidir ki, o, hamı üçün anlaşıqlı olsun. Xalqın ruhu ilə, canlı danışıq ilə mayalanmış əsərlər həmişə ümumxalq rəğbətini qazanır” (4).

Dilsuzun dramaturqla “Həqiqi sənət yollarında” (1984) müsahibəsində istedad, sənətkarlıq, müasir yazıçı mövqeyi, lirik-psixoloji dram nəzəriyyəsi, ənənə, rejissor işi, aktyor ifası və ədəbi tənqid məsələlərindən söz açılır.

İ.Əfəndiyevə görə “yazıçı, hər şeydən əvvəl, dünya ədəbiyyatının ən yaxşı nümunələrinə bələd olmalıdır, daha dəqiq desək, yazdıqlarından çox mütaliə etməlidir, böyük mədəniyyəti olmalıdır. Bütün bunlarla bərabər, yazıçı geniş ürək və ülvi insanlıq xüsusiyyətlərinə malik olmalıdır. Yazıçı, hər şeydən əvvəl, öz daxilindəki mənfi emosiyalara qalib gəlməyi bacarmalıdır. Bu keyfiyyətləri özündə birləşdirən yazıçı ədəbiyyata həmişə fayda verə bilər” (5).

O düşünürdü ki, xalqları bir-birindən fərqləndirən onların mənəvi dəyərləridir. Bu dəyərlər nəsildən-nəslə ötürülərək yaşadıqca bir xalqın kimliyi haqqında gələcək nəsillərə dolğun informasiya verir. Əsrlər keçsə də dəyərlər unudulmur.

“İnam yoluna çıraq tutulsun gərək” (1989) müsahibəsi repressiya və insan

ləyaqəti mövzusundadır. Müsahibəni dramaturqla Ağaqulu Niftəliyev aparmışdır. İ.Əfəndiyev bu müsahibədə çox ciddi məsələlərə toxunmuş, öz tərcümeyi-halının müəyyən məqamları haqqında məlumatlar vermişdir. Famil Mehdi "Azərbaycan bədii publisistikasının sənətkarlıq problemləri" əsərində yazırdı ki, "bədii publisistikada müəllifin obrazı – lirik "Mən", publisist ədəbiyyatın əsas xüsusiyyəti – sənədliliklə bağlıdır. Publisistika janrlarında yazılmış əsərlərdə bu obraz fəal rol oynayır. Lakin lirik oçerklərdə, eləcə də xatirə, bədii gündəlik və səyahətnamələrdə daha çox nəzərə çarpır. Çünki bu qisim əsərlərdə başqalarından fərqli olaraq əsas obraz yazıçı-publisistin özüdür" (1. s. 200).

Yazıçıya görə, xalqların milli-mənəvi varlığını tapdalayan stalinizmin qorxunc kabus kimi xalqların başı üstünü alaraq xalqın milli-mənəvi dəyərlərinə başqa yozum verdikdə, insanlarda "sədaqət, mərdlik, xeyirxahlıq, mübarizlik, təşəbbüskarlıq" kimi insani keyfiyyətlər əvəzinə, adamlara qorxaqlıq, yaltaqlıq, yalançılıq, kinlilik, paxıllıq, qisasçılıq kimi yaramaz sifətlər tərbiyə etmək o zamanın bəlası idi: "Bəşəri ləyaqətin məhv edildiyi bir şəraitdə adamlarda təqsir yox idi, onların gözlərinin qabağında neçə-neçə günahsız insan bir gecənin içərisində yox olurdu. Özü də kimlər? Xalqın ən istedadlı, ən bacarıqlı adamları – ziyalıları, alimləri, Cavidlər, Müşfiqlər, Əhməd Cavadlar, Şərifzadələr, Mümtazlar, ... neçə-neçə siyasət və mədəniyyət adamları. Kimisi güllələnir, kimisi isə ömürlük Sibirə, "gedər-gəlməzə" sürgün olunurdu" (7).

Yazıçı qeyd edirdi ki, bunların "günahı" vətəni sevməyənlər idi. Vətənpərvərlik xalqımızın qan yaddaşıdır. Zaman ötsə də, ictimai quruluş dəyişsə də - bu böyük bəşəri hislər millətimizin, xalqımızın həyatında həmişə başlıca meyar olmuş, bir xarakter kimi formalaşmış, nəsillərin fəaliyyətinin fövqündə dayanmışdır. Yazıçının fikrincə, zaman, tarix, Azərbaycan xalqının vətənpərvərlik ənənələri bütün nəsillərə dərs olmalıdır.

Müsahibədə İlyas Əfəndiyevin həyatından səhifələr də göz önündən gəlib keçir. Məlum olur ki, atası ticarətlə məşğul olduğundan onu "kulak oğlu" kimi təhsil aldığı Azərbaycan Dövlət Pedaqoji İnstitutunun ədəbiyyat fakültəsindən coğrafiya fakültəsinə köçürmüşlər.

Rejimin basqısına baxmayaraq, Azərbaycanın hər guşəsində eyni zamanda azsaylı xalqların yaşayış yerlərində özünəməxsus adət-ənənələri həyata keçirməsinə qoyulan qadağalar, təqiblər, cəzalar da xalqın öz soykökünə inamını sarsıda bilməmişdir. Xalqımızın düşüncə tərzi, vətənpərvərlik hissinin gücü onu öz mentalitetindən qopara bilmədi. Xalqımız özünəməxsus çox dəyərli, ünlü, zaman-zaman tarixin süzgəcindən və təlatümlü dövrlərindən keçmiş bəşəri ənənələri, adətləri qoruyub saxladı və beləliklə də, milli-mənəvi dəyərlərimizin, müqəddəs ənənələrimizin məqsədli olaraq, sıxışdırılıb, aradan çıxarılmasına yol verilmədi. Səməd Vurğun demişkən, "biz yenə yaşadıq torpaq üstündə". Əsrlər boyu xalqımız böyük mənlik şüuru, əxlaqi dəyərlərə sədaqəti sayəsində, bütün təsirlərə baxmayaraq, öz dilini, dinini, milli adət-ənənələrini qoruyub saxlaya bilmiş, onu xüsusilə sovetlər dövrünün ideoloji maraqlarından aşılanmağa imkan verməmişdir.

İ.Əfəndiyev ədəbiyyata, dramaturgiyaya bədnam "konfliktsizlik" nəzəriyyəsinin gəlişini də bununla izah edirdi: "həmin dövrdə "konfliktsizlik" nəzəriyyəsinin ədəbiyyata, xüsusən dramaturgiyaya yol tapması da həqiqəti demək qorxusundan irəli gəlirdi... Bu, bir də stalinizm haqqında ədəbiyyat və incəsənətdə əmələ gəlməyə başlayan sünilik idi. Bu "nəzəriyyə"ni uydu-

ranlar iddia edirlər ki, müasir həyatda ictimai-sosial münasibətlərdə təhlükə doğura bilən ziddiyyətlər artıq yoxdur. Guya hər şey yoluna düşüb, xalqın heç bir problemi mövcud deyil. Həyat gözəlləşib, insanlar ideal dərəcədə dəyişiblər. Bir sözlə, sovet həyat tərzində bədii əsərlərə mövzu ola biləcək konflikt yoxdur” (7).

Müsahibədə əksini tapan məsələlərdən biri də Azərbaycanın bütövlüyü məsələsidir. İlyas Əfəndiyev Azərbaycanın tarixi faciəsi ilə bağlı faktlar göstərir, sonra cənub mövzusunda yazdığı əsərləri xatırladır. “Şeyx Xiyabani” pyesində Türkmənçay müqaviləsinin xalqın bütövlüyünə qılınc çalan bir qərar olduğundan kəskin söhbət gedir: “İstər “Apardı sellər Saranı”, “Qarı dağı”, “Gənclər” əsərlərimdə, istərsə də “Unuda bilmirəm”, “Məhv olmuş gündəliklər”, “Natəvan”, “Büllur sarayda”, “Bizim qəribə taleyimiz” pyeslərimdə bu barədə bəzən dolayı yolla, bəzən də birbaşa sözümü deməyə çalışmışam. Əlbəttə ki, vaxtilə bu mövzunu dilə gətirmək mümkün deyildi” (7). Bu bədii əsərləri oxuyanlar bilir ki, yazıçı öz xalqının mənəvi yüksəkliyini bütün əsərlərdə ön plana çəkmişdir.

Vətəndaş-yazıçını narahat edən bir məsələ də xalqımızın soykökünün dəqiqliklə araşdırılmaması ilə bağlıdır. İlyas Əfəndiyev Azərbaycan folkloru toplanarkən Cənubi Azərbaycan folklorunun kənarda qalmasını, Azərbaycanın inqilablar, milli azadlıq hərəkatı tarixi tədqiq olunarkən o tayda baş verən hadisələrin nəzərə alınmamasını haqlı olaraq qınayırdı: “Cənubi Azərbaycanda Səttarxan hərəkatı, 1920-ci ildə Şeyx Məhəmməd Xiyabani qiyamı Azərbaycan xalqının azadlıq mübarizəsindən doğan inqilablar idi. Nə üçün tarixçilərimiz həmin inqilabların düzgün, dərin təhlil və təsvirini vermirlər? Xalqın tarixini zorla saxtalaşdırmaq ən böyük cinayətdir” (7).

Sözügedən müsahibəsində İ.Əfəndiyev Sovet rejimi dövrünün repressiyasından danışarkən insana, insanlığa olan biganəliyi xüsusi qeyd edirdi: “Əvvəlki repressiyada zülm, qəddarlıq əhvali-ruhiyyəsi insanlıq ləyaqətini alçaldırdısa, durğunluq dövründə bu bilavasitə biganəliklə, ətalətlə bağlı idi. İlk növbədə insana, insanlığa biganəliklə” (7).

Yazıçı bütün əsərlərində milli-mənəvi dəyərlərə çox həssaslıqla yanaşmış, insanlığı ədalətli olmağa, vətəni sevməyə, qanunlara, dinə hörmət etməyə, tolerant olmağa səsləmiş, milli dəyərlərin dövlətçiliyimizin möhkəmləndirilməsində xüsusi rolu olduğunu əsas meyar kimi qəbul etmişdir.

Müsahibənin ideya-məzmun istiqaməti həm də ictimai-siyasi məsələlərlə bağlıdır: “Sovetlər ölkəsində, hər bir respublikada “yalan şöhrət” ardınca qaçmaq nəticə etibarilə “adamlara, zəhmətkeşlərə diqqəti, qayğını, demək olar ki, unutdurmuşdu”. “Hər bir respublikada əlində hakimiyyət olan bürokrat “rəhbərin” sevimli əshabələri olurdu: raykomun birinci katibləri, nazirlər... Bunlar isə öz bacarığına, ləyaqətinə görə deyil, rəhbərə nə dərəcədə sərrast yaltaqlana biləcəyinə görə, necə bəli-bəli deməyinə görə, onun mənalı eyhamlarını dərhal (!) başa düşmək qabiliyyətinə görə seçilirdi. Buna görə də iqtisadiyyat, əxlaq pozulurdu”.

Müsahibədə kəndlinin kəndli kimi yaşamaq imkanının, mal-qara örüşünün əlindən alınması, qapısının ağzınacan pambıq kollarının əkilməsi, gündə 16 saat işləyib zəhmət haqqını ala bilməməsi, qadağan olunmuş gübrələrin tarlalara səpilməsi nəticəsində respublikada baş verən uşaq ölümləri, qadın sonsuzluğu, xəstə, anormal uşaqların doğulması və s. məsələlərə münasibətdə də İlyas Əfəndiyevin vətəndaş yanğısının şahidi oluruq. O, gözü qarşısında xalqın milli-mənəvi dəyərlərinin məhvinə uşaq kimi yanırdı.

“Hər bir əsərim ömrümün bir parçasıdır ” (1990) müsahibəsi ədibin özü haqqındadır. Əvvəlki müsahibələrində olduğu kimi, burada da İlyas Əfəndiyev istedad, yazıçı səmimiyyəti və sənətkarlıq məsələlərindən bəhs etmişdir.

Müsahibə alan Arif Əmrahoğlunun 70 illik sovet dönəmində yalan yazmamaq, cəsarətli olmaq asan olmamışdır fikrinə yazıçı Şeyx Xiyabani haqqında yazdığı tarixi dramı xatırladaraq cavab vermişdir: “Bəzi yoldaşlar içlərindəki xofdan, qorxudan yaxa qurtara bilməyənlər mənə dedilər: axı bizə həmişə deyiblər ki, Azərbaycan Rusiyaya könüllü birləşib, sizin əsərdə isə...nə olar, necə olar? Mən mövqeyimi bütün kəskinliyi ilə bildirdim... Həmin çinovniklərə, o tipli adamlara üzümü tutub deyirəm: biz kimi aldadırıq, fərz edək ki, xalqın sənədlərdən, arxiv materiallarından və s. xəbəri yoxdur, bəs, onu yalandan necə, hansı məntiqlə başa salasan və inandırasan ki, balam, torpağını özün iki yerə bölmüsən, qardaş-bacından özün ayrı düşmüsən, Arazı özün sərhədə çevirmisən? Yox, mən həqiqəti bir dəstə çinovnikin kreslo rahatlığına qurban verə bilmərəm. Mən cəsarətli olmaq, cəsarətli görünmək üçün yazıb-yaratmamışam, mən ancaq və ancaq sözə-qələmə xəyanət etməmişəm” (8). Müsahibənin gedişində yazıçı öz sənət kredosuna sadiq qalaraq qeyri-təbiiliyi xoşlamadığını vurğulayırdı: “Sənətdə qeyri-təbiilik, fikrimcə, ata-ananın suçu ucbatından ömrünü şikəst başa vuran övlada bənzəyir. İstəmirəm, istəmirəm ki, əsərlərimin qəhrəmanları doğma övladlarım kimi adımı daşıdıqlarına görə utansınlar”.

Qeyd edək ki, müsahibələrinin sonunda İlyas Əfəndiyev, adətən, özü ilə bağlı müəyyən informasiyalar verirdi. Bunlar, əsasən, onun yaradıcılıq laboratoriyasının xüsusiyyətləri, əsərlərinin yaranma səbəbləri, xaricdə çap olunan kitabları və ədəbi prosesdə yeri ilə bağlı olmuşdur.

İ.Əfəndiyevin maraqlı müsahibələrindən biri də “Sözü zaman deyəcək” (1991) yazısıdır. Müsahibədə mənəviyyat və mədəniyyətimizlə bağlı bir sıra məsələlər, o cümlədən ideologiyanın sənətə təsiri söhbət mövzusu olub. Yazıçıya görə, “ədəbiyyata, sənətə siyasətin, “yuxarıların” təsiri həmişə hiss olunur. Bu təsirdən kim yayınıbsa, əsl sənət əsəri yaradıb. Lakin yaradıcılığını siyasətə tabe etdirənlər, təbii ki, sənətin yox, ideologiyanın iradəsini yerinə yetiriblər” (9). İntervüdə əlifba məsələsindən, latın qrafikasına keçməyin zərurətindən danışılır, keçid dövründə publisistikanın aparıcı janr kimi fəallığı qeyd olunur, milli özünüdərk, demokratik meyillərin inkişafı və azad söz demək imkanının yaranması şəraitində publisistikanın kütlələrə təsir gücünün artdığı vurğulanırdı.

Müsahibənin gedişində tənqidçi və ədəbiyyatşünas Vaqif Yusiflinin “bir-birini çox sürətlə əvəz edən bu dramatik faciəli hadisələrə ( 90-cı illərin ictimai-siyasi mühiti nəzərdə tutulur -Y.Q) bədii ədəbiyyat dərhal, hadisələrin qızğın anında cavab verə bilməz. Ona görə də, bədii ədəbiyyatın deməli olduğu sözü publisistika deyir” fikrinə İlyas Əfəndiyev bu şəkildə münasibət bildirirdi: “...O ki, qaldı publisistikaya, onu qətiyyən bədii ədəbiyyata qarşı qoymaq olmaz. O da bədii ədəbiyyatın bir sahəsidir və bugünkü publisistikanın inkişafı göz qabağındadırsa, deməli, ədəbiyyatın bir sahəsi yenidən çiçəkləyir”. Ədəbiyyatımızın keçid mərhələsini yaşadığı barədə həmsöhbətinin qənaəti ilə də razılaşmayan ədib cəmiyyətdə baş verənlərin hələ fikirlərdə, şüurlarda yazıldığını qeyd edirdi.

“Dünyadan talecə incimiş adamların yazıçısı” (1992) adlanan müsahibədə bəyəndiyi yazıçılardan, o cümlədən Çexov, Tolstoy, Flober və Heminqueyin əsərlərindən danışır və burada da tolerantlığı büruzə verirdi.

“Çətinliklərə dözməyə məcburuq” (1992) Kamilə Nemətin ədiblə apardığı müsahibədir. Burada İlyas Əfəndiyevin “Ağıllılar və dəlilər” komediyasının səhnə həllindən, yeni əsərlərindən, Türkiyədə oynanılan tamaşalarından, ötən əsrin sonlarında sovet siyasi rejiminin dağılması fonunda yaranan bir çox problemlərdən, o cümlədən yaşayış çətinliklərindən, xaricə ziyalı axını və hökumətin kadr siyasətindən bəhs olunur.

Bir müsahibəsində sənətkar İngiltərə, Amerika və Fransa kimi qabaqcıl dünya dövlətlərinin tarixi təcrübəsini və demokratik ənənələrini misal göstərirdi. Bu günümüz üçün də olduqca aktual və müasir olan məsələlərə münasibətdə yazıçının zəngin həyat təcrübəsi, geniş erudisiyası və aydın mövqeyi diqqəti cəlb edir.

“Bütün əsərlərimi qəlbimə yaxın bilirəm” (1994) adlı müsahibənin lap əvvəlində yazıçıya “Geriyə baxma, qoca” romanının müəllifi kimi, geriyə baxarkən, yaşadığınız ömür sizə necə görünür” sualı ilə müraciət olunmuşdur. Qocaman ədib həmsöhbətinə hər zamankı yazıçı səmimiyyəti ilə cavab vermişdir: ” Geriyə baxanda, keçirdiyim fərəhli uşaqlıq günlərindən sonra başlayan repressiya, sovet imperiyasının doğurduğu ruhi əzablar, təklikdə çəkdiyim iztirablar, ürəkdəki nəcib arzuları azad surətdə ifadə etmək həsrəti ilə dolu bir ömür görünür... Öz yaradıcılığım barədə onu fikirləşirəm ki, əlbəttə, əgər, sovet imperiyasının dəhşətli məngənələri olmasa idi, mən vaxtında daha çox söz deyə bilərdim. Daha çox iztirabların acı həqiqətlərini ifadə etməyə çalışardım” (12). Sənətkar hər bir əsərinin ürəyində öz yeri olduğunu qeyd edir, daha sonra Qarabağ xanlığının tarixini əks etdirən “Hökmdar və qızı” faciəsinin səhnə həlli və Qaçaq Süleyman haqqında yeni yazdığı əsər haqqında danışırdı.

“Sənətkar və zaman” (1995) İlyas Əfəndiyevin dövri mətbuatda çıxan və 2002-ci ildə çap olunan Seçilmiş əsərlərinin VII cildinə daxil edilən sonuncu müsahibəsidir. Müsahibə aparan Nazilə Əsədlinin Qarabağın namərd düşmən əlində olması, taleyimizə köçkünlük və didərginlik yazılması barədə dediklərinə müharibənin hər üzünü görmüş bir nəslin nümayəndəsi olan yazıçı özünəxas müdrikliklə cavab verir: ”Bu müharibədə xəyanətlər olmasaydı, biz bir ovuc erməni cəlladları qarşısında sınmazdıq. Əslində bu, sovet imperiyasından doğan şovinist siyasətin faciəsidir...” (13). Göründüyü kimi, ədib Azərbaycan xalqının başına gətirilən faciələrin köklərini, əsl səbəblərini aşkarlamağa çalışır və yol verilən səhvlərdən ibrət almağa çağırırdı.

Buna baxmayaraq, İlyas Əfəndiyev Azərbaycanın gələcəyinə böyük ümidlər bəslədiyini, millətin vətənpərvərlik duyğusunun yenidən təlatümə gəldiyini, milli-mənəvi dəyərlər üçün geniş üfüqlər açıldığını, müstəqil respublikamızın hər sahədə irəliləyişlərə imza atdığını söyləyirdi. Müsahibədə, həmçinin Cənubi Azərbaycan mövzusu, Cənub və Şimal ədəbiyyatlarının tarixi əlaqəsi, Şəhriyarın yaradıcılığı, İslam dini və mədəniyyətimiz haqqında söhbət açılırdı.

Müsahibənin sonunda yaradıcılığı boyu məhəbbətdən yazan İlyas Əfəndiyevin bütün sevgilərdən daha üstün olan Yaradana, Allaha olan məhəbbəti və İslam dininin insansevər mahiyyəti barədə fikirləri ilə də tanış oluruq. Ümummilli lider Heydər Əliyev dinimizin milli-mənəvi dəyərlərinin ən önəmli ünsürlərindən biri olduğunu önə çəkirdi və bilirdi ki, xalqlara və qəbilələrə ayrılmış cəmiyyət həm də milli-mənəvi dəyərləri ilə seçilməlidir. “Dinimiz xalqımızın milli-mənəvi sərvətidir” sözləri onun dinə baxışını çox gözəl bir şəkildə xülasə edir. O, dinimizin ilahi əxlaqi dəyərlər sistemi olaraq mənimsənilməsini, xüsusilə gənclərin formalaşmasında müsbət bir funk-

siya icra edəcəyini düşünürdü. O, hər sətirdə mənəvi yüksəkliyin insan üçün qürur mənbəyi olduğunu, dini etiqadımızın mənəvi tutumunu dönə-dönə qeyd edirdi. Yazıçının dediklərindən aydın olur ki, onun ata-anası da, özü də Allaha inanan, itaət edən olublar: "Mən bu fikirdəyəm ki, İslam dini çox işıqlı mahiyyətə malik, proqressiv bir dindir. Əslində İslam böyük bir mənəvi sərvət, elm mənbəyidir... İslamda əsl ziyalılığa məxsus bir əhvali-ruhiyyə, daxili gözəllik var... Qurani-Kərimdə, əslində, misilsiz fəlsəfi fikirlər var" (13).

İlyas Əfəndiyevin müxtəlif illərə aid müsahibələri hər hansı mövzu ətrafında sadəcə fikir mübadiləsi – dialoq olmaqdan savayı, yazıçının obyektiv fikirləri, maraqlı, analitik təhlilləri, şəxsi nöqteyi-nəzəri və mövqeyinin ifadəsi baxımından diqqəti cəlb edir.

Müəllif, göründüyü kimi, nəsr və dramaturgiyasında yazıçılıq təxəyyülünün köməyi ilə obrazlı şəkildə çatdırdığı milli-mənəvi dəyərlərə dair fikir və ideyalarını bədii publisistikasında gerçək həyati materiala, faktlara istinad edərək, sözünü dolayısı ilə deyil, dəqiq, birbaşa və ünvanlı söyləmişdir.

***Rəyçi: prof. H.Ənvəroğlu***

## İstifadə edilmiş ədəbiyyat


1. Mehdi F. Bədii publisistika. Bakı, 1982.
2. Həsənov A. Milli-mənəvi dəyərlərimiz. Bakı, 2010.
3. Əfəndiyev İ. Teatr və dramaturgiya məsələləri. "Ədəbiyyat və incəsənət" qəzeti, 3 yanvar 1986.
4. Əfəndiyev İ. Həyatla daim təmasda. "Kommunist" qəzeti, 27 dekabr 1981.
5. Əfəndiyev İ. Həqiqi sənət yollarında. "Azərbaycan" jurnalı, 1984, №5.
6. Əfəndiyev İ. Teatr qayğıları. "Ədəbiyyat və incəsənət" qəzeti, 24 may 1985.
7. Əfəndiyev İ. İnam yoluna çıraq tutulsun gərək. "Kommunist" qəzeti, 15 yanvar 1989.
8. Əfəndiyev İ. Hər bir əsərim ömrümün bir parçasıdır. "Ulduz" jurnalı, 1990, №9.
9. Əfəndiyev İ. Sözü zaman deyəcək. "Mədəniyyət" qəzeti, 20 fevral 1991.
10. Əfəndiyev İ. Dünyadan talecə incimiş adamların yazıçısı. "Xəzər" jurnalı, 1992, №1-2.
11. Əfəndiyev İ. Çətinliklərə dözməyə məcburuq. "Ədəbiyyat qəzeti", 6 noyabr 1992.
12. Əfəndiyev İ. Bütün əsərlərimi qəlbimə yaxın bilirəm. "Ədəbiyyat qəzeti", 27 may 1994.
13. Əfəndiyev İ. Sənətkar və zaman. "Şəhriyar" qəzeti, 24 mart 1995.


**Е.Гасымова**

**Писательское отношение к национально-духовным ценностям**

**Резюме**

В статье «Отношение к национально-духовным ценностям» анализируются интервю данные автором в разные годы прессе, такие как «В ногу со временем», »Писателъ и время» и др.

**Y.Gasimova**

**Writer's attitude to the national-moral virtues**

**Summary**

In the article the writer's attitude to the interviews published in different years is analyzed. In these interviews the unknown moments of the history by I. Afandiyev, language, alphabet and moral issues, the grief of motherland which was divided into two parts and Islamic virtues are analyzed.

# TƏDRİSDƏ ŞAGİRD ŞƏXSİYYƏTİNİN FORMALAŞMASI YOLLARI

**Mehparə Süleymanlı,**
***Binəqədi rayonu, 314 nömrəli tam orta məktəbin müəllimi***

***Açar sözlər:*** *şəxsiyyət, riyazi məntiq, mühakimə, təfəkkür, dəqiqlik.*
***Ключевые слова:*** *личность, математическая логика, суждение, мышление, пунктуальность.*
***Key words:*** *personality, mathematical logic, judgment, thinking, punctuality.*

Müasir dövrdə cəmiyyətin inkişafı sahələri şəxsiyyətyönümlü təhsilin tələblərinə uyğun olaraq, ölkənin iqtisadi, siyasi və mədəni sahələrinin irəli aparılmasında, düşüncə tərzinin formalaşmasında əsas rol oynayır. Təhsilalanların düşüncə tərzinin və təfəkkürünün formalaşması bu gün təhsilimizdə ayrı-ayrı fənlərin tədrisində ən mühüm və vacib məqsədlərdən biridir.

Şagird şəxsiyyətinin formalaşmasında riyaziyyat fənninin xüsusi rolu vardır. O, tədrisdə zehni inkişafın əvəzedilməz bir vasitəsi hesab olunur. Şagirdlərin riyazi hazırlığının gücləndirilməsi ilə təfəkkürünün inkişaf etdirilməsi də riyaziyyat fənn kurikulumunun əsas vəzifələrindən biri sayılır və onun pedaqoji prinsipləri öz əksini fənnin məzmununda tapır. O da həqiqətdir ki, müasir insanda təfəkkürün tam inkişafı, mühakimələrin gedişi və təfəkkür nümunələri ilə tanışlıq məntiqi mədəniyyəti formalaşdırmadan mümkün deyildir. Məntiqi təfəkkürün formalaşmasında, mühakimə və dərketmə qabiliyyətlərinin yüksəlməsində riyaziyyatın müstəsna rolunu nəzərə almaq məntiqi təfəkkürün hərtərəfli elementi kimi onun ən çox istifadə olunan metodlardan biri olduğu təsdiq olunur. Riyazi məntiq çalışmaları şagirdlərin məntiqi cəhətdən mühakimə yürütmək, məsələlərdən qabaqcadan anlaşıqlı olmağı və intuisiyasını qavrama qabiliyyətini inkişaf etdirir. Bir fəaliyyət kimi əqli mühakimə üsulları şagirdlərdə nitqin inkişafına kömək edir, onlarda ümumiləşdirmə və konkretləşdirmə kimi yaradıcı təfəkkürü formalaşdırır. Riyazi məntiq eyni zamanda analiz və sintez, sistemləşdirmə qabiliyyətlərini təkmilləşdirir [2,3].

Tədrisdə məhz riyazi təfəkkürün empirik nəzəriyyəsinin praktiki tətbiqi, bu gün riyazi məntiqə əsaslanır. Bəzi pedaqoqlar, psixoloqlar və metodistlər təfəkkürün empirik nəzəriyyəsi probleminin şagirdlərin əqli fəaliyyətinin inkişafı problemi ilə əlaqədar olduğunu göstərir və bəzi məhdudiyyətləri də qeyd edirlər. Məsələn, rus pedaqoqu Taraşenko bu nəzəriyyəni uşaqların məntiqinin düzgün formalaşmasından ehtiyat edərək onu kənarlaşdırmağa çalışmışdır. Lakin rus pedaqoqu və psixoloqu K.D.Uşinski Hegelə əsaslanaraq “düşüncə” və “dərki” fərqləndirərək qeyd etmişdir ki, dərrakəsiz ağıl fəlakətdir, dərrakə özünün şəxsi düşüncə proseslərini dərk etmənin nəticəsidir [2,3].

Əqli fəaliyyətin məhz riyaziyyat dərslərində formalaşmasını əsaslandıran

pedaqoq alimlər, təfəkkürün empirik nəzəriyyəsinə onun ümumi xüsusiyyətləri baxımından tənqidi yanaşmışlar. Təfəkkürün riyazi məntiqin inkişafı ilə əlaqəsi təlimdə daha çox ümumiləşdirmə və şagirdlərdə riyazi anlayışların formalaşdırılması kimi maraqlıdır. Riyaziyyatın tədrisində ümumiləşdirmə də şagirdlərin idrak fəaliyyətidir. Psixologiyada bu fəaliyyətin üç əsas komponenti:

1) ümumi məntiq təfəkkür priyomları;

2) əqli fəaliyyətin xüsusi priyomları;

3) biliklər sistemi, ümumiləşdirmənin empirik nəzəriyyəsi mövqeyində durması öyrənilir.

Görkəmli psixoloqlar L.S.Vıqotski, S.L.Rubinşteyn, J.Piajenin əsərlərində şagirdlərdə riyazi anlayışların formalaşdırılması və ümumiləşdirmə ilə əlaqədar dəyərli fikirlər vardır. L.S.Vıqotskinin xüsusi bir üsulu kimi ümumiləşdirmənin quruluşunu, funksiyalarını və formalaşdırılmasının yollarından ibarətdir. O, ümumiləşdirmənin keyfiyyətcə özünəməxsus və bununla yanaşı genetik əlaqəli üç əsas pilləsini (sinkretlər, komplekslər və anlayışlar) ayırmışdır. Yəni riyazi məntiq üsulu ilə təfəkkürün və nitqin genetik təhlilini vermiş, sözün mənasını və onun yüksək formasının yaranması xüsusiyyətlərini öyrənmişdir. L.S.Vıqotskinin ümumiləşdirmə və anlayışların əmələ gəlməsini məhz müasir psixologiya, habelə riyaziyyatın və informatikanın tədrisi metodikası ilə əlaqələndirmişdir [2]:

1) bu hər şeydən əvvəl həll olunacaq problemin tədqiqat metodu kimi səbəb əlaqəsi-genetik təhlilin ideyasıdır;

2) ümumi və xüsusinin əlaqəsinin müxtəlif növləri ilə əlaqəli olduğu üçün "şeylərin ümumiləşdirilməsi" və "fikirlərin ümumiləşdirilməsi" məhsuludur;

3) psixoloji baxımdan nəzəri anlayışların daxilində fikirlər, reflekslər, baş vermənin şərti və anlayışın özünün təbiətinin daxil edilməsi.

Psixoloqların və elmşünasların fikrincə XX əsrin sonundan başlayaraq XXI əsrdə pedaqogika və psixologiya da riyaziyönümə gedəcəkdir. Başqa sözlə desək, riyaziyyat sözün əsl mənasında bütünlüklə və tamamilə onun ətinə və iliyinə hopacaqdır. Bu psixologiya elminin inkişafında yeni keyfiyyət dəyişikliyi ilə əlaqədar olacaqdır. Elmin ənənəvi "qeyri-riyazi" sahələrinə riyaziyyatın nüfuz etməsi elmi biliklərin inkişafının qanunauyğun hadisələrindən biridir.

Unutmaq lazım deyildir ki, təhsil sisteminin mərkəzində insan münasibətləri dayanır. Burada psixoloji məsələlər mütləq əsas yerlərdən birində dayanmalıdır. Xüsusən də şəxsiyyət amili həmişə diqqət mərkəzində olmalıdır. Pedaqoqlar haqlı deyirlər ki, pedaqoji prosesi uşaq şəxsiyyətinin anadangəlmə intellektual xüsusiyyətlərinin müxtəlifliyini nəzərə alaraq qurmaq lazımdır. Yalnız bu prinsiplər əsasında qurulmuş prosesləri homogen qruplarda şəxsiyyətyönümlü təlim adlandırmaq olar.

Məntiqi riyaziyyat şəxsiyyətin tərbiyəsində bəzən, "əqli qaydaya salmaqda" mühüm vasitə sayılır və riyaziyyatın məktəbdə müasir tələblər səviyyəsində tədrisini təşkil edir. Burada əsas məqsəd şagirdlərə fikirləşməyi öyrətmək olduğunu daima diqqət mərkəzində saxlamaqdır. Hadisələrin məntiqi təhlilini düzgün aparmaq üçün öyrənənlər məkan faktlardan nəticə çıxarmağı bacarmalıdır, məlumu məchuldan fərqləndirərək, isbat edildəni isbat edilməyəndən ayırır, təhlil etməyi, təsnifat aparmağı, fərziyyələr irəli sürməyi, onları inkar və təsdiq etməyi, analogiyadan düzgün istifadəni insanlar məhz riyaziyyatı prosesində müəyyən səviyyədə mənimsəyə bilirlər. Şagirdlərdə intuisiyanın formalaşması məhz məntiqə gedən yoldur. Riyazi məsələlərin həlli prosesində yığcamlıq, dəqiqlik, tamlıq,

aşkarlıq kimi vərdişlər qazanaraq, məhz səmərəli təfəkkürün və fikrin ifadə üsullarının inkişafına səbəb olur, nəticəni əvvəlcədən görməyə və məsələnin həll yolunun dərkinə kömək edir. Bu proses də riyaziyyatın tədrisində idrak proseslərini inkişaf etdirir, həm də insanı elmi yaradıcılığının formalaşdırılmasına aparan yoldur. Məntiqi riyaziyyat şagirdlərin bir şəxsiyyət kimi formalaşmasına da təsir edən xarakterin, mənəvi keyfiyyətlərin formalaşmasında mühüm yer tutur. Şagird düşünməlidir ki, riyazi məsələnin həllinə qoşularaq onu başa çatdırmaq üçün kifayət qədər uzun yollar keçməlidir. Hətta səhvlərin gizlədilməsinin qeyri–mümkünlüyünü anlayır, nəticənin düzgünlüyünü obyektiv şəkildə yerinə yetirir. Bu hallar da şagirdlərdə riyaziyyatın tədrisində doğruluq, obyektivlik, inadkarlıq, çalışqanlıq kimi keyfiyyətlərin formalaşmasına təsir edir və emosional hislərin güclənməsinə kömək edir [1,6].

Riyaziyyatın tədrisində didaktikanın elmilik prinsipi mühüm yer tutsa da, onun məqsədəuyğun reallaşdırılmasının müvafiq vasitəsi, demək olar ki, yenə də yoxdur. Burada, əsasən, şagirdlərdə empirik təfəkkürün inkişafı nəzərdə tutulur ki, şagirdlərin ümumi intellektual bacarıqların: analiz, sintez, ümumiləşdirmə, xüsusiləşdirmə və s. formalaşdırılması zəruriyyət kəsb edir və daha çox dərk edilməyə başlanmışdır. Riyaziyyatın tədrisi metodikası idrak prosesinin qanunauyğunluqlarını öyrənən məntiq elminin nəticələrindən də istifadə etmək tələbinin vacibliyini önə çəkir. Bu tələb riyaziyyatın tədrisi proqramına praktiki baxımdan daha əhəmiyyətli olan bölmələrin daxil edilməsinə, həm də təlimin praktik istiqamətinin gücləndirilməsinə xidmət etməlidir. Lakin təlim materialının məzmununun nəzəri aspektinin azaldılması hesabına praktik məzmunun gücləndirilməsi ciddi səhvlərə gətirə bilər. Belə ki, şagirdlərin məntiqi təfəkkürünün və məntiqi savadının zəifləməsinə yol vermək olmaz. Bunun üçün praktik məzmunlu təlim materialı elə seçilməlidir ki, keçirilən material didaktik tələblərə cavab versin və şagirdlərin məntiqi savadının yüksəlməsinə mane olmasın. Riyazi məntiq şagirdlərin təfəkkürünü, yaddaşını, diqqətini, təxəyyülünü, müşahidəçiliyini, iradəsini, müstəqilliyini inkişaf etdirir. İlkin mərhələ kimi riyazi məntiqi təfəkkürün inkişafı uşaqlarda sadə riyazi təsəvvürlərin formalaşdırılması başlanğıc pillə kimi əsas yer tutur. İnkişafetdirici tapşırıqlar məntiqi təfəkkürün inkişafına müsbət təsir edir. Burada şagirdlər zaman-məkan, ölçü-forma, miqdar, rəqəmlər və hesablama kimi biliklərə sahiblənirlər. Riyazi məntiqi çalışmalar riyaziyyatın şüurluluq və fəallıq, sistemlilik və ardıcıllıq prinsiplərini özündə əks etdirir. Bu məqsədlə sadə məntiqi çalışmalardan ilkin mərhələ kimi istifadə etmək lazımdır. Belə çalışmalar şagirdlərin dünyanın müasir mənzərəsi ilə tanış olması, dünyanın dərk edilməsi kimi dünyagörüşünün formalaşmasına da ciddi təkan verir. Riyaziyyatın tədrisində məntiqin inkişaf etdirilməsi üçün çalışmalar uşaqların yaş səviyyələrinə uyğun seçilməli, onların təlimdə lazımi bacarıqlara yiyələnmələrinə böyük imkanlar yaratmalıdır. Bu texnoloji vasitələrin əsasını məntiq, intellektual oyunlar və fənlərarası əlaqə təşkil edir. Müasir əyani vəsaitlər əsasında qurulan dərslər öz rəngarəngliyi ilə seçilir. Riyazi məntiqi oyunlar, çalışmalar inteqrativliyi təmin edir, real həyatla əlaqəni gücləndirir və şagird təxəyyülünün inkişafını sürətləndirir [7,8].

Riyazi məntiq eyni zamanda şagirdlərin tərbiyəsinə və davranışına da güclü təsir edir. Belə ki, ümumtəhsil məktəblərinin orta təhsil pilləsində çalışmaların tətbiqi eyni dərəcədə olan şagirdlərin davranışı fərqli olur, onların intellektual səviyyələri digər fənlərin də asanlıqla mənimsənilməsinə kömək edir və nitq mədəniyyətinin

də formalaşmasına təkan verir. Artıq ənənəvi çalışmaların yalnız yaddaş xarakterli olması onların real həyatda bəsit riyazi düşüncələrə malik olmasına xidmət edirdisə, məntiqi riyazi çalışmalar isə əksinə onların həyatda ümumləşdirmə, modelləşdirmə, statistik, hesablama, problemi asan yolla həlletmə, qənaətcil olmaq, israfçılığa yol verməmək, uzaqgörənlik və s. kimi faydalı bacarıqlar formalaşdırır.

Dərs prosesinin effektli olması üçün əyləncəli üsullardan istifadə etmək, problemləri qrup halında araşdırmaq, müstəqil fikir söyləmək, dərin düşünmək və azad fikirləşmək imkanı əldə etməlidirlər. Şagirdin dərsə marağını artırmaq üçün nəinki düzgün, habelə maraqlı dərslər təşkil etmək lazımdır. Həmçinin sinifdaxili, siniflər arasında viktarinalar təşkil olunsa, şagirdlər arasında rəqabət, əməkdaşlıq, yaradıcılıq güclənər.

Məlumdur ki, bazanın riyazi hazırlığı olmadan şagirdləri müxtəlif ixtisas sahibi kimi formalaşdırmaq çətin, bəzən də mümkün olmur. Bunun üçün əlavə hər bir insan gündəlik həyatda, əmək fəaliyyətində riyaziyyatla qarşılaşır və əldə etdiyi riyazi bilik və bacarıqlarının olmasından faydalanır. Yeni təlim metodlarından istifadə etməklə riyaziyyatın mahiyyətini başa düşmək, əsas da şagirdlərdə ümumiləşdirici təfəkkürü inkişaf etdirilməsinə xüsusi əhəmiyyət verir. Şagidlərdə inam yaratmaqla onları başa salmaq olur ki, riyaziyyat digər elmlərin inkişafında mühüm yer tutur. Şagird passiv mövqe tutmaqdan çəkinir, aktivləşir, fəallaşır və bacarıqlı, yaradıcı şagirdə çevrilir.

Riyaziyyatı mənimsətmək üçün ünsiyyət fəaliyyətinə ciddi fikir verilməlidir. Bu riyaziyyat fənninin əhəmiyyətinin dərk edilməsi üçün çox vacibdir. Riyaziyyat ümumi təhsil məktəblərində tədris olunan ən mühüm və vacib fənlərdən biridir. Riyaziyyat zehni inkişafın əvəzedilməz vasitəsidir, müasir ixtisas sahələrin çoxu ilə birbaşa bağlıdır.

Yadda saxlanmalıdır ki, pedaqoji ünsiyyət insanlar arasındakı münasibətlərə söykənir və onun əsasında inkişaf edir. Müasir təhsil konsepsiyasında şagirdin məktəb həyatındakı rolu pedaqoji ünsiyyətin bənzərsiz xüsusiyyətləri ilə mənalandırılır. Riyazi məsələlərin həllində də bunlar gözlənilməlidir.

Yeni ideyalar, yeni metodlar və fəal, yaradıcı mütəxəssislər sayəsində rahat yazılan markerlər, elektron lövhələr müəllimlərin və şagirdlərin işini asanlaşdırdı. Riyaziyyat dərslərinin tədrisində müasir dövrə uyğun olaraq, riyaziyyatın informasiyalaşdırılması prosesi, ən yeni kompüter texnologiyalarının tətbiqində və internetdə öz əksini tapdı. Dərs əsasında müəllim riyaziyyat fənninin mühümlüyünü və həyati əhəmiyyətindən müasir elmin nailiyyətlərindən söhbət açmaqla bərabər məlum materialları yeni nöqteyi-nəzərdən təqdim etməli, riyazi nəzəriyyələrin məntiqini və gözəlliyini göstərməlidir. Elmi müddəalar əsaslandırılmalı, nümayiş etdirilməlidir. İstənilən mövzunu fəal dərs metodlarından, yeni riyaziyyat kurikulumlarından istifadə etməklə tədris etmək olar. Hər şey müəllimlərin savadından, onun yaradıcı yanaşmasından və peşəsinə məhəbbətindən asılıdır.

Riyaziyyat fənni öz daxilində idraka əsaslanan elmdir. Onun özülü qədimdən yaradıcılıq üzərində qurulub. Bu gün Azərbaycan təhsilində aparılan islahatlarda müəllim şagird yaradıcılığına böyük önəm verilir. Müəllim öz dərsinə yaradıcı yanaşsa, sözsüz ki, şagirdlər də sinifdə müəllimin bu yanaşmasına yaradıcı cavab verəcəklər. Riyaziyyatla bağlı qəzetlərin və jurnalların çıxarılmasında valideynlər də şagirdlərə kömək etməlidirlər və bu da onların pisixologiyasına xoş təsir edir, nəticədə şagirdlərdə elmə qarşı maraq, həvəs yaranır.

Riyaziyyat müəllimi şagirdlərin riyaziyyatdan məntiqi biliklərini artırmaqla eyni zamanda onların keçmiş biliklərini də yada salıb inkişaf etdirməlidir. Təlim prosesində ən mühüm vəzifələrimdən biri də şagirdlərin dərsdə diqqətli olmasına fikir verilməlidir. Onlara yeni anlayışlar, fikirlər və quruluşlar haqqında yarımçıq, qismən və təhrif olunmuş biliklər vermək əvəzinə, şagirdlərə onların anlaq səviyyəsini müəyyənləşdirməyi, hissi və idrak təcrübələrin əsaslandırılması, cavabların tamlığına necə nail olması kimi məsələlər öyrədilməlidir. Apardığım təcrübələr əsasında daha çox şagirdlərin isbatları necə öyrənmək, peşə yönümünü düzgün təyin etmək və seçmək, çalışmaların tam həllinə nail olmaq və məntiqi təfəkkürlərini inkişaf etdirməkdir [6,9].

***Rəyçi: p.e.d. İ.Cəbrayılov***

## İstifadə edilmiş ədəbiyyat


1. Əlizadə Ə., Əlizadə H. Pedaqoji psixologiya. Bakı, 2010.
2. Vygotsky L. (1986). Thought and Language, Kozulin A., (Ed. and Trans.), Cambridge, M.
3. Tarasenkova A. and Akulenko İ. "The Problem of Forming and Developing Students' Logical Thinking in the Context of Subject Specialization in Secondary School." American Journal of Educational Research 2.12B, 2014.
4. Rüstəmov İ. Pedaqoji fakültədə riyaziyyatın tədrisi metodikası (dərs vəsaiti). ADPU-nun nəşriyyatı, 2004.
5. Rüstəmov İ. Riyaziyyatın tədrisi metodikası (dərs vəsaiti). Bakı: Elm, 1999, 159 səh.
6. Cəbrayılov İ. Şəxsiyyətyönümlü təhsil və vətəndaş cəmiyyəti. Bakı, 2011.
7. Riyaziyyatda məsələ həlli üzrə praktikum dərs vəsaiti. ADPU-nun nəşriyyatı, 1993.
8. Riyaziyyatın tədrisi metodikası (xüsusi metodika). I hissə (dərs vəsaiti). Bakı: "TİMEDİA" şirkətinin mətbəəsi, 2008.
9. Sadıxov Z., Cabbarzadə V., Buniyatov A. Riyazi məntiq. ADPU-nun nəşriyyatı, 2015.
10. Mənsimov S. Dərsdə şagirdlərin idraki fəallığının yüksəldilməsi. Kurikulum.


**М.Сулейманлы**

**Пути формирования личности учащихся в процессе обучения**

**Резюме**

В статье рассматриваются теоретические основы формирования навыков студентов в математической логике. Одним из ключевых факторов, формирующих преподавание математической логики была описана как личности студента. Использование новых методов обучения в математике, чтобы понять суть статьи состоит в том, по своей сути имеет особое значение для развития общей студентов.

**M.Suleymanli**

**The ways of formation student personality**

**Summary**

The article deals with the theoretical foundation of formation students' mathematical logic skills. The Mathematical logic is one of the main factor in the formation of personality that described in the article. There are many new methods in developing mathematical logic skills that is special importance in enhancing students' summarizing skills.

# TƏRBİYƏDƏ TÜKƏNMƏZ MƏNBƏLƏR

**Rəsmiyyə Allahverdiyeva,**
***Bülbül adına Orta İxtisas Musiqi Məktəbinin müəllimi***

*Məqalədə xalqın mənəvi psixoloji aləmi, məişəti, dünyagörüşü və s. əks etdirən milli-mənəvi dəyərlərin mənbələrindən istifadə olunması yollarından bəhs edilir.*

***Açar sözlər:*** *milli, mənəvi, etnik, xarakter, stereotip.*
***Ключевое слов:*** *национальный, духовный, этнический, характер, стереотип.*
***Key words:*** *national, cultural, ethnic, character, stereotype.*

Azərbaycan xalqının minilliklərin süzgəcindən keçib gəlmiş davamlı və dayanıqlı milli-mənəvi dəyərlər sistemi vardır. Bu dəyərlər xalqımızın etnik milli hislərini, xarakterini, düşüncə tərzini, xasiyyətini, insanlarla qarşılıqlı münasibətlərini özündə ehtiva edir. Xalqın elmə, maarifə, mədəniyyətə aid fikirləri, ilk növbədə, bu dəyərlərdə cəmlənir.

Cəmiyyət həyatında baş verən dəyişikliklər, sosial yeniləşmə, demokratikləşmə, inkişaf etmiş dünya dövlətlərinə inteqrasiya, qloballaşma, milli özünüdərk, mənəvi dəyərlərin mənimsənilməsi və s. bu kimi proseslər bir tərəfdən insanın düşüncə və davranış tərzində yeniləşməni, ənənəvi stereotiplərin dəyişməsini zəruri edirsə, digər tərəfdən də baş verən dəyişikliklərdən dəyərləri itirmədən yararlanmağı vacib şərt kimi qarşıya qoyur.

Adətən, cəmiyyət həyatında əsaslı dəyişiklik baş verdikdə insan amilinə diqqət artır. Çünki baş verən dəyişiklik insanlara da təsir göstərir, münasibətlər sisteminə, maddi və mənəvi dəyərlərə yeni münasibət formalaşdırır. Şəxsiyyətin necə qiymətləndirilməsi də yeni tələblərə əsasən qurulur. Bu baxımdan son dövrlərdə şəxsiyyət problemi, demək olar ki, bütün ictimai, humanitar elm sahələrinin tədqiqat obyekti olmuşdur.

Tədris zamanı dəyərlər müxtəlif formalarda özünü göstərir. Bunlar, ilk növbədə, milli-mənəvi dəyərlərin əsas mənbəyi olan şifahi xalq ədəbiyyatı nümunələrində - nağıllarda, atalar sözlərində, bayatılarda, laylalarda, alqış və qarğışlarda, yanıltmaclarda, tapmacalarda, hikmətli ifadələrdə, adət-ənənələrdə, klassiklərimizin yaradıcılığında, dini təsəvvürlərimizdə və s. öz əksini tapmışdır. Xalqımızın malik olduğu milli-mənəvi dəyərlər onun ləyaqət və qürur mənbəyidir. Bu əxlaqi sərvətlər xalqımızın elm, mədəniyyət, təlim-tərbiyə məktəbidir və orada gənc nəslin təlim-tərbiyəsinə, əxlaq və düşüncəsinə, onların bir şəxsiyyət kimi formalaşmasına aid istənilən qədər material var.

Xalqımıza məxsus çox dəyərli, ünlü, zaman-zaman tarixin süzgəcindən və təlatümlü dövründən keçmiş bəşəri ənənələr, adətlər çoxdur. Bunlar isə, gənc nəsildə yeni əxlaqi görüşlər aşılayır. İngilis şairi Corc Herbert demişkən: "Əxlaqdan məhrumsansa, nə qədər yüksəyə qalxsan da yenə heçsən".

Milli-mənəvi dəyərlərin elə bir nümunəsi tapılmaz ki, orada gənc nəslin təlim-tərbiyəsinə, əxlaqına, ağlına, zəkasına, onların mənəvi-psixoloji aləminə aid fikirlər söylənməsin. Hər bir xalq və ya etnos özünü düzgün dərk edib qiymətləndirmək və tərəqqiyə nail olmaq üçün yalnız özünün mənəvi keçmişinə dərindən bələd olmalıdır.

Azərbaycan şifahi xalq yaradıcılığı

nümunələrində insan mənəviyyatına, psixologiyasına aid irəli sürülən fikirlər klassiklərimizin yaradıcılığında, daha konkret desək, onların yaratdığı bədii obrazlarda əks olunmuşdur. Məhz buna görə Azərbaycan klassiklərinin yaradıcılığı bu gün də aktualdır. Bu da təsadüfi deyildir. Çünki həmin klassiklərin yaradıcılığındakı ideyalar gənc nəslin milli-etnik hislərinin formalaşmasında, əsl vətəndaş kimi yetişməsində böyük əhəmiyyət kəsb edir.

Şifahi xalq yaradıcılığı hər hansı bir xalqın keçmişindən bu gününə ötürülən elm, mədəniyyət xəzinəsidir. Dünyanın istənilən bir xalqı öz keçmiş əcdadlarının yaratdığı nümunələrə istinad edərək öz gələcək mədəniyyətini qurur və inkişaf etdirir. Xalq yaradıcılığının hər bir nümunəsində xalqın mənəvi psixoloji aləmi, məişəti, dünyagörüşü və s. əks etdirilir. Geniş xalq kütləsi tərəfindən yaradılan və yaşadılan şifahi söz sənəti olan folklorda xalqımızın mənəviyyatı, təfəkkürü və psixologiyası toplanmışdır. Şifahi xalq yaradıcılığı canlı danışıq dilinin bütün incəliklərini özündə əks etdirən qiymətli bir xəzinədir. Bu milli-mənəvi, əxlaqi sərvətlər gənc nəslin şəxsiyyətinin formalaşmasında tükənməz mənbədir.

Tərbiyə prosesində milli-mənəvi dəyərlərimizi özündə əks etdirən ədəb və mərifət xəzinəsindən daha çox bəhrələnilməli və onlar tədqiq olunaraq gənc nəslə çatdırılmalıdır. Bunlar bir tərəfdən milli-mənəvi dəyərlərə olan hörmət və münasibətimizi ifadə edər, digər tərəfdən gənc nəslin öz soy-kökünə bağlanmasında, onlarda milli ləyaqət, qürur hislərinin formalaşmasında əhəmiyyətli rol oynayar.

Azərbaycan xalqına məxsus dəyərlərin, adət-ənənələrin, etnik xüsusiyyətlərin geniş bir formada əks olunduğu nümunələr bu gün məktəblərdə mütləq şəkildə tədris olunmalıdır. Hər hansı bir xalqın mifologiyasına, folkloruna, sənət yaradıcılığına dair dəqiq tarixi məlumatlar verən yazılı qaynaqların mövcudluğu həmin xalqın etnik tarixinin, təfəkkür tərzinin, adət və ənənələrinin inkişaf mərhələlərinin öyrənilməsini olduqca asanlaşdırır. Azərbaycan xalqının etnik xüsusiyyətlərinin təşəkkülünü tədqiq etmək, əcdadlarımıza məxsus etnik xarakter əlamətlər, stereotiplər, hislər, davranış tərzi, adət-ənənələr və s. canlı şəkildə təhlil etmək öz əksini tapmış folklor nümunələri əsasında daha da rahatlaşır. Həmin ideyaların məktəbdə öyrənilməsi və ümumiləşdirilməsinin mühüm elmi əhəmiyyəti var.

Ədəbiyyatımız bədii və elmi təfəkkürün vəhdəti nəticəsində yaranaraq, dövrün sosial, fəlsəfi - psixoloji xüsusiyyətlərini özündə əks etdirir. Bu baxımdan klassik irsimiz təhsilin nəzəri və elmi problemlərinin öyrənilməsində əvəzolunmaz mənbədir. Yazıçı və şairlərin, filosofların əsərləri həmin dövrün güzgüsüdür. Xalqın iztirablarını, adət-ənənələrini, əxlaqını, keçirdiyi hisləri, arzu və xəyallarını, xarakterini, milli ləyaqət və qürurunu öyrənmək üçün bu mənbələrə müraciət etmək lazımdır (2. s.123).

Əsrlər boyu xalqımızın təfəkkür süzgəcindən keçərək zəmanəmizə qədər gəlib çıxan adət-ənənələrimiz, ata-anaya, böyük və kiçiklərə hörmət, qadın şəxsiyyətinə hədsiz məhəbbət məhz ailədə öz dayaq nöqtəsini tapmışdır. Bu baxımdan Azərbaycan xalq yaradıcılığında öz əksini tapan adətlərin, illər boyu möhkəmlənmiş ailə stereotiplərinin, ümumilikdə milli-mənəvi dəyərlərin, orada öz əksini tapan təlim, tərbiyə ideyalarının qorunub saxlanılmasında, təbliğ və təqdimatında, aydın dərk olunmasında ailə və məktəb bu gün də əvəzsiz rol oynamaqdadır.

Ziyalılarımız bu zəngin incilər xəzinəsindən bəhrələnməklə yanaşı, onları tədqiq və təbliğ edərək gənc nəslin istifadəsinə verməlidirlər. Hər hansı bir

mövzunu tədris edərkən, birinci növbədə, onu milli mədəniyyətimizlə, adət-ənənələrimizlə, etnik-milli hislərlə, mənəvi dəyərlərlə əlaqələndirməlidirlər.

***Rəyçi: prof. N.Kazımov***

## İstifadə edilmiş ədəbiyyat

1. Azərbaycan psixoloqlarının tədqiqatlarında şəxsiyyətin sosial mədəni inkişaf problemi. Azərbaycan Dillər Universitetinin Elmi xəbərləri, 2011, №1.
2. Bayramov Ə. Psixoloji etüdlər. Bakı: Üfüq, 1989.
3. Bayramov Ə. Şəxsiyyətin inkişafının etnopsixoloji məsələləri. Bakı: Üfüq, 1985.
4. Həsənov A. Milli-mənəvi dəyərlərimiz. Bakı, 2010.
5. Ağayev Ə. Seçilmiş əsərləri. 2 cild. Bakı, 2011.

**Р.Аллахвердиева**

**Неисчерпаемые источники в воспитании**

**Резюме**

В статье говорится о том, что основу содержания национально-духовных ценностей составляют этнические национальные чувства, характер, традиции, народные стереотипы, образ мышления и т.д.

**R.Allahverdiyeva**

**Inexhaustible sources of discipline**

**Summary**

In the article describes the maintenance basis is made national-cultural values by ethnic national feelings, character, traditions, national stereotypes, mentality and etc.

* * *